*Bu kitab “**Məsihi.** Vərqa və Gülşa” (Bakı, Azərnəşr, 1977) nəşri əsasında təkrar nəşrə hazırlanmışdır*

Tərtib edəni, ön sözün
və şərhlərin müəllifi: **Əlyar Səfərli**

Redaktor: **Xəlil Yusifli**

**894.3611 - dc 21**
**AZE**
**Məsihi. Vərqa və Gülşa.** Bakı, “Şərq-Qərb”, 2005, 336 səh.

Eşq və gözəllik nəğməkarı Məsihinin bədii irsi yüz min beytdən artıqdır. Onun yaradıcılığı Azərbaycan yazılı və şifahi ədəbiyyatı ənənələri əsasında kamala çatmışdır. Nəvaini özünün ustadı sayan şair öz ulu sələfi Füzuli kimi qəzələ üstünlük verərək, şairanə duyğu və düşüncələrini bu kiçik formada əks etdirməyi məqsədəuyğun saymışdır.

Bununla yanaşı Məsihi ədəbiyyatımız tarixində daha çox “Vərqa və Gülşa” poemasının müəllifi kimi tanınır. Bu əsər ideya-bədii gözəlliklərinə görə XVII əsr milli ədəbiyyatımız tarixində yeni ədəbi hadisə idi.

“Vərqa və Gülşa” aşiqanə qəhrəmanlıq mövzusunda yazılmışdır. İki aşiqin saf, nəcib eşqinin tərənnümü poemanın başlıca ideya istiqamətini təşkil edir. Əsərdə əsas xətdən başqa əlavə xətlər, qol-budaqlı hadisələr poemanı rəngarəng epizodlarla zənginləşdirir, onun bədii-poetik gücünü artırır.

**ISBN 9952-418-35-0**

Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**“Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında”**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir

# ÖN SÖZ

XVII əsr Azərbaycan poeziyası göylərində iki ulduz parlayır: Məsihi və Saib. Minillik ədəbi-bədii ənənələri yaşadaraq doğma ana dili və fars dillərində şeir inciləri yazır, incə zövq və gözəl fikir nümunələri olan əsərlərində orta əsr insanının əxlaqi-mənəvi gözəlliklərini tərənnüm edir, onu eşq və səadətlə dolu işıqlı bir sabaha səsləyir, xalqımızın ağıl, kamal və məhəbbət dastanının ölməz səhifələrini yaradır, qəlbləri, şüurları əql-idrak günəşi ilə işıqlandırırlar. Hər iki mütəfəkkir şairin əsərləri orta əsrlərin lal sükutunu pozaraq insana sevinc, fərəh gətirir, nəcib duyğular aşılayır, yeni ülvi münasibət və əlaqələrin ifadəsinə çevrilir.

Məsihinin bədii irsi yüz min beytdən artıqdır. Lakin onun şeirlər divanı, "Zənbur və əsəl", "Danə və dam" məsnəviləri bizə gəlib çatmamışdır. Şair ədəbiyyat tariximizdə də əsasən "Vərqa və Gülşa" poeması ilə tanınır. Əsərin bir əlyazmasına təsadüf edən ingilis alimi Ç.Rio XIX əsrdə bu barədə ilk məlumat verir. XX əsrdə görkəmli türk ədəbiyyatşünası İsmayıl Hikmət Ertaylan "Azərbaycan ədəbiyyatı tarixi" kitabında ölməz məhəbbət dastanından danışaraq onun ideya-bədii məziyyətlərini yüksək qiymətləndirir. Azərbaycan alimlərindən H.Araslı, M.H.Təhmasib, M.Quluzadə, Ə.Dəmirçizadə, M.Seyidov, R.Azadə və başqaları "Vərqa və Gülşa"nın dil-üslub keyfiyyətlərini, ideya-mövzu mənbələri və şifahi ədəbiyyatla əlaqələrini aydınlaşdırmağa çalışsalar da, şair haqqında ayrıca bir tədqiqat əsəri yaranmamışdır.

Məsihinin ata-babası qədimdən həkimlikdə ad qazanmışdır. Təsadüfi deyil ki, o da gənc yaşlarından bu şərəfli sənətə meyl göstərmiş və hətta öz təxəllüsünü də bununla əlaqədar seçmişdir. Tibbə dair yazdığı "Zəbitətül əlac" adlı əsəri də bu elmə məhəbbətin bəhrəsidir.

Zəmanəsinin istedadlı şairi və həkimi kimi tanınan Məsihi Səfəvi hökmdarlarından Şah Abbas və Şah Səfi saraylarına yaxın olub onlardan böyük hörmət görmüş və hətta müəyyən hərbi səfərləri və məclislərində də yaxından iştirak etmişdir. Lakin məğrur şair şahlardan azacıq iltifatsızlıq gördüyündən "Əgər fələk bir səhər tezdən başını məndən uca tutsa, axşam günəş kimi onun ölkəsini tərk edərəm", – deyərək onların hökmran olduğu ölkədə yaşamağı belə özünə sığışdırmır. XVII əsrdə yaşamış bir sıra şair, alim, rəssam kimi Məsihi də ana vətənini tərk edib Hindistana gedir. Həmin dövrlərdə Hindistanda hakimiyyət sürən türk-moğol şahlarının ağıllı, mütərəqqi siyasətindən, bütün

dinlərə eyni gözlə baxmasından Məsihi də razı qalmışdır. Yaradıcı adamın səyahət etməsinə, dünyanın müxtəlif ölkələrini gəzib-dolaşmasına xüsusi əhəmiyyət verən şair 20 ilə yaxın Hindistanda yaşamış, qədim "möcüzə və sehr"lər yurdunun abidələrlə zəngin yerlərini gəzmiş, qədim hind ədəbiyyatına, fəlsəfə və incəsənətinə dərin maraq bəsləmişdir. Məsihi Hindistanda olarkən onun yaxın dostu, görkəmli şair Saib Təbrizinin də təxminən eyni vaxtda orada yaşaması göstərilir. Hər iki şairin səyahət zamanı görüşüb-görüşməmələri barədə mənbələrdə müəyyən bir məlumata rast gəlməsək də, onların dostluğuna dair bəzi qeyd və işarələr vardır. Hind alimi Hüseynəli xan Aşiq "Neştəri-eşq" əsərində Saibi Məsihinin şagirdi kimi təqdim edir. Onun fikrincə, Saib öz ustadının vəfatından sonra şeirlərini bir yerə toplamış və onların içərisindən 700 beyt seçib divan tərtib etmişdir. Məsihinin müasiri Mirzə Nəsrabad Saibin evində Məsihinin on divanı olmasını göstərir. "Şəmi-əncümən" təzkirəçisi isə Saibin Məsihi şeirlərinə mükəmməl nəzirə və cavablar yazdığını söyləyir. Heç şübhəsiz ki, bu təzkirəçi alimlərin mülahizə və qeydləri tarixi bir həqiqəti əks etdirmişdir. Doğrudan da, Saib Məsihi yaradıcılığı ilə qəlbən bağlı bir sənətkar kimi onun söz sənətinə xüsusi bir məhəbbət bəsləmiş, məşhur Cüng də öz ustadının şeirləri ilə bəzəmişdir.

Məsihinin əldə olan yeganə əsəri ənənəvi bir mövzuda yazılmışdır. "Vərqa və Gülşa" əfsanəsi Məsihiyə qədər uzun bir tarixi yol keçərək Yaxın Şərq ədəbiyyatında yayılmışdır. Bu barədə xüsusi bir məqalə yazan professor Ə.Atəşin fikrincə, əfsanə ərəb ədəbiyyatından gəlir. Məlumdur ki, VII əsrdən başlayaraq ərəblərdə ayrı-ayrı şairlərin adı ilə bağlı, yaxud da şərq xalqlarının şifahi ədəbiyyatından gələn aşiqanə rəvayətlər vüsət tapır. Ərəblər islam dinini yaymaq məqsədilə əsarət altına aldıqları xalqların maddi-mənəvi sərvətlərini amansızcasına dağıdır, qədim kitabələri, yazılı sənədləri məhv edir, müəyyən nümunələrini ərəbləşdirirdilər. Məhz belə hadisələrin nəticəsində də qədim türk əlifbası, çoxlu yazılı və şifahi ədəbiyyat nümunələri itib-batmışdır. Onların izlərinə əsasən ərəb, fars mənbələrində rast gəlinir ki, bunlardan da istifadə edərkən tarixilik prinsipini ciddi gözləmək lazımdır.

Ərəb ədəbiyyatında Vərqa və Gülşa adları altında müəyyən bir süjet məlum deyildir. Amma elə aşiqanə rəvayətlər vardır ki, onlar müəyyən motivləri, təfsilati xüsusiyyətləri etibarilə "Vərqa və Gülşa" ilə səsləşir. "Mürəqqiş və Əsma", "Urva və Əfra", Əntər haqqındakı xalq dastanı buna misal ola bilər.

Ə.Atəşə görə, "Vərqa və Gülşa" çox ehtimal ki, "Urva və Əfra" süjeti ilə bağlı olaraq meydana gəlmişdir. Buradakı adlar həmin mövzuda ilk əsər yazan şair tərəfindən dəyişdirilərək "Vərqa və Gülşa" adı altında verilmiş və əfsanə

bu adla da yayılmışdır. Əlbəttə, bu ehtimalların həqiqətə nə dərəcədə yaxın olduğunu bir tərəfə qoyub, demək lazımdır ki, türk xalqlarının şifahi ədəbiyyatında da "Vərqa və Gülşa" ilə səsləşən istənilən qədər nağıl və dastanlar vardır. Həm də onların qədim dastanla yaxınlığı daha parlaq şəkildədir. Onun qaynaqları haqqında müəyyən bir fikrə gəlmək üçün daha çox material verir.

"Vərqa və Gülşa" ehtimal ki, adlarını çəkdiyimiz ərəb nağıllarından daha qədimdir. Əfsanənin ümumi ruhu, müsəlmanlığa qədərki həyat və məişətlə, qədim Şərq mifologiya və əsatiri ilə olan müəyyən səsləşmələr bunu deməyə haqq verir. Burada elə adlar, ifadələr vardır ki, onların bəzilərinə dövrümüzdən beş min il əvvəl yaşamış qədim Akkard-Şumer dastanlarında, atəşpərəstlik dininin abidəsi olan "Avesta"da rast gəlirik.

"Vərqa və Gülşa"da bahadırlıq səhnələri təsvirinin səciyyəvi cəhətləri, hərb mövzusunun qoyuluşu, ayrı-ayrı motiv və təfsilatlar bir sıra ad və ifadələrin etimoloji qaynaqları qədim türk şifahi ədəbiyyat ənənələri, təsəvvür və etiqadları, habelə maddi və mədəniyyət abidələri ilə səsləşir. Bütün bunlara əsasən demək olar ki, "Vərqa və Gülşa" əfsanəsi türk xalqlarının şifahi xalq yaradıcılığı ilə bağlı olmuş və yaxud bu ənənələr üzərində yüksəlmişdir. Əfsanə buradan da baş alaraq Yaxın Şərqdə yayılmışdır. Bu da təsadüfi deyildir ki, onun görkəmli epik abidəsi məhz türk xalqlarının ədəbiyyatında yaranmış, çoxlu nağıl və dastanlarda əbədiləşdirilmişdir.

"Vərqa və Gülşa"dan danışarkən istər-istəməz "Leyli və Məcnun" yada düşür. Bu da səbəbsiz deyildir. Hər iki aşiqanə dastan tarixin qaranlıq dövrlərindən doğaraq əsrləri, qərinələri arxada qoymuş, bütün Yaxın Şərq aləmində vüsət tapmışdır. Onların mənşəyi məsələsi hələlik mübahisəli şəkildə qalsa da, Şərq poeziyasında işlənməsi, bir sıra xalqların şifahi ədəbiyyatına keçməsi haqqında aydın bir təsəvvür vardır. "Vərqa və Gülşa" əfsanəsi "Leyli və Məcnun"a nisbətən az tanınır. Heç şübhəsiz ki, bunun müəyyən ədəbi-tarixi və ictimai səbəbləri vardır. Habelə Nizaminin bu mövzuda ilk dəfə olaraq yaratdığı ölməz əsəri də əfsanənin yayılmasında böyük rol oynamışdır. Bitkin süjet yaradan Nizami Məcnunu böyük idealı, yüksək insani keyfiyyətləri özündə əks etdirən ümumbəşəri bir sima kimi canlandırmış, qədim bir eşq əfsanəsini zəmanəsinin ədəbi-ictimai həyatı, bədii təfəkkür tərzi ilə yaxından bağlaya bilmişdir. Nizaminin monumental poemasının təsir gücü ilə "Leyli və Məcnun"a maraq getdikcə artmış, bu mövzuda çoxlu poemalar meydana gəlmişdir. Nizamidən sonra Əmir Xosrov Dəhləvi, Cami, Nəvai, Füzuli və başqa şairlərin eyni mövzuda yaratdıqları əsərlər klassik şerin gözəl, mükəmməl nümunələridir.

Hər iki dastanda müəyyən səsləşmələr varsa da, fərqli xüsusiyyətlər də qabarıq şəkildədir. "Leyli və Məcnun"dakı mənəvi-psixoloji konflikt "Vərqa və Gülşa"da mənəvi-cismani mübarizəyə çevrilmişdir. Əgər birincidə orta əsr insanının faciəsini görür, göz yaşları içərisində acı fəryadını eşidiriksə, ikincidə onun mübarizə əzminin, yenilməz bahadırlığı və iradəsinin də şahidi oluruq. Məsihinin yaratdığı bədii aləmdə ideal aşiq hər görüşdən örnək sayılır, şair onun qələbəsini mətanəti və şücaətində, həm də insanpərvərliyində arayır. Məcnunda isə mənəvi səbatlıq və ülviyyət vardır. Vərqa Məcnunun düşündüklərini həyata keçirir, Fərhad kimi eşq yolunda külüng çalır, həm ağlını, həm də biləyini işlədir. Məcnun sevərək zəmanəsini ittiham edir, dövrandan qaçır, "hissi, əqli və xəyali" idrakı ilə ucalır, dünyanın möhnət sərkərdəsinə çevrilərək burulğanlı aləmdə mənəvi və cismani ölümdən yaxa qurtarmaq üçün cəmiyyətdən uzaqlaşır, xəyalat mühitində yaşayır və nəhayət, arzularına zidd gerçəkliyə yox, ruhi-mənəvi ülviyyətə sadiq qalır. Bədbəxt "xoşbəxtlik"dənsə, xoşbəxt bədbəxtlik yolunu seçir, böyük ürəyi, eşqi və kamalı ilə qaranlıqlara işıq saçır.

"Vərqa və Gülşa"nın Yaxın Şərq poeziyasında işlənməsinin özünəyaraşan keçmişi vardır. Əldə olan sənədlər göstərir ki, "Vərqa və Gülşa"nın yazılı ədəbiyyatdakı həyatı "Leyli və Məcnun"a baxmış daha qədimdir. 1030-cu ildə "Vərqa və Gülşa" mövzusunda yazılmış bir əsərin bizə qədər gəlib çatması da bunu aydın göstərir. Poema Sultan Mahmud Səbüktəkin adına yazılıb. İbn-Sina dövrünün ədəbi nümunəsi kimi qiymətli olan məsnəviyə istedadlı Azərbaycan rəssamı Əbdül Mömün Məhəmməd Xoylu 71 miniatür çəkmişdir. Bu şəkillər içərisində Vərqanın Pələnglərlə vuruşu, toy mərasimi, Vərqanın əsir düşməsi, Gülşanın anası ilə mübahisəsi və s. tablolar incə-təbii cizgiləri ilə seçilir. Əbdül Mömünün miniatürləri Azərbaycan rəssamlıq sənətinin indiyə qədər örtülü qalan abidəsi kimi dəyərlidir. Bu rəsmlər eyni zamanda adı çəkilən dövrlərdə sənətimizin nə durumda və hansı önəmdə olduğunu göstərir.

Yazanı anlaşılmaz qalan bu öncə məsnəvidən sonra "Vərqa və Gülşa" adı altında bir sıra əsərlər yaranmışdır. Bunlardan Əyyuqi, Yusif Məddah, Mostarıl Ziyai, Molla Əhmədcan son olaraq Məsihinin əsəri buna gözəl nümunədir. Əsrimizin əvvəllərində Daşkənddə nəsr və nəzm ilə çap olunmuş iki tərcümə əsəri, özbək dramaturqu Xurşid Şarafuddinovun bu mövzuda yazdığı pyes əfsanənin Orta Asiyada da yayılmasına sübutdur.

"Vərqa və Gülşa" əfsanəsi Yaxın Şərqin folkloruna da keçmişdir. Əfsanənin Azərbaycan, türk, özbək, türkmən, qazax, tacik, fars, əfqan və s. xalq variantları ona marağın nə dərəcədə artdığını aydınlaşdırır.

Bütün bu deyilənlərdən aydın olur ki, Məsihiyə qədər onun seçdiyi mövzuda müəyyən ədəbi təcrübə var idi, bu sahədə artıq bir sıra şairlər qələmlərini sınamışdılar. Məsihinin əsəri ilə sələflərinin əsərlərini qarşılaşdırıb ideya-bədii keyfiyyətlərinə görə ayırd edərkən onun işlək mövzuya nə kimi bir yaradıcılıq ölçüsü ilə yanaşmasını anlayırıq. Uzunçuluğa varmadan demək gərəkdir ki, Məsihi ortaq mövzuda yazsa da, öz sələflərinin yazdıqları əsərlərdən ideya-fəlsəfi məzmununa görə seçilən müstəqil bir poema meydana gətirmişdir. Bunu "Vərqa və Gülşa" mövzusunda yazılmış ən önəmli əsərlərdən biri olan XIV əsr Azərbaycan şairi Yusif Məddahın poeması ilə Məsihi əsərinin tutuşdurulmasında görə bilərik.

İstedadlı bir şair olan Yusif Məddah Nəsimidən əvvəl yaşamış və "Vərqa və Gülşa"nı 1368-ci ildə yazıb bitirmişdir. Məclislər şəklində qələmə aldığı əsərdə onun maddeyi-tarixini belə göstərmişdir:

Yeddi yüz yetmiş yiləndədür bu dəm
Kim bunun tarixinə vurdum qədəm.

Yusif Məddahın rəməl bəhrində yazdığı poema min yeddi yüz beytdən ibarətdir, həcmcə də Məsihinin əsərindən azdır. Şairin özü də əsərin bir yerində belə qeyd edir ki:

Bin yeddi yüz beyt olan bu dastan
İçi dolu cəzahirü ləli-kan.

Məsihi, hər şeydən əvvəl, yaratdığı surət aləmi ilə öz sələfindən ayrılır. Bir-birinə zidd, kamil, dolğun insan xarakterləri yaratmaqla, psixoloji vəziyyət və təzahürləri təsvir etməklə bütün sələflərini geridə qoyan Məsihi, ənənəvi aşiq surətlərini ilk dəfə parlaq şəkildə işləmişdir. Məsihinin əsərində klassik poemalara xas olan monumentallıq, dramatizm, daxili dinamika, qüvvətli xarakterlər mübarizəsi, fəlsəfi-epik ümumiləşdirmələr vardır, canlı surət və xarakterlərin əlaqə və mübarizəsində ictimai həyat hadisələri, xalq mənəviyyatının gözəl, ülvi cəhətləri göstərilir, zəmanəsinin ən yüksək ideyalarının əksi vardır. Yusif Məddahda hadisələr çox qısa, yığcam verildiyindən qəhrəmanların davranışlarını tamamlayan daxili aləmləri zəif işıqlandırılır. Məsihidə isə personajların mənəvi-psixoloji aləminin ifadəsi incə, səciyyəvi cəhətləri ilə yeni məna qazanır.

Ənənəvi süjeti işlərkən müstəqil hərəkət edən Məsihi əhvalata yaradıcı münasibət bəsləmişdir. Əgər Yusif Məddahda sadəcə olaraq iki bədbəxt aşi-

qin məhəbbət sərgüzəşti danışılırsa, Məsihidə məhəbbətin arxasında bir sıra ictimai-siyasi və əxlaqi məsələlər qoyulub həll edilmişdir. Ənənəvi süjeti mənsub olduğu xalqın ədəbi-mədəni nailiyyətləri, şifahi və yazılı ədəbiyyat ənənələri ilə təkmilləşdirən Məsihi, bir sıra yeni epizodlar işləyərək süjetdə əlavə və dəyişikliklər aparmış, həyati lövhələri qüvvətləndirmişdir; məhəbbəti tamamilə yeni ictimai əsasda götürməklə orijinal bir əsər yaratmışdır. Məhz buna görə də Məsihinin poeması nəinki Azərbaycan ədəbiyyatında, eləcə də "Vərqa və Gülşa" əfsanəsinin Şərq poeziyasında işlənmə tarixində ayrıca yer tutur. Məsihi ilk dəfə olaraq qədim aşiqanə süjeti dolğun, parlaq şəkildə işləmiş, onun ölməz poetik abidəsini yaratmışdır.

Məsihinin "Vərqa və Gülşa"sı lirik-epik poema olub baş qəhrəmanların adını daşıyır. Şair bu əsəri 1038 (1628-1629)-ci ildə yazıb bitirmişdir. Klassik aşiqanə dastanlar kimi dibaçə, tövhid, nət, meracnamə, Şah Abbasın mədhi, qələmə xitab, saqinamə hissələri ilə başlayan poema Şah Səfiyə həsr edilmiş qəsidələr, eləcə də şairin oğluna vəsiyyəti ilə tamamlanır. Əsərdə rəsmi başlıqlar artıq görünmür, burada təsvir olunan əsas əhvalatla mənəvi tellərlə əlaqələndirilir. Ənənəvi başlanğıclarda azad, ciddi fikirlərini deməyə imkan tapan şair əsərinin ideya-mövzu mənbələrini aydınlaşdırır, zəmanəsini düşündürən ictimai-fəlsəfi və əxlaqi məsələlərə öz münasibətini bildirir, söz və sənət haqqında öz bədii-estetik duyğularını qələmə alır.

"Vərqa və Gülşa" qarşılıqlı eşqin əzəmət və ülviyyəti haqqında bir dastandır. Məsihiyə görə eşq insan ruhunun ifadəsidir, insan mənəviyyatının, cəmiyyətin mənəvi varlığının kəşf vasitəsidir. Məhəbbət olmayan yerdə həqiqət, ağıl, kamal da yoxdur, cəmiyyətdə mənəvi azadlıqdan, vicdan, şəxsiyyət, etiqad sərbəstliyindən, ailə səadətindən danışmaq da olmaz. Məsihi romantik eşqin incəliyini, gözəllik və rayihəsini, yenilməz təsir qüvvəsini, sevən qəlbin sevinc və iztirablarını romantik boyalarla tərənnüm edərək zəmanəsinin mövcud adət-ənənələrinə, dəbdəbəli həyat tərzinə, ictimai bəlalarına və zehniyyət tərzinə qarşı öz etirazını bildirir. İdeal bir eşqi və bədii aləmi zəmanəyə qarşı qoyur, insan səadəti haqqında düşüncələrə dalır, əql-idrak şüası ilə həyata işıq şüası salır. Zəmanənin bəlaları ilə qarşılaşan, lakin onların üzərində mənəvi qələbə çalan qalib bir eşqin qüdrətini vəsf edir. Bu ideal məhəbbət ruhani əsarəti də, cismani əsarəti də qəbul etmir. Çünki şairə görə, mübarizəsiz sevgi heç bir gözəlliyə malik deyil. Əsl aşiq həyatın hər cür haqsızlıqları və şər qüvvələri üzərində qalib gələn, onun sınaqlarına tab gətirən, işıqlığa, xoşbəxtliyə və səadətə doğru inamla irəliləyən aşiqdir.

Əsərdə Vərqa və Gülşanın sevgisi əsl fədakarlıq nümunəsidir. Məhəbbət aşiqlərdə bir sıra insani və bəşəri sifətləri üzə çıxarır. Şair belə bir eşqi ülvi məqamlara qaldırır, pərəstişə layiq bir qüvvə kimi sevdirir. Poemanın qəhrəmanlarını da böyük ürək və mənəviyyat sahibləri kimi verir. Vərqa da, Gülşa da insanlıqda, vəfada, sədaqətdə, dostluq və etibarda məhəbbət dünyasının nadir insanlarıdır.

Poemada, qəhrəmanların bu keyfiyyətləri quru, cansıxıcı təsvirlərlə verilmir. Şair onları həyati əlaqə və münasibətlərdə sınaqdan keçirir, ciddi maneələrlə qarşılaşdıraraq, ölüm-dirim meydanlarına gətirib çıxarır. Əsərdə Vərqa və Gülşa həyatı boyu maneələrlə qarşılaşır, gah ailə-məişət, gah da ictimai-siyasi hadisələrlə bağlı müsibətlərə məruz qalırlar. Əsərdə bir-birini əvəz edən bu konfliktlərin həllində də qəhrəmanların mənəvi siması aydınlaşır, əlaqə və münasibətlərinin əsl mahiyyəti üzə çıxır.

Məsihi poemasının əsas qəhrəmanı Vərqadır. Şair onu mənəvi-cismani qüvvəsilə əlçatmaz bir insan səviyyəsinə yüksəldərək, bütöv və kamil bir xarakter kimi verir. İctimai-əxlaqi ziddiyyətlər fonunda göstərilən Vərqa, sevgidə vəfalı, mübariz və fədakardır, öz yüksək amalı yolunda qorxunc, keçilməz sərhədləri yara-yara keçən əzmkar, iradəli, cəsur bir aşiq – qəhrəmandır.

Azərbaycan epik şeri tarixində*, aşiq-qəhrəman surəti kimi bir sıra keyfiyyətləri özündə birləşdirən Vərqa özünəməxsus cismani əzəməti və mənəvi gözəllikləri ilə klassik aşiq surətlərindən fərqlənir. Bu cəhət də hər şeydən əvvəl, poemada məhəbbətin yeni bir ictimai əsasda, yeni istiqamətdə götürülməsindən irəli gəlir; Məsihinin bədii yaradıcılıq üslubu, ədəbi dünyagörüşü bağlı olduğu poetik ənənələrlə izah oluna bilər.

Həyatda öz qismətini zorla, ölüm-dirim mübarizəsi ilə əldə etmək istəyən, öz fəallığı ilə seçilən Vərqanın bir insan kimi qüvvət mənbəyi məhəbbət və humanizmdir. Hər iki hiss onun varlığının pafosudur. Vərqanı bahadırlığa, nəcib əməllərə və yüksək ideallara sövq edib. Vərqa incə, təmiz hisslərlə sevə bildiyi kimi, onu şər qüvvələrdən qorumağı da bacarır, ömrü boyu məhəbbət, həyat və səadət düşmənləri ilə çarpışır, daima məşəqqətlər içərisində yaşayır. Eşq, humanizm mücahidi olan Vərqanın məğrur, əzəmətli mənliyində mənəvi cəhətdən əzilən, təhqir olunan bir insanın acı fəryadı, iniltiləri də duyulmaqdadır. Lakin bütün bunlara baxmayaraq o heç vaxt mübarizədən əl götürmür və bu hissi hər hansı təsir nəticəsində zəifləmir.

---

* Qədim türk xalqlarının, o cümlədən Azərbaycan xalqının ədəbiyyatında epik əsərlər ötük, ötkünc, sov, qissə, namə, dastan, məsnəvi və s. adlarla adlandırılmışdır.

Məsihi əsərdə bir-birini tamamlayan lövhələrlə Vərqanın bahadırlığını vəsf edir. Səciyyəvi cəhətlərdən biri də budur ki, Vərqanın qəhrəmanlığı şəxsi mənafe və səadətlə məhdudlaşıb qalmır, ümumbəşəri səviyyəyə yüksəlir. O, Əmr ilə vuruşda doğma yurdun, el-obanın şərəfini qoruyursa, Əntərlə müharibədə Yəmən ölkəsinin səadəti üçün döyüşlərə atılır, Pələnglərin 40 həramisi ilə davada isə Şam vilayətini çapovulçulardan təmizləyir.

Əsərdə Vərqanın siması həm döyüş səhnələrində, həm də aşiqanə-lirik lövhələrdə təzahür edir. Birinci vəziyyətdə yenilməz bir bahadır kimi ucalan Vərqa, ikinci vəziyyətdə kamil, ağıllı bir aşiq kimi özünü göstərir. Vərqanın məhəbbəti həyatda duyub-yaşayan, öz ömrünün əsl mənasını eşqdə görən həssas, təmiz və həzin bir könlün mənəvi varlığıdır. Bahadırlıq zamanı iti qılınc ilə səadətə yol açan aşiq eşq aləmində Məcnun kimi mənəvi böyüklüyünə, hisslərinin müqəddəsliyinə inam bəsləyir, hərəkət, fəaliyyətdənsə, mənəvi aləmi ilə yaşayır. Lakin Məcnun kimi saf, aydın mənəviyyatı ilə cəmiyyəti ittiham etmək Vərqada əsas dayaq nöqtəsi deyildir. O, "məcnunluğ"un acı şərbətini daddıqdan sonra hərəkətə gəlir, zəkası oynayır, həyatda səadətə çatmaq yollarında elə zümrələrlə qarşılaşır ki, onların üzərində zəfər çalmağın yeganə yolunu fəal cismani mübarizədə görür. Vərqanın böyüklüyü onda idi ki, o, hər zümrədən olan insanlarla necə lazımdırsa, həyat necə tələb edirdisə, o cür aydın, ayıq münasibət bəsləməyi bacarırdı. Şər qüvvələrlə mübarizədə qolunun gücünə arxalanırsa, xeyirxah insanlarla qarşılaşdıqda isə öz humanizminə, ruhi-mənəvi zənginliyinə söykənir.

Məsihinin Vərqası hər iki keyfiyyəti: eşqi və bahadırlığı özündə həmahəng əlaqələndirdiyindən Azərbaycan epik şeri tarixində yeni səciyyəli aşiq surəti kimi canlanır.

Poemada Gülşa surəti də məhəbbətlə yaradılmışdır. Şairin bu füsunkar, məlahətli, cazibədar məşuqə surəti zahiri və batini gözəllikləri özündə birləşdirir. Gülşanın mənəvi aləmi, bir xarakter kimi inkişafı iki mənbədən qüvvə alır: sevgi və namus. Onun faciəsi də, sevinci də, kədəri də bu iki hiss ilə bağlıdır.

Poemada zəmanəsinin müsibətlərini və təsirini Gülşanın həyatında, psixoloji əzablarında əks etdirən Məsihi onu bütöv bir xarakter kimi verir. Aşiqanə dastanın ilk səhifələrinə nəzər salaq. Burada Gülşa zəmanəsinin xoşbəxt bir məxluqu kimi verilir. O, "mədar"ı ilə sevib-sevilir, coşqun məhəbbət hissləri ilə yaşayır. Lakin onun "dəsti-ruzgar"dan uzaq olan məsud günləri uzun sürmür. Ata-ana yeganə övladlarının məhəbbətindən xəbər tutmuş, eşq sirri "faş" olmuşdur. Dövrünün əxlaqi tələblərinə uyğun olaraq Gülşa sevgilisi ilə görüşüb konuşmağa son qoyaraq, "hərəmsəra"da qərar tutmağa məcbur olur. Ar-

namusunu saxlamaq, ailənin, nəslin izzət-şərəfin qorumaq üçün Leyli kimi "fələyin hökmü"nə baş əyir. Bununla da Gülşanın əsl faciəsi başlanır. Gülşa:

Qoysəm qədəm ər fəzayi-seyrə,
Açsəm nəzər ər cəmali-qeyrə,
Qaşım tək ola qədim xəmidə,
Müjgan ola xar çeşmi-didə.

– deyə öz eşqindən zahirən də olsa əl çəkməyə, təmiz hisslərini boğmağa məcbur olur. Lakin Gülşa zəmanəsinin müstəsna bir xilqəti olaraq öz səadətini qarşılıqlı sevgidə gördüyündən sevir və sevdiyi üçün də hər cür məhrumiyyətlərə məruz qalır. Daxilən yanıb qovrulur – sevir, zahirən gülür – vüqarını saxlayır.

Nizami və Füzulinin Leylisi kimi, Gülşa da qapalıdır, düşdüyü vəziyyət nə qədər acınacaqlı olsa da, dərdini gizli saxlayır. Leyli kimi o da böyük bir dərdin ağırlığını tək çəkmək üçün tənhalığa meyl göstərir, guşənişinlik edir, zəmanəyə etiraz əlaməti olaraq bütün insanlardan, yaşayış və həyatdan üz çevirir. Məsihi Gülşanı vəfalı bir məhbubə kimi göstərmək, qəmlərinin böyüklüyünü təsirli və cazibəli bir şəkildə tərənnüm etmək üçün onu Füzulinin Leylisi kimi şam və pərvanə ilə qarşılaşdırır.

Gülşa zəmanəsinin bir sıra qızları kimi hüquqsuzdur. Onun bir faciəsi də elə bu idi ki, öz məhkumluğunu, mənəvi əsarətini duyurdu və buna etiraz edə bilmədiyi üçün də kədərlənirdi. Leyli kimi Gülşa da aşiqinə yazdığı "namə"də əldə "inani-təqdir"in olmaması və "rəy" ilə heç kəsin hesablaşmamasından şikayətlənir:

Çün əldə degil inani-təqdir,
Tutmaq nə rəva təriqi-təkfir?
Gülşadə gər ixtiyar oleydi,
Öz rəyi ilə mədar oleydi,
Haşa ki, qıleydi ol cüdalıq,
Səndin kəsə idi aşinalıq.

Poemada hadisələrin inkişafı Gülşanın təbiətində yeni keyfiyyətlər üzə çıxarır. Vərqa kimi o da get-gedə dəyişir, kamilləşir, böyük bir həyat məktəbi keçir. Romantik-aşiqanə dastanda onun bu təkamülü, saflaşması qanunauyğun və təbii səslənir. İlk günlər zəmanənin zülm və sitəmləri qarşısında aciz

qalan, ehtiram əlaməti olaraq valideynin qarşısında ağlayıb sızlayan Gülşa, getdikcə hadisələrə ayıq münasibət bəsləyir. Gülşa:

Mal oldu sənin bu gün vəbalın,
Beytül-malə qala bu malın.

– deyərək, onu zorla sevgilisindən ayırıb istəmədiyi adama ərə verən anasına açıq lənətlər yağdırır. Gülşanın bu sözləri qadını mənəvi cəhətdən əzib, məhrumiyyətlərə düçar edən, sevgidən varlanmaq məqsədi üçün faydalanan zəmanəyə qarşı çevrilmişdir.

Sözün əsl mənasında vəfa, sədaqət mücəssəməsi olan Gülşa, Nizaminin Leylisi kimi, yeri gəldikcə öz məhəbbətini müdafiə etməyi də bacarır. Öz fəallığı, bacarıq və hünərilə bəzən Vərqaya da yol göstərir, onunla qoşa at minib qılınc çalır. Gülşa məhz bu keyfiyyətilə, nağıl və dastanlarımızdakı igid, cəsur qız-anaların surətini xatırladır, Burlaxatunu, Banu Çiçəyi, Selcanxatunu yada salır.

Gər Rüstəm ilə qıləm nəbərdi.
Yerə qoya püşt, dəsti-mərdi.

– deyən Gülşa, hətta zifaf otağında qanuni ərini gürz, şeşpərlə qarşılayır. Heç şeydən çəkinmədən öz qəlbini Möhsün şaha açır, məhəbbətinə sadiq qaldığını bildirir:

Ömrüm olalı birinə bəndəm,
Dərdi ilə zarü dilnijəndəm.

Möhsün şahın bacı kimi baxdığı Gülşa sarayda da Vərqanın yolunu gözləyir və çox keçmədən onunla görüşür. Lakin səadət yenə də Gülşanın üzünə gülmür. İllərlə həsrətini çəkdiyi sevgilisi, Məcnun kimi öz məhbubəsindən əl götürür. Ömrü boyu vüsal həsrətilə alışıb-yanan Gülşa, kama çatacağına sonsuz inam bəsləyirdi. Lakin gözlənilmədən Vərqanın onu rədd etməsi Gülşaya ölümdən də ağır gəlir. Ona görə yox ki, muradına çatmamışdır. Ona görə ki, son ümidi qırılmış, inamı sarsılmış, etibar oxu daşa dəymiş, həyat idealı boşa çıxmışdır. Bu isə insanın mənəvi faciəsi, məhvi deməkdir. Buna görə də Gülşa Vərqadan sonra özünü dünyada kimsəsiz hesab edir, təkliyin əsl faciəsini duyur və bundan sonra yaşayışın mənasız olması qənaətinə gəlir. İnamı

qırılan Gülşa artıq bütün insanlardan ümidini kəsir, nakam bir eşqin son təranələrini oxuyur, "novmidlik" dərdi ilə saralıb solur:

Əsməkdə idi şəmameyi-nəvidim,
Var idi vüsalə çox ümidim...
Güm oldu çün ol qərəz aradən,
Məyus oldum o müddəadən,
Hala qəmudən ümid döndü,
Novmidlik ilə can söndü.

Yarı ilə xoşbəxt olmayan Vərqa ölür. Sədaqətli Gülşa da aşiqin qəbri üstünə gedərək vəfalı Şirin kimi özünü həlak edir. Bütün bu keyfiyyətləri ilə Məsihinin Gülşası ürəklərə təsir edən gözəl, füsunkar məşuqə surəti olaraq Nizami, Xətai və Füzulinin qadın qəhrəmanları ilə yanaşı duracaq bir səviyyəyə qədər yüksəlir.

"Vərqa və Gülşa"da əsas qəhrəmanlardan başqa epizodik surətlər də vardır. Əsas qəhrəmanlar kimi bu surətlər də öz daxili aləmi, ilham və məhəbbətlə yaratdığı Möhsün şah surətindən poemanın mərkəzində duran insanpərvərlik ideyasının gözəl bədii həllini vermək üçün müvəffəqiyyətlə istifadə olunur.

Poemada Möhsün şahın təbiətindəki yaxşı sifətlər onun Vərqa və Gülşaya münasibətində üzə çıxır. O, zəmanəsinin həm ideal bir şahı, həm də nümunəvi bir simasıdır. Lakin Məsihi, Möhsün şahın ziddiyyətli cəhətlərini də nəzərdən qaçırmamışdır. Əsərdə Möhsün şahın zəmanə və mühitdən irəli gələn əsas nöqsanı – Gülşanın eşqindən xəbərdar olduğu halda ona əhəmiyyət verməməsi, məhəbbət aləmində öz şahlığına və sərvətinə arxalanmasıdır.

Məsihi, Möhsün şahı mənəvi təkamüldə göstərir. Əsərdə o, böyük bir eşqin təsiri ilə dəyişir, tərbiyə olunur. Əvvəllər, Vərqa ilə Gülşanın məhəbbətinə laqeyd qalan şah, sonralar onu təqdir edir, bu ülvi və pak eşqin qarşısında baş əyir, hətta aşiqləri vüsala çatdırmaq üçün mübarizəyə qoşulur.

Poemada, Möhsün şahın taleyi bir neçə cəhətdən İbn Səlamın taleyini xatırladır. "Leyli və Məcnun"da Məcnuna qarşı qoyulan İbn Səlam surəti Məcnunun kamil çıxmasına, Leylinin bədii xarakterinin saflığına xidmət edir. Digər tərəfdən İbn Səlam məhəbbətdə yarımçıqlığı rədd edən şairin mühüm bir ideyasını təmsil edir. Məcnunla İbn Səlamın xarakteri arasındakı nisbəti Vərqa ilə Möhsün şahın xarakterində görmək olmaz. Onların hər biri ictimai ruhun, mənəvi-ruhi aləmin ayrı-ayrı qütblərini təmsil edirlər. Məcnunla İbn-Səlamın təbiətində ayrılıq, Möhsün şahla Vərqanın xarakterində isə bir bənzərlik vardır.

Nizami və Füzuli Məcnuna qarşı İbn Səlamı qoymaqla, birincini həqiqi aşiq kimi nümayiş etdirmək istəmişlər. Məsihi isə Vərqanın müqabilində Möhsün şahı gətirməklə hər iki nəslin nümayəndəsini bir nöqtədə – ruhi-mənəvi gözəllik aləmində birləşdirir. Ayrı-ayrı məslək sahibi olan Möhsün şahla Vərqa nəticədə eyni bir ideala sadiq qalır.

Əsərin axırında məhəbbət hissləri bəşəri eşqə çevrilən Möhsün şahla Vərqa arasında maraqlı bir dialoq verilir. Bu dialoq bəzi əlamətləri ilə Nizaminin "Xosrov və Şirin"ində Fərhadla Xosrovun mükaliməsini xatırladır. Nizami, burada dahiyanə sadəlik mücəssəməsi olan fədakar bir aşiqlə eşqdə dəyanətsiz, xudpəsənd olan Xosrovu qarşılaşdırır. Daha doğrusu, hökmdarla əməkçi insanı üz-üzə gətirir. Bu sual-cavabda da şairin rəğbəti Fərhadadır. Xosrov Fərhad ilə müsahibədə mənəvi acizliyini duyaraq sərvətə əl atır, şirin dili ilə rəqibini aldatmaq istəyir. Nəhayət, bunların heç biri baş tutmadıqda xəyanətlə məqsədinə çatmaq istəyir.

Deməli, Nizamidə aşiqlərin müsahibəsi kimin Şirinə sahib olması üstündə gedir. Bu yolda Fərhad saf eşqinə, Xosrov isə hökmdarlığına arxalanır. Fərhad fədakarlığına, Xosrov isə xəyanətinə ümid bəsləyir. Göründüyü kimi, Nizamidə eşq ucundan şahla əməkçi insan arasında dərin bir ziddiyyət yaranır. Onların sual-cavabı da bunu ifadə edir.

Məsihidə isə Möhsün şahla Vərqanın məsahibəsi tamamilə başqa bir məqsəd izləyir. Kimin məşuqəyə sahib olması deyil, kimin öz sevgisindən əl çəkməsi, kimin başqasının səadətinə şərik çıxmaması üstündə gedir. Aşiqləri şəxsi səadət deyil, bəşəri eşq düşündürür. Möhsün şahla Vərqanın bir-birinə olan münasibəti onlardan birinə rəğbət, digərinə nifrət doğurmur. Xosrovun əksinə olaraq Möhsün şah "rəqib"inə nifrət bəsləmir. Əksinə ona son dərəcə rəğbəti vardır, aşiqi xoşbəxt etməyi də özünün insanlıq borcu sayır. Vərqa nə qədər mərd, alicənab, ayna kimi saf mənəviyyat sahibidirsə, bütün bu cəhətlərdə Möhsün şah ondan aşağı durmur. Möhsün şah bununla da məhdudlaşmayıb, Vərqanı öz yerinə vəliəhd qəbul edir, ona atalıq qayğısı göstərir, hətta dirilib yenidən dünyaya gəlməsi üçün öz ömründən ona verməyə hazır olduğunu bildirir.

Deməli, Nizamidə olduğu kimi Məsihidə də eşq şahların mənəvi-əxlaqi təkamülündə, saflaşmasında, ideala yüksəlməsində ecazkar bir qüvvə kimi göstərilir.

Məsihinin məhəbbətlə yaratdığı Möhsün şah surəti Azərbaycan ədəbiyyatında yeni keyfiyyətlərə malik orijinal hökmdar surətidir.

"Vərqa və Gülşa" poemasında məhəbbət, insanlıq aləmini təmsil edən qüvvələrlə yanaşı Məsihi bir sıra şər qüvvələrin də obrazını yaratmışdır. Poemada

Əmr, Əntər, Pələnglər, onların əlaltıları, təmsil etdiyi qüvvələr xeyirxah insanlara qarşı qoyulmuşdur.

Məsihinin poeması orijinal bir final ilə bitir. Bu dünyada xoş bir gün görməyən aşiqlər ölür və onların dəfn edildikləri yerdə ikinci bir Şam şəhəri salınır. Möhsün şahın, Şam əhlinin tanrıya yalvarması ilə aşiqlər yenidən dirilib vüsala çatır. Vərqa şah olur, Möhsün şah da onların yanında bir ata kimi yaşayır.

İlk baxışda nağılvarı, fantaziya şəklində verilən bu sonluq ilə Məsihi, əsərdə qoyduğu bütün məsələlərlə sanki ümumi, həm də şairanə bir yekun vurur. Məhəbbətin qüdrətini, humanizmin vüsətini, insanın mənəvi gözəlləklərinin ülviyyət və təntənəsini nümayiş etdirir. Dövrün mənəvi tələblərini nəzərə alan Məsihi belə bir sonluq seçməklə həm də xalq ədəbiyyatı ənənələrini gözləmiş, mövzunun ruhunu saxlayaraq romantik üslubuna sadiq qalmışdır. İstəmişdir ki, əsərini xoş bir sonluqla bitirsin. Əhvalatı qəhrəmanların anadan olma şadlığının təsviri ilə başlayıb, ölüm qəmi ilə bitən klassik Şərq poemalarından fərqli olaraq, xalq dastanlarında olduğu kimi xoş aqibətlə, nikbin bir sonluqla tamamlamağı münasib görmüşdür.

Poemanın ideya xətti də finalın məqsədəuyğun, dərin müşahidələr nəticəsində seçildiyini göstərir. Vərqa və Gülşa bədbəxt adamlar arasında xoşbəxt olmurlar. Cəmiyyətdəki ziddiyyətlər, düşkün ehtiras və meyllər aşiqlərin səadətə çatmasına mane olur. Ancaq onlar ölüb dirildikdən sonra yaşadıqları nümunəvi cəmiyyətdə nəcib, gözəl insanlar arasında murada çatırlar, yaşadıqları əvvəlki mühitdən fərqli olaraq burada aşiqlər özlərinə layiq qiyməti alır, cəmiyyətin bütün üzvləri, hətta mifik-ruhani qüvvələr onların saf məhəbbətinə səcdə edir.

Beləliklə, Məsihiyə görə təqdiri-məhəbbəti ölüm də poza bilməz. Çünki onun əsası düzlük, mənəvi saflıq və insanlıqdır. Aşiqlər yaxşılıqlar yolu ilə getdiklərindən yaxşlığa çatırlar. Bunun nəticəsində də onların eşqi elə bir zirvəyə yüksəlir ki, onun əsasında Şam şəhəri kimi yeni bir xoşbəxt cəmiyyət yaranır. Bu cəmiyyətdə hökmdar məhəbbətdir, onun təməli böyük bir eşqin gücündən qoyulmuşdur. Onu idarə edən də aşiq – hökmdardır.

Məsihinin bu ideyası, Nizaminin "İskəndərnamə"sindəki ideal ölkə ideyası ilə səsləşir. Lakin Nizamidə belə bir ölkə mövcuddur. İskəndər uzun axtarışlardan sonra bu ölkəyə gəlib çıxır. Məsihidə isə həmin ölkə məhəbbətin qüdrətilə yaranır, zəmanənin bütün ziddiyyətlərini həll edən yüksək bir eşqin tələbi ilə meydana gəlir. Qəhrəmanlar bu ölkəni axtarıb tapmır, əksinə onların nəcib əməlləri belə bir ölkənin əsasını qoyur. Məsihi ülviyyətin əlçatmaz zirvəsində dayanan belə bir eşqi-məhəbbətin hökmdarlıq etdiyi ölkəni öz idealı kimi qə-

ləmə alır. Nizami kimi onun da yüksək həyat və yaradıcılıq idealı hər hansı ədalətli hökmdar deyil, məhz belə bir xoşbəxt cəmiyyətdir. İnsan yalnız ideal bir cəmiyyətdə xoşbəxt ola bilər.

* * *

Məsihinin "Vərqa və Gülşa" poeması bədii xüsusiyyətlərinə görə də bitkin və kamil bir əsərdir. Əsərə bu baxımdan nəzər salarkən, şairin bədii üslubu ayrıca qeyd edilməlidir. Məsihinin yaradıcılıq üslubu Yaxın Şərq, xüsusən Azərbaycan klassik ədəbiyyatı və şifahi ədəbiyyat ənənələri ilə yaxından bağlıdır. Kompozisiya cəhətdən poema, Nizaminin "Yeddi gözəl", "İskəndərnamə" əsərlərini xatırladır. Nizami kimi, Məsihi də öz qəhrəmanlarının taleyini dövrün böyük ictimai-siyasi hadisələri ilə bağlayır. Qəhrəmanların ətrafında, müxtəlif səciyyəli hadisələr baş verir ki, onların da hər biri ayrıca süjet təsiri bağışlayır.

Məhəbbət problemindən başqa, Məsihinin əsərə daxil etdiyi digər motivlər ideal qəhrəmanların sadiq qaldığı aləmin əzəmət və ülviyyətini göstərməyə xidmət edir. Vərqanın məhəbbəti bir tərəfdən ailə-məişət məsələləri, digər tərəfdən isə ictimai hadisələrlə bağlı olduğundan, o, aşiq olmaqla bərabər, humanist ideyalarla yaşayan və onu müdafiə edən bir insan kimi də ucalır. Həm məhəbbət, həm də insanpərvərlik ideyaları Vərqa üçün doğmadır. Əsərdə hadisələrin cərəyanı nəticəsində birinci ideya ikincini doğurur, müəyyən inkişaf pilləsində öz yerini ona verir. Məhəbbət hissi Vərqanın ikinci ideyasına maneçilik törətdiyi zaman Vərqa onu boğmağı bacarır, insanpərvərlik duyğularının, bəşəri eşqin daha qüvvətli olduğunu göstərir. Nəticədə isə ikinci ideya – humanizm qalib gəlməklə də, Vərqanın birinci ideyasını təsdiq edir və ona yol açır.

Beləliklə də Məsihi bir daha təsdiq edir ki, aşiq üçün birinci şərt, əsas keyfiyyət humanizmdir. Əgər bir cəmiyyətdə insanpərvərlik hisslərinə yer yoxdursa, orada həqiqi eşq də qol-qanad aça bilməz. İnsanpərvərliklə eşq qoşa yaranmışdır. Yüksək humanizm, bəşəri məhəbbət həyatın, varlığın bəzəyidir.

Məsihi, məhəbbəti belə geniş planda, ictimai-siyasi həyatla əlaqəli verməkdə, fərdi məsələləri ümumi məsələlərlə bağlayır, azad sevgi və humanizm fikirləri həm emosional-lirik, ailə-məişət səhnələrində, həm də hərb lövhələrində eyni ahənglə canlandırır. Ziddiyyətli ictimai şəraiti, feodal münaqişələrini və qaçaq-quldurluğu məhəbbət aləmi ilə qarşılaşdırmaqla öz idealını hərtərəfli tərənnüm edir.

Orta əsrlər cəmiyyətinin mühüm hadisələrini, ictimai münasibətləri epik lövhələrlə, geniş planda əks etdirir, insanları mənəvi gözəlliyi və ziddiyyətləri ilə təsvir etməklə orta əsr həyatının bədii salnaməsini yaradır.

"Vərqa və Gülşa"da təbii lövhələrin təsviri, həyati meyllər diqqətəlayiq yer tutur. Lakin bunlar əsərdə nə qədər qüvvəli görünsə də, aparıcı xətt təşkil etmir. Poemada realistik səhnələr çox vaxt nağıl və dastanvarı lövhələrlə qaynayıb-qarışır.

Məsihinin əsərində surət və xarakterin təsvirində inandırıcı cizgilər də özünü göstərir. Lakin bütövlükdə onları realist surətlər adlandırmaq olmaz. Çünki xəyali və təbii meyllər bu surətlərdə bir-birini tamamlayır və buna görə də onlar gah təbii, gah da qeyri-təbii vəziyyətdə göstərilir. Məsihi onların mənəvi-əxlaqi sifətlərinin təsvirində bütün klassik sənətkarlar kimi qəhrəmanlarını sevdirməyə, ülvi məqamlara yüksəltməyə çalışır. İdeal qəhrəmanın təsdiqi və yaradılmasında romantikasını işə salır, müəyyən hadisə və surətləri romantikləşdirir.

Poemada surətlərin davranışı, hərəkət istiqaməti əsasən şairin yaradıcılıq idealı ilə müəyyənləşir. Qəhrəmanların bütün xətti-hərəkətləri də bu baxımdan qiymətləndirilir. Habelə eyni niyyətlə hadisələrin ictimai əsası, surətlərin mənəvi aləmi verilir ki, bu da romantik rəngləri lövhədən-lövhəyə tündləşdirməyə gətirib çıxarır. Lakin müəyyən vaxtlarda, xüsusən ailə-məişət səhnələrində, romantik qəhrəmanlar əsasən təbii vəziyyətlərdə göstərilir, onların ülviyyət aləmi canlı lövhələrlə aydınlaşdırılır. Romantik və realist ənənələrə sadiq qalıb onları vəhdətdə götürmək Məsihinin xarakter yaratmaq üslubuna məxsus bir keyfiyyətdir.

"Vərqa və Gülşa"da öz arzusuna çatmaq üçün müxtəlif vasitələrdən istifadə edən surətlərin səciyyəsini aydınlaşdıran məqamlardan biri onların həsbi-hal və müsahibələridir. Əsərdə bu deyişmə və monoloqlar əhvalata bir gərginlik və canlılıq gətirir. Səciyyəvi cəhətlərdən biri də budur ki, poemada surətlərin vəziyyətdən-vəziyyətə düşməsilə əlaqədar olaraq həsbi-halların da səciyyəsi dəyişir. Ailə-məişət səhnələrindəki lirik-həzin mükalimələr müharibə səhnələrində kəskin, gərgin mükalimələrlə əvəz olunur.

Məsihi poemasının səciyyəvi bədii xüsusiyyətlərindən biri elə bu gərgin vəziyyətdir. Əhvalatın sürəti, ardıcıl inkişafı ilə məhdudlaşmayan gərgin hərəkət, surət və xarakterlərin daxili aləminə də nüfuz edir. Kəskin toqquşmalarda zirvəyə qalxır. Məhz buna görə də Məsihinin qəhrəmanları hərəkət və fəaliyyəti ilə seçilir.

Məsihinin bədii metodu – döyüş səhnələrinin təsvirində, təbiət təsvirlərində də özünəməxsus cəhətləri ilə fərqlənir. O, Firdovsi, Nizami kimi orta

əsr müharibə lövhələrini canlı və təfsilatı ilə verə bilmiş, həm kütləvi, həm də fərdi döyüş təsvirlərində orta əsr hərb qanunlarını incədən-incəyə gözləmişdir.

"Vərqa və Gülşa" poemasının dili şairanə, səlis və aydındır. Şair xalq və klassik ədəbi dilin məna zənginliklərindən istifadə edərək gözəl məcazi ifadələr, mükəmməl təşbihlər, istiarə və mübaliğələr işlədir, öz düşüncə və duyğularını canlı şəkildə tərənnüm edə bilir. Xalq hikməti xəzinəsindən bacarıqla istifadə edərək bir sıra idiomlar, atalar sözləri vasitəsilə fikrini, təsvir hədəfini aydın və təravətli şəkildə ifadə edir.

Məsihinin poemasının sənətkarlıq xüsusiyyətlərinə, bədii təsvir və tərənnüm vasitələrinə dərindən nəzər saldıqda onda Füzuli sənətinin təsiri aydın duyulmaqdadır. Poemada bəzi epizodlar istər məna, məzmunca, istərsə də formaca Füzulinin "Leyli və Məcnun" poeması ilə səsləşir. Lakin Məsihi, Füzuli şerindən klassik poeziyanın ən gözəl, kamil nümunəsi kimi yaradıcı şəkildə istifadə etmiş, onun ecazkar sənətkarlıq sirlərindən öyrənsə də, sərbəst düşüncə tərzi və bədii təfəkkür ilə parlaya bilmişdir. Onun Füzuli sənətkarlığından, böyük şairin bəzi dil və üslubi keyfiyyətlərindən təsirlənməsi təqlidçilikdən çox uzaqdır.

"Vərqa və Gülşa" poeması dil-üslub xüsusiyyətləri etibarilə Füzuli sənətini xatırladırsa, ideya-fəlsəfi məzmunu, bədii təfəkkür tərzi və ümumi ruhuna görə Nizaminin epik yaradıcılıq ənənələri ilə səsləşir.

Məsihi poemasında elə söz və ifadələr vardır ki, onların bir çoxuna XVII əsr şairlərinin dilində belə nadir hallarda rast gəlmək olar. Aşağıdakı sözlərə nəzər salaq:

Çaldırmaq – qavzamaq, tərpətmək – təprətmək, gözləmək – gözədmək, endirmək – ildürmək, baxmaq, qaçmaq – çüzmək, soruşmaq, hal-əhval tutmaq – istəşmək, necə – nəcük, uçurmaq – çurmaq, isə – irsə, ağlamaq – yığlamaq, səy göstərmək, çalışmaq – ulaşmaq, əgər – ər, el – il və s.

Bu misalların sayını artırmaq da olar. "Vərqa və Gülşa"nın dilində cığatay təsiri də xüsusilə nəzərə çarpır. Məsihi elə sözlər işlədir ki, onların özbək-cığatay dilindən gəlməsi ilk baxışdan anlaşılır. Bu xüsusiyyət Məsihinin müasiri Sadıq bəy Əfşar (Sadiqi) üçün də çox səciyyəvidir. Görünür, hər iki şairin Orta Asiya ədəbiyyatı ilə əlaqələri qüvvətli olmuşdur.

Məsihi, əsərini yaradarkən şifahi ədəbiyyat ənənələrindən də bacarıqla istifadə etmişdir. Poemada yazılı ədəbiyyatla qoşa, xalq yaradıcılığının da güclü təsiri özünü göstərir. Xalq təxəyyülü ilə bağlı xüsusiyyətlər özünü əsərin məfkurəsində, bədii formasında hiss etdirmiş, yeni təravətlə canlandırılmışdır. Xüsusən, "Vərqa və Gülşa"dakı ayrı-ayrı motivlər, surətlərin xarakterik xüsusiyyətləri, xalq məişət lövhələrinin təsviri, dil və üslubi əlamətlər folklor

ənənələri ilə yaxından səsləşir. Beləliklə, Məsihi, ənənəvi süjeti mənsub olduğu xalqın bədii təfəkkür tərzi ilə Azərbaycan həyat və məişəti ilə sıx surətdə bağlamış, yaşadığı mühitin ictimai həyatını, əxlaqını, məişətini təsvir edərkən yazılı ədəbiyyatın gözəl, mütərəqqi ənənələri ilə yanaşı, xalq yaradıcılığından da ilham almışdır. Bu keyfiyyəti ilə Məsihinin əsəri XVII əsrdə klassik poeziya ilə şifahi ədəbiyyat arasında qarşılıqlı əlaqələrin daha da sıxlaşdığını, klassik şeirdə xalq ruhu və həyatilik meyllərinin geniş miqyas aldığını göstərir.

* * *

Məsihinin "Vərqa və Gülşa" əsərinin məlum olan və bütün tədqiqatçıların da istifadə etdiyi əlyazması yalnız London nüsxəsindən ibarət idi*. Sonralar bu sətirlərin müəllifi tərəfindən əsərin yeni bir qiymətli əlyazması tapılmışdır. Tehran Universiteti Mərkəzi Kitabxanasında saxlanılan bu əlyazması Məsihi irsini öyrənmək üçün xüsusi əhəmiyyətə malikdir.

"Vərqa və Gülşa" əsərinin Tehran nüsxəsi, London əlyazmasına nisbətən qədim və mükəmməl, mətncə də səlis və aydındır. Bu əlyazmasının üzünün köçürülməsi tarixi poemanın yazılış tarixindən 4 il sonraya (1632–1633), London nüsxəsininki isə 13 il sonraya (1645–1646) aiddir.

Tehran əlyazmasında elə hissələr vardır ki, onlar London nüsxəsində yoxdur. Bunların içərisində nəsr və nəzm ilə yazılmış dibaçə xüsusilə nəzərə çarpır və XVII əsr Azərbaycan bədii nəsrinin nümunəsi kimi qiymətlidir.

* * *

Bu kitab çapa hazırlanarkən Tehran nüsxəsi əsas götürülmüşdür. Şairin klassik poeziya üslubunun qorunmasını təmin etmək üçün bu nəşrdə apostrof işarəsinin saxlanılması məqsədəuyğun bilinmişdir.

***Əlyar Səfərli***

---

* Poemadan bəzi parçalar vaxtilə akademik H.Araslı tərəfindən çap olunmuşdur (SSRİ EA Azərbaycan filialının "Xəbərləri", Bakı, 1944, №2–3; "Azərbaycan məcmuəsi", Təbriz, 1946, №2–3).

## RÜBAİLƏR

I

Ey mərifətin bağі-cəhanın səməri,
Vey məkrəmətin bəhri-vücudin göhəri.
Vərqadədurur kəmali-eşqin xəbəri,
Gülşadədurur cəmali-hüsnün əsəri.

II

Ey aşiqü məşuqə qoyan əndazə,
Sazəndeyi-sünün əməl etmiş tazə.
Üşşaqidə Vərqayi düzübdür sazə,
Gülşayi qılıbdurur bülənd avazə.

III

Ey dust, məhəbbətində zar eylə məni,
Tövfiq qəvafililə yar eylə məni.
Vərqa kimi aşqində yar eylə məni,
Gülşa kimi şövqində həzar eylə məni.

## BƏYAN EYLƏ BU, QALİBLƏ KİTABUM HƏMÇƏNİN XƏLQƏ

Bir şəbi-deycur ki, sərməstani-büqayi nur badeyi-nəvamisdin məxmur və əsbabi-vəqayeyi-həvasdin məhcur idi. Ol gecə bəni-zar bir neçə yar ilə çün mahü səyyar bidarü şəb zindədar, gah mühibbi-razə cəlis və mətlubeyi-niyazə ənis və zəmani xümxaneyi-həsrətdin badənuş və əşki-heyrətdin gülfürüş olub və saəti tərkibi-mükəvvinatdə sayiqü lahiq və tərkibi-əşkaldin nətayici-layiq düzüb, vəqti seyri-müluk ratibəsindən mütəfəkkir və aşiqü məşuq taifəsindin mütəzəkkir yekan-

yekan tedadi-müstəidani-ferəqi-hər zaman edərkən, nagah süruşi-huşim ərseyi-xatirə bu möhməl məzmun yeritdi ki, aya nə cəhətdin müxəddəreyi-nəğli-Vərqavü Gülşa bavücüdi-cihazi-eşqi-həqiqət təraz ilə səramədi-cəhan və hüsni-cəmalda nəvadiri-dövrandurlar, bəzmi-məhəbbətdə üşşaqi-əzmanə sabiq və rəzmi-xüsumətdə Rüstəmi-dastanə fayiq, meydani-hicrdə sərbazlıqları məşhur və əvani-zəcrdə vəfadarlıqları mənşur. Əcelle fohul, bəlağətpişeyi-farsi zəbanan valeh, qəbulifəsahətəndişeyi-türki bəyanan ədəmi-etibarilə o bəyanın izdivacından xatiri-həzimət və rüxsareyi-əzimət döndərüb, leyaliyi-əfkar və əyyamiemardə ol bakirəyə həmağuş və ol sovdayə həmduş və cami-zülal nəqllərindin badənuş olməmişlər. Bu ehmal zahiri-hal ol iki ruhə şəcereyi-məhəbbətə müəddayi-xələlü pejman və mouresi zələlü xüsran olmağı əcəldin mizani-etibardə ol kamil əyarlərin əyari-kari nöqsan və ol sərvisənubər nihadlar bir ttərrüzi-bidadə ulaşub hədəfitiri-təvəhhümi-xəta olalar. Bu halə müqarin təlieyi-ilhamü iradat qəlbi-münkəsirimə bu iradət buraxdı və gərdəni-idraki-xatirimə qəlladeyi-feyzi-izaət taxdı ki, ey qəriqi-bəhri-təhəyyürü qəmanü həriqi-atəşi-təfəkkürü hirman, əni Məsihiyi-natəvan, guya qayəti-qeyrətü vəfa və nəhayətiisməti-səfa rəva görməmiş kim, ol pərdənişini-iffət və bəzmi-ayinişəhadətlərinin pərçəmi-əlamları həvagir və nami-namiləri ifşapəzir olub, məhafilü məcalisdə hər bidərdə dərdi-zəban və hər naməhrəmə rətbül-lisan ola. Nişə kim bu əzmandə çehreyi-mücameə helyeyi-vəfa bədəlinə arayişi-nifaq düzülmüş və silsileyi-vəsləti-həqiqət təlsiq və iqdi-əqidəti-məvəddət tənsiq bilkülliyyə üzülmüş, meyi-məhəbbətihəqiqi, badeyi-məvəddəti-məcaziyə zirdəst və nəşeyi-üzubəti-camiələst mərarəti-xümari-küdurətdən pəst olmuş. Çün il iki sitəmrəsideyialəmşühud gövhərləri ziar və cövhərləri vəfadar və alimiqdar idi, fələkikəcrəftar ki, lazal işi, dəvarişi qəddarlıq və məkkarlıqdır, hərəkatların öz dövrünə müxalif görüb, zərbi-çeşm zəxmi-həsəd birlə cudlərin ərseyivücuddin götürmüş labəl qayəti-xissəti-zat və kudurəti-sifatdin namü nişanların itürmüş. Çün pərtövi-məzmuni-mülhəmi-qeybi məsameimücamiə, izarəti-işaət saldı. Cümləsi müttəfiqül-ləfz vəl-məna daməngir olub sutdilər ki, ey bülbüli-gülzari-mərifət və iqan və ey həzar dəstani-şaxsari-məhəbbətü ürfan, sən ki, müdam rəxşi-müxalifətimeydan, mücahidəti-dövranə cövlan berməkdə nəqsi-rayinə amil və nəqzi-əhdinə mayilsən. Nolə ol gülbüni-məzmuni-aşiqü məşuq və manei-iştihar olmuş qüvvəti-təbiəti-məani birlə rəfi-hicabi-təvari qılub

bərabəri-şəvahidi-gülzarə mənzuri-ənzar edüb tikəsən. Və ol ləaliyi-məknuni və cəvahiri-məxzuni tişeyi-bünyani-xamə birlə istixrac edüb rişteyi-nəzmi-canə çəkəsin və ol bəzri-məhəbbəti ki, əhdi-bəid kən-duçei-nisyan və ətalətdə məhbusdurlar, dəstyari amili- ənamil birlə qılub əhli-halə əkəsin. Necə bir lafi-gəzafın rüxsari-xilafə qazə və təblitəhi kimi bülənd avaze ola. Əgərçi əfsanehayi-üşşaq ki, mün-təşirəl-afaqdürlər əksərini üsuli-məşhuri binayi-mövzuniyyət bulmuş və füru'i-mə'muriyyətə şürfəvü küngürə nəsb olmuş. Mərəmmətasan və ustadi-hərasan degil, əgər sən bu bina təmirinə ki, zəlazili-həvadisi-cədran və ə'lamin zirü zəbər bəlkə asarindən üqulə xəbər yox. Və me'marani-əqalimi-kəlam ol xərabənin intizami-təcdidinə aciz və əs-babi-klam ol xərabənin intizami-təcdidinə aciz və əsbabi-tənzihinə naçiz olmaqları, əzhəri-minəşşəmsdir. İqbal edəsən lafına kirdarın mü-vafiq və qövlinə felin sadiq görünüb muncan təbiət birlə guyi-mə'rifəti meydani-həqiqətdin çıqarub mənzili-təsdiqə yetürəsin, bu xərabəsaz-lıqda eşqbazlıq sənə mucibi-sərəfrazlıq və əxvani-sabiqə höccəti-ənbazlıq olə. Lillahülhəmd ki, qaməti təb'inə qəbayi-mövzuniyyət həmqəd və büq'eyi-inşadə tiynəti-səlimin zişəddü yədd olub ibtida o süxənü ixtirai hər fəndin qüdrətinə əcz rəva görülməz. Və əmtieyi-siyaq üzrü nə bu suqdə bəha verilməz. Əgərçi həqiqəti-ibram bu əmri-şaqq təklifi-malayətaqdur, nişə kim o kəncurlar bavücudi-dəstgahi-miknət və paygahi izzətilə dəsti-təsərrüf ol binai-müstə'səlül-əsasdin kutah edüb bu fəqiri-bisərüpa kim guşeyi-xəmuldə maliki-dinar olmiyə, imkan təmirinə nəçün rah bula. Və şəbistani-zülmət ki, beyzeyi-aləm-tabdin ziya pəzir olməz, sənai səha sibəha ol kişvərə neçün sayeyi-pənah sala. Fəmma təklifi-imtəhani mouresi-istilam ülüvvi-qeyrət və baisi-iltizam qülüvvi-himmət olduğidin bavücud ki, qiyməti-nəvai-əş'ari-şiar çün qili-üşşaq şikəstə və izzəti-ənsar ovtari-ümmidləri kimi güsəstə. Övraqi-əbyatları çün zülfi-şahidi-bipərva kimi pərişan və əğlaqi-nükatləri çün vücudi-ənqa binişandur. Ehmalsız istiqbali-müləccəmil-midadi təkye-rani-səhni-müraddə cövlanə gətirdüm. İnnəhü rəufü bilibad. İlahi, kərəmindin məs'ul və lütfindin mə'mul oldur kim, bu müsafiri-qərib məkməni-qeybi-aləmi-şühudə ələm tikdükdə qədəmin meymun, talein humayun qüdveyi-ərbabi-xaldin və zübdeyi-əshab qaldin, kambinü kamyab edüb zəllati-mə'ayibi-amatinə pərdeyi-himayət və kələmati-məatibi qamətinə puşişi-vəfayət buraxub kənəfi-kəramətində məlhuz və çeşmi-mə'anidü məhasiddən məhfuz ola.

Ayin olunduğunda bazar,
Ol ərsədə de mənim nəyim var?!
Çün lütf ilə şəm'i rovşən etdün,
Xarü xəsi bağİ-gülşən etdün.
Vermə bu çırağımı həvayə,
Gülzarimi sərsəri-cəfayə,
Qılma mənə hər nə kim səzadur,
Qılgil anı kim sənə rəvadur.
Məndin diləmək mürad səndin,
Çün üqdəyədür güşad səndin.
Səndin bizə kami-dil rəvayi,
Qəm üqdəsidə girehgüşayi.
Saldun bənə sayeyi-inayət,
Bildün nədür ibtidavü qayət.
Qayətdə götürmə sayə məndin,
Lütfün ilə kəsmə vayə məndin.
Baxdun çü bu zərreyi-nəbudə,
Çəkdün anı pərtovi-şühudə.
Arayişinə nizam verdün,
Ol silkidə intizam verdün.
Düşdü çü vücudə şur səndin,
Ol zülmətə nuri-hur səndin.
Dəh qüvveyi çar rükni-həsti,
Səndin düzülüb büləndü pəsti.
Alsan qamu verdügün mətaın,
Qət' eyləsən andin intifaın,
Əhbab dağılsa, dursa saqi,
Daxi nə qalur vücudə baqi!
Səndin budurur ümidi-məqsud,
Verüb əlümə kilidi-məqsud,
Rahi-tələbində şövqüm artur,
Ol şövqə müdam zövqüm artur.
Bir keyf ilə tazə qıl dəmağım,
Bir rahilə eylə pür əyağım.
Ta rəf ola e'tibari-zahir,
Bil məhv ola bu qübari-zahir.
Fərq eyləmiyəm ziyanü sudim,
Pür olə vücudü lavücudim.

Ərbabi-cəhanın ixtiyari,
Cəm’iyyətü cahü iqtidari,
Çün əvvəli düdür, axiri lət,
Sabiq qəmu lahiq oldu möhnət.
Qıl dideyi-e’tibarimə xar,
Ta çəkməyim ol həvadə azar.

## TOVHİDDÜRÜR BU BİR QƏSİDƏ

Afərin, ey maliki-mülki-cəhan, səd afərin,
Nəqşbəndi-kargahi-səfheyi-ruyi-zəmin.
Nuri-mir’atin əyan, keyfiyyəti-zatın nihan,
Şəfqinin kani səminü rifqinin qədri məhin,
Padişahi-mülki-həsti, alimi-aləm, mühit.
Hakimi-ruzi-cəza, ey davəri-dünyavü din,
Nəqmətin zindanidin bir guşədir veyli-cəhim,
Ne’mətin mehmanına bir xanədur xüldi-bərin.
Elminə hazir cəhanü helminə mənzur əman,
Hökmünə dünya müqəyyəd, ədlinə aləm rəhin.
Xəlqi-aləm acizindür mərifət əsvaqidə,
Cümlədür naçizü cinsi-mə’rifət dürri-səmin.
Oldu hüseyni-məhcəm üsyanə istiğfari-həsin.
Bürci-ümmidə kəməndi-rə’fətin həblülmətin.
E’tirafi-əcz edəb qəddin xəm etmiş əqli-küll,
Məzreyi-irfanə yetdükdə olumuş xuşəçin.
Taci-qədr ilə yetürdi fəxr ilə Keyvanə sər,
Xaki-rahi-dövlətin hər firqə oldu sərnişin.
Macərayi-xəsmidin hifzin kimə oldu sipər,
Zəxmi-tiri-hadisati-dövridin olmuş əmin.
Cinnü insə hökmran oldu Süleymani-nəbi.
Olduğiçün ismi-pakın surəti-nəqşi-nigin.

Atəşi-şövqin salubdur sineyi-üşşaqə suz,
Vüslətin nuri bəidü firqətin nari qərin,
Pərtovi-hüsni-rüxün mə’şuqə arturmuş cəmal,
Atəşi-eşqin qılupdur aşiqi zarü həzin.

Qəmzənin cəlladi Vərqani qılıpdur müstəham,
Təl'ətin razi təni-Gülşani qılmış nazənin
Qeydi-hüsnün xatiri-Vərqani qılmuşdur əsir,
Xameyi-sün'ün rüxi-Gülşadə çəkmiş nəqşi-çin.
Kim ki, səndin döndərüb himmət verə hurayə dil,
Oldu ol bidərd xari-dideyi-eynülyəqin.
Cümlənin yadın sənin yadınlə qət' etmiş Məsih,
Nəfs tüğyanındə hifzindür ona hisnü həsin.
Atəşi-təqsirinə saçsın zülali-miğfərət.
Aləmi-vizr ilə haşa kim ola zarü qəmin.
Ol ümidi-miğfərətdin neçəsi növmid olur,
Siğeyi-əstəğfirüllahdurur ona nəqşi-çin.

## BU, BİR BÜRHAN DURUR XƏLQƏ VÜCUDİ-VACİBİ-HƏQDƏN

Ey əql dəvani-bəzmi-idrak,
Vey rahbərani-mənzili-xak.
Vacib görünür bu ziüqulə,
Rəh varməqə sahibi-qəbulə.
Salduqdə nəzər mükəvvənatə,
Basduqdə qədəm bu şeş cəhatə,
Gördükdə vücudi-insü cinni,
Hasil oluna dəlili-inni,
Ya öz-özüdin ala bəyami,
Sadiq ola mən ərəf kəlami.
Ey əql bilən, işə müdəbbir,
Övzaə mübəddilü müğəyyir.
Sənsən çü bu rütbəyə mükərrəm,
Tərkibi-şühudə cüz'i-ə'zəm,
Qəflət sənə qayəti-sitəmdür,
Sudi qəmu mayeyi-ələmdür.
Fikr eylə, vücudi-cümlə əşya,
Nə ratibədin olundu peyda.
Bihudə degil bu karsazi,
Fərq eylə həqiqətü məcazi.

Aləm əgər olməsəydi mövcud.
Əldə nə idi dəlili-məşhud?!
Dünya qəmudur dəlil, o, mədlul,
Bunlar qəmu nəqldür, o, mənqul.
Bu rəhrövə rahdür o mənzil,
Bu, badiyədür, o, Kə'beyi-dil.
Kim verdi bu dəh üqulə tərtib,
Kim düzdü de ol üsulə tərkib.
Kimdən yedi zərbi-taziyanə,
Səgritdi səməndin ol miyanə.
Kim saldı o tovsənə kəməndi,
Kim qıldı o rəxşi nə'lbəndi.
Ömrü olalı kəsər şəvare,
Nə nə'lü nə mix olundu zaye.
Nə'li məhü mixdur sitarə,
Təmqasi günəşdür aşikarə,
Zahir sənə nəyyireyn nuri,
Kimdəndür o behcətü sürurí?!
Səyyarü səvabiti-güzidə,
Kim anlara verdi nuri-didə.
Kim hiss ilə cismə qıldı yari,
Kimdəndür anın əyari-kari?!
Yandı sənə gərçi şəm'i-biniş,
Göstərdi vücudi-afəriniş.
Kim tikdi o şəm'i, düzdü xəzran,
Müşkül ona kimdən oldu asan?
Gər qətreyi-abdən vücudin,
Oldu sənə mayeyi-nəmudin,
Bu surəti çəkdi qansı nəqqaş,
Ol cismə kim etdi ruhi həmtaş?!
Tərkibə ol aləti-mükərrər,
Tərtibə müqəddəmü müəxxər,
Fikr olsa nə surət üzrə rəqqas,
Peyda olur anda mə'niyi-xas.
Cümlə geyə çün fəna libasi,
Viral ola bu vücud əsasi,
Zahir olur andə var kimdür,
Ol dardə pərdədar kimdür?!

Gər qılsa durub kişi təəmmül,
Açsa ona dideyi-təəqqül,
Zahir ola vəqti-nəfyü isbat,
Xurşid həq oldu, xəlq zərrat.
Təşbih əgərçi narəvadür,
Ol zatə məsəl dimək xətadür.
Liykən bizədür vəzifeyi-pas,
Təhqiqi-rümuz kəlləmünnas.
Yoxsa kim olundu ona məhrəm,
Kim oldu o kibriyayə həmdəm.
Kim anladı sirri-zati-biçun?
Kim bildi nədür o zatə məzmun?
Bir vəz'ilə düzdü bu həsari,
Bir nəhc ilə qıldı bu mədari.
Ta tişrəyə kimsə bulmiyə rah,
Ta olmiyə kimsə andin agah
Ol rəmzə yetişməyə xəlayiq,
Fərq ola miyani-xəlqü xaliq.
Əqli-üqəla zəlilü heyran,
Məhbus bu həbs içində nalan.
Döndərməgə yüz bu yüzdin idrak,
Bəsdür bizə üzri-maərəfnak.
Yegdür, keçəlüm bu cüstü cudin,
Yox kimsəyə bəxş o rəngü budin.
Alub ələ zeyli-şər'i-şare
Bu yolda olub o qövlə qane.
Hər rahrəvin görür dəlili,
Hər kimə o qıldı Cəbrəili.
Əvvəl bata çeşmeyi-həyatə,
Axır yetə mənzili nicatə.

## BU, NƏ'Tİ-RƏSULİ-MÜCTƏBADUR

Ey şahi-bəlavü izzü təkrim,
Vey xosrovi-mülki-xəlqi-tə'zim.
Sərlövhi-kitabi-afəriniş,
Tüğrayi-xitabi-hökmi-biniş.

Ey məhrəmi-razi-sirri-mübhəm,
Vey bəzm tərazü vəhy mülhəm.
Şər'in durub etdi nəsxi-ədyan,
Göstərdi təriqi-kuyi-irfan.
Ey cameyi-mə'niyi-həqiqət,
Qanunnəhi-kişvəri-təriqət.
Çün şəm'i-vücudin oldu rövşən,
Qıldı bu cəhani tazə gülşən.
Ey şafeyi-mücrimani-asi,
Səndin qəmuyə rəhi-xilasi.
Zərrati-cəhan tənəbli-rahın,
Ərş oldu kəminə təkyəgahın.
Ey Kə'beyi-çar rükni-aləm,
Nuri-əzəlivü möhri-xatəm.
Çərxü fələk etdilər ərusi,
Verdün olarə çü paybusi,
Ey zinəti-məhfili-nübüvvət,
Arayişi-bəzmi-ünsü vəhdət.
Sən ləcceyi-kövnə lö'löyi-nab,
Sən zülməti-bəhrə nuri-məhtab.
Ey baisi-nəzmi-xakü əflak,
Şahid bu sözə kəlami-lö'lak.
Vicdanınədür təriqi-adət,
Binayi-qüyub vəşşəhadət.
Ey kaşifi -rəmzhayi-müşkil,
Təbliğ sərayü vəhyü münzil.
İrdi qəmu xəlqə feyzi-cudin,
Ta yetdi şəhadəti-şühudin.
Ey çeşmi-cəhanə nuri-didə,
Xurşid qulami-zərxəridə.
Tənqihi-dəfatiri-qiyamət,
Mövquf açasan ləbi-şəfaət.
Ol fatehi-həştbabi-gülşən,
Zatilə sifatə elmi rovşən.
Çün görmədi bizdə nuri-idrak,
Yazdı o misali-marəfnak.
Ol kim bula qürbi-qabi-qövsin,
Ol pərdədə ola surəti-zin.

Di anda neçün qalur cəhalət,
Kim ola ona rəva bu halət.
Ey valiyi-çar həddi-təmkin.
Təhsi nişanə, həzar təhsin!
Güftarın açub dəri-hidayət,
Rəf' eylədi zülməti-zəlalət.
Saldı araya kitabü ə'lam,
Göstərdi təriqi-küfri-islam.
Sabit sən edüb vücudi-vacib,
Qayim sən edüb vücubi-qayib,
Səndin əgər olmasaydı tə'lim,
Keyfiyyəti-din, ədayi-tə'zim.

Kim anlar idi ziyanü sudi.
Kim eylər idi xuda sücudi?
Dövranə əcəb mədar qoydun,
Şər'in bizə yadigar qoydun,
Həm müşkil əgər olunsa izhar,
Sən həll edüb eylədün xəbərdar.
Nə faidə bu tərəfdən iqbal,
Yoqdur sənə qeyri-ruyi-ehmal.
Səndin bizə lütfü mehribani,
Bizdən sənə qəhrü sərgirani.
Səndin bizədür təriqi-yari,
Bizdən sənə şivə dilfikari.
Səndin bizədür yetən şəfaət,
Bizdən sənə nəqsi-əhdü adət.
Üsyan səni bizdən etdi tirə,
Qəmdür bizdən sənə zəxirə
Sındurduq əgərçi zərfi-irfan,
Cəhlilə dutub təriqi-üsyan.
Haşa kəsəlüm ümid səndin,
Ya görmüyəlüm nəvid səndin.
Aləm qəmudur sənin əsirin,
Adəm qəmudur sənin fəqirin.
Yox qeyrə sənin çü ehtiyacın,
Ta inciyə olmasa məzacın.

Olmadı səninlə sayə həmseyr,
Yə'ni ki, sənə ədil yox qeyr,
Zatın qəmu nuri-pakdur pak,
Çün bulmaz ani həvasü idrak.
Pəs düzdü həkimi-ləyəzali,
Ol nurə bu surəti-xəyali.
Ta aləmi-cismə ola şahid,
Xəlqə ola mənşəi-fəvaid.
Yox sayəsi surəti-xəyalın,
Bir şəkl misaldür cəmalın.
Gər cism duranda intisabə,
Möhtac ola badü xakü abə.
Ol necə çıxar dutub kəranə,
Bu şüğlilə qürbi-laməkanə.
Pəs zahir olundu ol mükərrəm,
Bu növ'idə nurdur mücəssəm.

## BƏYAN EYLƏR BU ME'RACİ – RƏSULİ XAS İLƏ AMƏ

Çün nəqşi-cəmalın, ey düri-pak,
Pərtov salub oldu zinəti-xak.
Verdükdə bu şərbəndi-imkan,
Çərx əhlinə imtidadi-hicran.
Kərrubiləri yaqub fəraqə,
Qüdsiləri nari-iştiyaqə.
Ərvahi-müqəddəsü mükərrəm,
Əqdasü müəzzəzü müəzzəm.
Əflakü behiştü hürü rizvan,
Lövhü qələmü hicabü qılman,
Bir gecə əl açdilər niyazə,
Ərz eylədilər o çarə sazə.
Key faidə xasü amə səndin,
Ümmid yetişdi kamə səndin.
Ta necə qıla zülali-heyvan,
Ləb təşnələri zəmini-rəyyan.

Nola yetişə səhabi-rəhmət,
Salə bizə dəxi zilli-rafət.
Toxm əldə hənuz sayəpərvər,
Göstərdi nəhali-arzu bər.
Əndi yerə ruhi-qüdsi-tə'yid,
Bir baqmaqdə çün ziyai-xurşid.
Pərvanə yetişdi şəm'i-cahə,
Qoyduqda qədəm o bargahə,
Pəs dedi əda qılub təhiyyət,
Ey xosrovi-təxti-mülki-izzət.
Dur kim sənə yetdi vəqti-me'rac,
Nə'lini firəqi-ərşə qıl tac,
Qoy cümlə təəllüqi kəranə,
Sür Rəxşi məkani-laməkanə,
Nöhrağı burax, bu nöh rəvaqə,
Axir verə görgilən fəraqə.
Qoy tişrə qədəm bu çar sudin,
Dur kam götür gəl arzudin.
Bir bəzm səninçün oldu tərtib,
Bir keyf səninçün oldu tərkib,
Kim görməmiş ani çeşmi-didə,
Hər nə desin andin ol guzidə.
Həmpey özün, ey büti-yeganə,
Həm züllə götür bu xakdanə.
Durmuş fələki-həzar didə,
Pabusinə qəd qılub xəmidə.
Ta edə nisar çərxi-əxzər,
Almış başa ol təbəq-təbəq zər.
Şayəd ki, görə səni sitarə,
Tikmiş yola dideyi-nəzarə.
Ta kim bula rütbə payeyi-ərş,
Düşmüş yoluna özün qılub fərş.
Ta yetişə paybusi-yarə,
Səf çəkdi məlayik intizarə.
Ey məhrəmi-bəzmi-sirri-ülfət,
Ta olmiyə fövt vəqti-fürsət.
Atlan bu Büraqi-bərqrahə,
Yetür özüni o bargahə.

Ver zinəti-nöh süpəhri-əxzər,
Ol əhli səmayə sayə göstər.
Xoş ol ki, minüb büraqi-razə,
Əqsayə yetüb durub niyazə.
Basdun qədəm andin asimanə,
Verdün məhə möhrünü nişanə.
Rə'yin dili-Tirə verdi nuri,
Nahidə sürur ilə hüzuri.
Qədrin çü yetişdi afitabə,
Zərbəft ona bağladı əsabə.
Bəhramə yetişdi bəhrə səndin,
Fərman yeridüb o şəhrə səndin.
Bərcisə açub dəri-məunət.
Verdün ona qayəti-rəunət
Durdu çü huzurinə müqabil,
Həll etdi Zühəl təmam müşkil.
Qıldun dili-sabitati rövşən,
Ol gülxən olundu tazə gülşən.
Gördükdə səni rəvaqi-sadə,
Qıldı durub ətləsinü sadə.
Lövhü qələmə sürur verdün,
Kürsi ilə ərşə nur verdün.
Payanə yetüb cəhati-həsti,
Dövranə yetişdi təngdəsti.
Şövq eylədi çün sənə dəlili,
Saldun o büraqü Cəbrəili.
Ta rahləsin qıla səbükbar,
Hər mənzilə yetdi qoydu bir bar.
Bir növ' mücərrəd oldu ol nur,
Ta özün özündin eylədi dur.
Rəf' oldu hicabü qaldı rəfrəf,
Yetişdi mükəllifə mükəlləf.
Didarə çü məhrəm olmadı eyn,
Oldu yüzə pərdə qabi-qövseyn.
Ol pərdə durur pür əmri-hariq,
Ta anlana sirri-xəlqü xaliq.
Ol əmr əgər olsa idi haciz,
Mümtaz idi imtiyazə aciz.

Gər görmədi ani çeşmi-didə,
Haşa ola qürbidən rəmidə.
Əlbəttə, bu dideyi-zəmani,
Görməz şəhi-mülki-laməkani.
Tən didəsidür həmişə tənbin,
Can çeşminədür bir özgə ayin.
Ney-ney qələtəm ki, çeşmi-heyrət,
Yadlığ kilidin kim etdi rö'yət?!
Bir kər aça qeyrə didə babın,
Görməz dəxi ol yüzün kitabın.
Verdükdə hərimi-pərdədari,
Məhbubinə rütbeyi-cəvari,
Hər növ' ona açdı üqdeyi-raz,
Hər razdə bin kəlam edüb saz,
Saz zahirü sözidin xəfadə,
Künd oldu qələm bu macəradə.
Cari nə zəban o göftguyə,
Avaz nə aşina gəluyə.
Nə bir tərəf ol kəlamə qail,
Nə bir cəhətə səda müqabil.
Xamuş, Məsih, kəs bəyanın,
Saxla ədəbin yığub zəbanın.
Keyfiyyəti-hali-razi-biçun
Di, qandadurur bəyanə məşhun?!
Ol sirrə kim oldu di xəbərdar,
Bəsdür sənə bu nümunə izhar.
Yoqdur sənə çün bu yolda həmrah,
Yek döndərəsin bu rahdən rah.

## BUDUR İSBATİ-SEYRİ-SÜR'ƏTÜ ME'RACİ CİSMANİ

Ey Xosrovi-kişvəri-səadət,
Gəncuri-zəxireyi-şəfaət.
Qət' etdügünə sənin mənazil,
Binayiyi-didə oldu racil.

Gözün dilədi görə liqasın,
Ta göz aça gördü öz qəfasın.
Ta kim baxa dideyi-zəmanə,
Çıxdun o məkani-laməkanə.
Ayininə düşdü pərtovi-həq,
Kəşf oldu rümuzi-kari-mütləq.
Əsrari-həqiqət oldu zahir,
İqrari-məhəbbət oldu bahir.
Əhkami-əvamirü nəvahi,
Təlqin olunub sənə kəmahi.
Həqdin sənə yetdi çox təhiyyət,
Səndin həqə iltimasi-ümmət.
Bəsdür bizə olmaduq fəramuş,
Oldu sənə yadımız həmağuş.
Nə qəm əgər ola yüz məasi,
Ol yad verür bizə xilasi.
Çıxdun orayə ki, çeşmi-idrak,
İdrakidədür zəlilü qəmnak.
Ey fərqinə taci-qürbi-əfsər,
Çün oldun ol arzuyə həmsər,
Bu hey'əti çərxü kuyi-aləm,
Mənzurun olub çü nəqşi-xatəm.
Gördün qəmu bir nəzərdə asan,
Saldun hər firqiyə zilli-ehsan.
Döndün gerü eyləyüb ticarət,
Düzdün füqəra içün bəzaət.
İnsaf degilmi zadeyi-gil,
Qət' eyləyə munceyi-mərahil.
Axmaqda hənuz kuzədin ab,
Cünbüşdə hənuz həlqeyi-bab.
Əxyarə əruci-əmri-məzkur,
Cism ilədür e'tiqad məşhur.
Bə'zisi əruci-ruhə qail,
Olmuşlar əslü fər'ə qafil.
Yox reyb ki, çox güruhi-islam,
Təhqiqlərindən olmuş ə'lam.
Kim cismdurur qəmu məlayik,
Hər birisidür bir əmrə salik.

Göy yumub açıncə mümkünati,
Seyr eyləyələr o şeş cəhati.
Ruhin yerədür nüzuli-vəhyi.
Göstərmək özün misali-vəhyi.
Əsraruni ol nikü xəsayil,
Gördü qəmusini zişəmayil.
Cinnilərin ol suluki-rahi,
Sür'ətdə kəmali-dəstgahi.
Bilqeys sərirdən hekayət,
Nəss oldu o nəqlidin rəvayət.
İsayi-Məsihə çün zəmanə,
Yar olmadı çıxdı asimanə.
Bunlər qəmudur səhihü caiz,
Ol rəhrövi de ni qıldı aciz?!
Bu zahir anın ki, cismidür can,
Can qət'i-məsafət etmək asan.
Dəxi nola düzsə xərqi-adət,
Ol həzrətə rütbeyi-ziyadət.

## BU QƏSİDƏ OL DÜRİ-DÜRCİ-NÜBÜVVƏT NƏ'TİDÜR

Ey nuri-çeşmi-binişü vey qibleyi-dua,
Xurşidi-afərinişo şəm'i-şəbi-hoda.
Dər mətbəxnəvali-to in nöh rəvaqi-çərx,
Bəhri-dəqiq qürseyi-nanəst asiya.
Pişi-ədibi-qədri to tifli-fələk müdam,
Rəhli-hilal dər bəru xəm kərde poşt ra.
Budiyi-to əsli-illəti-qayio vücud ra.
Xaki-rəhi-to çeşmi-cəhanəst tutiya,
Əncom be pasibaniyi-hərəmət ta tülui-mehr,
Məş'əl bekəf gereftevo istade cabeca.
Hərku xilafi-rayi-to rayi-degər zənəd,
An bixirəd ze cəhl gereftəş rəhi-xəta,
Dər bəzmi-bargahi-to in gərdxani-xur,
Şud xani-ma həzərkeş piş avər gəda,

Nuri'-to dər bidayət fitrət nəmud rox,
Vəz tost moqtəbes, həme ənvari-ənbiya,
Dər bəzmi-eyş çəngi-moradəş şəkəste did,
Hərku bəzili-qeyri-to zəd çenin eqtida.
Fülki-məasiyə kənəfin sahili-nəcat,
Dərdi-günahə mərhəmətin nüsxeyi-dəva,
Əzmin rayətində qılar bəndegi qədər,
Meylin iradətində qılar çakəri qəza.
Görməz əsir üsr ta qılsan əgər nəzər,
Qalmaz fəqir füqridə açsan kəfi-əta,
Səndin yetişdi aləmə feyzi-fücudi-cud,
Səndin bu tirə guşeyi-dünya bulub ziya.
Həqqa ki, cuyi-şir ona şürbilhəmim olur,
Cənnatə gər girərsə sənə döndərən qəfa.
Dünya çü cismidir qəmu tənlərdə puhsən,
Sən aftab qədrsənü özgələr səha.
Hər cürmə kim şəfaətin eylər səfinəliq,
Haşa ki, qərq edə ani ol ləcceyi-bəla.
Yüz döndərən sənə ola üsyanə gər qərib,
Olur fəzayi-düzəx ona rövzətül-səfa.
Zahir sənə təmam müradi Məsihinin,
Nə ehtiyac elminə izhari-müddəa?
Yığmə bu zürriyyədin götürüb zeyli-mərhəmət,
Həqqi-Şəbirü Şübeyrü Zəhravü Mürtəza.

## BU, MƏNQƏBƏTİ-ŞİRİ-XUDA ŞAHİ-NƏCƏFDÜR

Ey niyyəri-kişvəri imamət,
Vey qateyi-rişteyi-zəlalət.
Vey sədrnişini-təxti-sərməd,
Bivasitə canişini-Əhməd.
Ey ibn əmi-rəsuli-Muxtar,
Vey məhrəmi-razi-külli-əsrar.
Qaim sənədür binayi-iman,
Ol qalibədür məvəddətin can.

Ey mövridi-xasi-vali-min val,
Bütlanə olub dəlili-əbtal.
Əmr oldu sən edəsən qiraət,
Müşriklərə sureyi-bəraət.
Ey sahibi-xütbeyi-süluni,
Vey seyrü süluk rəhnümuni.
Səndin əgər olməsəydi imdad,
Olmuşdu cahan zəlalətabad.
Ey bütşikəni-hərimi-taət,
Yarın sənə göstərüb iradət.
Xət eylədi şanə düzdü şanın,
Olduqda ol evdə nərdibanın.
Ey qaili-qovli künti-mövlah,
Bizdən sənə kəsdi rahi-ikrah,
Türkin dilin qoyar rəsuli,
De necə olur xuda qəbuli?!
Ey Məkkə məsirü Kə'bə milad,
Vey Kufə məharü cəddə bünyad.
Meydani-iradətində xurşid,
Tabe' əlünə çü cami-Cəmşid.
Ey münzili-ənnümayə sadiq,
Mənsubi-səvabiqü ləvahiq.
Xurşidi-bidayətü nəhayət,
Məşşateyi-çehreyi-hidayət.
Ey fatehi-həft babi-Xeybər,
Bərhəmzəni-eyşi-Əmrü Əntər,
Bir zərbətinə yazıldı tüğra,
Təhsili-səvabi-külli-əşya.
Ey cövhəri-dami-zülfiqarın
Ə'danı qılubdurur şikarın.
Ərbabi-mənahivü mə'asi,
Az buldu o damdin xilasi.
Ey şir məsafu bəbr kinə,
Düşdü çü səlabətin zəminə
Küffarə çü yetdi ruyi-zərdi,
Əcz ilə dutub rəhi-nəvərdi.
Ey balinə bağlu sayeyi-fəth,
Şəmşirinə çağlu ayeyi-fəth.

Ta sən durub olmadun xüraman,
Bulmadı o dərdi-fəth dərman.
Ey raziyi-deynu qaziyi-dəyn,
Vey meyveyi-bustani-kevneyn.
Lazım bizə tanımaq kəmalın,
Tutmaq rəhi-ettebai-alın.
Ey mə’dəni-həftü çar gövhər
Hər birisi tac, fərqi-əfsər.
Dil qüvvəti, didə rovşənasi,
Canım ola cümlənin fədasi.
Ey ruhi-əminə sən müəllim,
Olduqda o macərayə hakim.
Feyzin ona açdı babi-məsdud,
Verdün əlinə kilidi-məqsud.
Ey bəhri-cəhanə dürri-ismət,
Vey keşti-zəmanə əbri-rəhmət.
Gər məzreyi-dəhrə verməsən nəm,
Pəjmürdə olurdu kəşti-aləm.
Ey püştü pənahi-dinü ayin,
Xurşid mədaru ərş təmkin.
İslamə gər açmasan cəmali,
Haşa ki, buleydi din kəmali.
Ey ayəti-şər’ə səndin ə’lam,
Müstəhfizi-din-pənahi-islam.
Ta gözləmədin təriqi-pasi,
Kim buldu rəhi-xudaşünasi.
Ey cameyi-hikməti-ilahi,
Vey maneyi-zilləti-mənahi.
Həqq əmri yetüb zühurə səndin.
Bünyani-xəta fəturə səndin.
Ey şəhri-ümumə babisən, bab,
Hər vaqiədə rücuyi-əshab.
Oldu sənə həll edüb təmami,
Qurtardın o xas ilə əvami.
Ey meyveyi-bağı-lütfü ehsan,
Vey dürri-səmini-kani-imkan.
Nə qə bizə çün imam sənsən,
Naqislər üçün təmam sənsən.

Ey həzrəti-kibriyayə məmduh,
Tufani-bəlayə kəştiyi-Nuh.
Xas ilə əvamə feyzi-alın
Yetməkdə o ne’məti-nəvalın
Vay ona duta rəhi-iduli,
Səndin bula rütbə naqəbuli
Cəm’ edə zəxireyi-zəlalət,
Ömri ilə kəsb edə xəsarət.
Ni qəm bizə gərçi ziri-barüz,
Təqsirü nədamət ilə yarüz.
Sən kimi aradə pirimiz var.
Alın kimi dəstgirimiz var.
Mövla əgər olsa sahibi-cah,
Var sayəsi bəndəsilə həmrah.
Ədna qulunun böyük vəbalın,
Dutməzlər anın biləndə halın.
Gər verdük isə xəti-qulami,
Alduq mənşuri-niknami.
Birinə ola məhəbbətin yar,
Haşa ola cürm ilə diləfkar.

## BU QƏSİDƏ HƏZRƏTİ ŞAHİ-NƏCƏF ŞANINDƏDÜR

Şahənşahi-fələk qədrü Süleyman cahü İsa dəm,
Vəliyi-haqq imamü müqtədayi-cümleyi-aləm.
Mədari-məsləki-xurşid əgər xahəd begərdanəd,
Çü narəncət bekəf gərdənde kuyi-niyyəri-ə’zəm.
Məhi-bürci-səadət zovceəş Zəhravü Mə’sumə,
Pedəri-təbiri-şübeyr Nəbi ra bude ibn əmm.
Həmişe əmro nəhyi-hökm qoranəst u amil,
Həme vəqti-xitabəş ba moxatib bude u mənzəm.
Sipər şod babi-xeybər vəqti-cəngəş gahi-bərnayi,
Gəhi-tefliş dər məhd u dəridəş-peykəri-əğəm.
Gəhi bəzl u bəsail dər roku’ əndaxtəş xatəm.
Besəyü ehtimaməş bonyeyi-islam əzu qaim
Bezərbi-zolfiqarəş səddi-iman şod əzu mohkəm.

Bedərdi-dərdiməndani-kodurət xatirəş timar
Bezəxmi-mostəməndani-həvadis dəsti-u mərhəm,
Zaman içrə anın tək çıxməmiş bir dür bu dəryadən,
Sədəf bətnində bir lö'lö anın tək görməmişdir yəmm.
Əgər rəsmi sualə masuyallah birtərəf dutsa,
O babi-elmü hikmət masu Allahdən degil mülzəm.
Veribdür atəşi-büğzi-cəhimə qayəti-tüğyan,
Qılıbdur nikhəti-hübbi behişti tazəvü xürrəm,
Tiküb gəz yerə durmuş dəvridə bir qul olub gərdun,
Kəminə çakəridür əsrdə Əfrasiyabü Cəm.
Anın miladinə ta çeşmi-əğyar olmasın nazir,
Olupdur Kə'bə hayil, çulqayub ə'laminə pərçəm,
Görüpdür hicrəti hicranini guya əza dutmuş.
Fəraqindin qılar hər sal tazə kisvəti-matəm.
Olub andin cüda miz-ab rəhmət yaş dögər gözdin,
Sirişki-həsrətidin pür dəmadəm dideyi-zəmzəm,
Olupdur izzətə layiq, olupdur cümlədin sabiq,
Olupdur elmilə fayiq, olupdur qədr ilə ə'zəm.
Əsasi şər'ədür təmkin, dəqayiq binü din ayin,
Əcayib məzhərü sirri-həqayiqdəndür ol mülhəm.
Xitabi-elminə olmuş hədisi-lov kəşəf tüğra,
Dili-bidarinə keyfiyyəti-əşya degil mübhəm.
Məsihin haşaəllah kəşti-ümmidi ola pejman.
Neçün kim rövzeyi-amalinə andan yetər şəbnəm.
Sala ta mərkəzi-qəbrayə çətri-asiman sayə,
Verə tavus gərdun ta ki, dəhrə beyzeyi-qaqum
Mühübbü çakərin xoşhalü daim düşmənin dutqun,
Yüz ilə damənin peyvəstə gərdi-vəhmü xari-qəm.

## BU, TƏHRİRİ-MƏTALİBDƏ TƏLƏBDÜR XAMƏDİN YARİ

Ey yunisi-bətni-huti-zindan,
Vey xızri-təriqi-abi-heyvan.
Ey harisi-gəncdani-əsrar,
Vey tişei-nöh' filizzi-əfkar.

Ey zadeyi-mülki Bəhrü Babil,
Vey taciri-müşki-Çinü Kabil.
Ey cümleyi-şey'idin mükəmməl,
Şanında nişani-xəlq əvvəl.
Ey qaliyə zirü deyyi-kəhriz,
Qoy tişrə qədəm olub səbük xiz.
Dəmdür açub, ey hümay sayə
Ver anın ilə cəhanə vayə.
Sən Yusifə bəs bu sənci-hirman,
Sal məhdi-ayağ dut ol xüraman.
Pa qoyməsə idin ər miyanə,
Bab açmasan ər o gəncdanə,
Dür qalmaz idi nişan sədəfdin,
Ayrılməz idi göhər xəzəfdin.
Çox cövhərə az olub xiridar,
Az kimsə olurdu danişə yar.
Bu şüğldə mən ki, dutmuşəm rah,
Vacib olasan mənimlə həmrah.
Sən get yolu, mən kəsim mənazil,
Mən toxm düzüm, sən ol əvamil.
Bu məşğələdə ki, ziri-barəm,
İmdaduna çox ümidvarəm,
Salma mənə dideyi-həqarət,
Bilmə məni sahibi-xəsarət.
Gər zahiri pirü guşəgirəm,
Qəm içrə bəlalərə əsirəm.
Liykən var əlimdə badeyi-zövq,
Başımdə həvayi-sağəri-şövq.
Sövda mənə verdi istitaət,
Düzdü qəmi-eşqdən bizaət.
Ol cinsdən eylə qıldı ərbab,
Açdım qəmuyə o gəncdin bab.
Hər kim mənə eylədi nəzarə,
Məndin ona düşdü bir şərarə.
Faş etdi məni sədayi-sazım,
Dağıldı cəhanə gizlü razım.
Dud atəşə aləti-xəbərdür,
Xurşidə şüai rahbərdür.

Rəncurə ki, dərd qılsa tüğyan,
Müşkül olur ona mən'i-əfğan.
Çün sineyi-ney dolar həvadən,
Təskin ona yetişür sədadən.
Ahi-dili-dərdməndü miskin,
Həqqa ki, verür o dərdə təskin.
Çün qoymadı şövq məndə taqət,
Kəsdi məni xəstədin fərağət.
Səbr etdi səfər qılub vidai,
Tərk eylədi mənzili-nizai.
Saldı məni vadiyi-fəraqə,
Ol ərsədə suzi-iştiyaqə.
Nə daməni-yarə dəstrəs var,
Nə razi-dərunə həmnəfəs var.
Yandurdu könülnü dərdi-pünhan,
Gördüyü tənimni nari-hirman.
Vacib mənə oldu çarü naçar,
Təqrib ilə dərdim etmək izhar.
Gər düzməz olam səda o sazə,
Gər durmaz olam rəhi-niyazə,
Eylər bəni ol hərif pamal
Məğlub olur anda surəti-hal
Düzmək özə eybdür fəsanə,
Çəkmək özünü kişi miyanə.
Yekdür ki, dutam rəhi-gürizi,
Alam ələ şüğli-nəqli-bizi.
Vərqa sözidin qılam rəvayət,
Gülşa üzünə düzəm hekayət.
Məşğul ola ta dili-fikarım.
Həm qala cəhanda yadgarım.
Təskin ola dərd o köftgudin,
Qafil ola azim arzudin.
Gər pərdə çəkildi ruyi-karə,
Bu fərddə qeyr olub şümarə.
Liykən oxuyan bu nəqşi-fərdi,
Anlar ki, nədür bəyani-dərdi.
Məlum edər əhli-dərd kimdür,
Bu dərd içində mərd kimdür.

Kim növ qıldı bu köhnə daği,
Kim tazələdi bu əski baği.
Zahir ola rənci pasibanın,
Hər gülbünə sə'yi bağbanın.
Gər olmasa rənceyi-kədivər,
De qanda bulurdu bağ zivər?!
Pəjmürdə görüb o bağrü raği,
Qeyrət mənə rəf'edüb fəraği,
Tə'mirinə iztirab qıldum,
Ol atəşə dil kəbab qıldum.
Lafım məni qıldı aləmə faş,
Yoqdur mənə bir rəfiqi-qəmtaş.
Sən dut əlim, ey əsayi-Musa,
Qoymə yıqə şüğli-fikrü sövda.
Səndin əgər olmaz isə yari,
Mən aciz olur ədu fikari.
Çox xəsm, məni-fəqiri-biyar,
Qıl başın içün sədaqət izhar.
Olgil bu səfərdə rəxşi-rahim,
Dur eylə bülənd pay gahim.
Yetür məni barigahi-şahə,
İltür gəl o şahi-din pənahə.
Güldür qəmu binəva nəvasi,
Lazım qəmuyə anın duasi.

## BUDUR TƏ'RİFİ-ŞAHİ-DİNPƏNAH OL ŞAH ABBASIN

Ol padşəhi-bülənd payə,
Məh peykərü aftab sayə.
Ol müzhəri-həqq, mürəvvici-din,
Ovrəngnişini-mülki-təmkin.
Ol sayeyi-rəhməti-ilahi,
Dünyayə çü saldı zilli-şahi.
Fərq etdi əfazilü əcahil,
Göstərdi təriqi-həqqü batil.

Lütfü qəzəbi nizami-dövran,
Gərdişdə misali-bərqü baran.
Cudində güm oldu, nami-Hatəm,
Bəzlində itürdi hasilin yəm.
Feyzinə verəndə payi-mərdi,
Xurşidə yetişdi ruyi-zərdi.
Tiğində bərati-xətti-cövhər,
Təhsili-nüqudi-ömri-kafər.
Gər aça birinə dəsti-ehsan,
Ədna deheşi zəxireyi-kan.
Bəzlinə fələk götürdi heyrət,
Göstərdi cahanə daği-həsrət.
Rəzm əhlinə seyfi sayeyi-nəsr,
İqbali məsafə ayeyi-nəsr.
Gər çəksə o tiği abdari,
Mərrixü Zühəl olur həsari.
Tərkibi xəyalə dəf'i-sevda.
Şəmşiri sədi-süğuri-ə'da.
Ədli ələmi açanda pərçəm,
Kur oldu çəradə yari-zeyğəm.
Ta xatirə yetdi fəthi-iqlim,
İqbal kilidin etdi təslim.
Tabe' fələki-pələngizadə,
Boynində hilal anın qiladə.
Fərzəndi-şəfi'i-ruzi-məhşər,
Sərxeyli-ənami-həft kişvər.
Gər maliki-mülkdür nəsəbdin,
Şahi-dü cəhandür ol həsəbdin.
Müstəzhəri-din, pənahi-iman,
Müstəlzimi-əmrü nəhyü irfan.
Əhli-xirədin əyari-kari,
Ayini-əimmə karü bari.
Adabi-şücaət içrə came',
Əsbabi-səxavət üzrə şaye.
Səkkiz xüldün kiliddari,
On dört mə'sum yadigari.
Sahibtəmkini-təxti-sabe,

Kişti-əməli-zəmanə raye’
Kim oxusa rəsmü ədlü dadın,
Bilmək diləsə mübarək adın,
Sabe’ ləfzi qıla dəlili,
Me’raci-vüqufə Cəbrəili,
Bu tə’miyeyi-kəlami-məzkur,
Var zəmnidə bir lətifə mənzur.
Nəssabə duranda intibahə,
Nisbət verə anları bu şahə.

## BU QƏSİDƏ DƏXİ OL SAHİBQİRAN ŞƏ’NİNDƏDÜR

Şahənşahi-bülənd əxtər, səriri-mülkətə sərvər,
Xudayi yarü tovfiqi qərinü dövləti çakər.
Sekəndər qədrü Kəsri ədlü Dara ceyşü Xaqan eyş,
Qəmu tədbiri sayib rayinə təqdir anın yavər.
Qulami rayi-hindiü qurçisi Əfrasiyabü Cəm,
Kəminə xani Keyxosrov, kəhin səncaqidür Səncər,
Vücudi-bimisali sayeyi-həqdür cəhan üzrə,
Anın feyzivü cudindən günəşdür zərreyi-kəmtər,
Ədusi filməsəl gər yer tutarsa sidrədin sayə.
Təni-napakinə hər bərgi-tubidür anın xəncər.
Əliqi-xeyli-tovfirinə hər şəb rayizi-dövran,
Səməndi-arzuyi-düşməni qılmuşdurur qəntər.
Fələk qəndili-eyvani-cəlalindən nişan dəhrə,
Ol eyvanə mədari-çərx olubdur hey’əti məcmər.
Əsasi-bargahin görməgə çün dideyi-gərdun,
Müluki-dövri-aləm çeşmi-həsrət eyləmiş mənzər.
Nüfusi-qüdsədür məhrəm, rümuzi-rə’yidə mülhəm,
Özü arayişi-məscid, duasi zinəti-mənbər
Sərasimə gəzər dün gün məəttəl amili-aləm.
Dəbiri-xatiri-paki əgər fəth itməsə[1] dəftər.
Günəşdin sabiq olmuş nüsrətə tə’cil ilqari,
Düşər qərbə zəlazil şərqdə gər cəm’ edər ləşkər.

---

[1] Etməsə

Həvayi-rövzeyi-xüldi-fərəhabadinə düşsə,
Nəsimi-ruhbəxşi-qüds olur ol nəfxeyi-sərsər.
Olupdur ol qüsuri-biqüsuri ayeyi-firdövs,
Əsa əldə hərimi-xasinə dərban durur qeysər.
Açub xani-ədalət nüzl çəkmiş ameyi-xəlqə,
Ona mehmansərayi-feyz olupdur xaneyi-şeşdər.
Həsudi-cahinə olmuş cəhan biyğuleyi-matəm,
Əgər qərbali-çərx ol şəxsə daim gərdi-xakəstər,
Hüsami-sövlətidin xali etmiş rəzmidin pəhlu,
Nola çəksə başa dövran doquzla çərxidin miğfər.
Gəhi-cəngü xüsumət töhfə əldə şahidi-iqbal,
Nişani-fəth vermiş şahə tacü düşmənə mə’cər.
Ərusi-dövrdin hər eyşdə kəsb eylədi min kam,
Aradə ta oxundu siğeyi-əqdi-zəna-şovhər.
Çıxarub zicdin yazmış durur müstəxrici-tale’.
Qəvi iqbalını şahın, ədunin dövlətin lağər.
Qılıpdur padşahın bu Məsihi can ilə dildən
Sənai-şövkətin virdü duayi-dövlətin əzbər,
Bu də’vi ribdən ari durur, billah riyadəndur
Bu söz sidqinə şahın xatiri-agahidür rəhbər.

## BU SAQİDİN TƏLƏB QILMAQ DURUR KEYFİYYƏTİ-BAQİ

Saqi, dur açub dəri-səvabi,
Sal gərdişə sağəri-şərabi.
Ey mətləyi-aftab badə.
Ey mənbeyi-rahi-ruhzadə.
Gözlə məni zarü dərdməndəm,
Zənciri-xümarə paybəndəm.
Peymanə mənə yetür ləbindin,
Vergil məzə sibi-ğəbğəbindin.
Nazın bəni qıldı ziniyazın,
Ey mən olayım fədayi-nazın.
Xalın dilü didə paybəndi,
Zülfün ucu boynumun kəməndi.

Can taəti, gecələr xəyalın,
Göz qibləsi gündüzü cəmalın
Yox qeyrə mənim çü ruyi-rahım,
Bu dövrdə sən mənim pənahım.
Gərçi sənə çox mənim kimi yar,
Yoqdur mənə səndin özgə qəmxar.
Gəl gör ki, nədür qəmində halım,
Bihudə degil bu qilü qalım.
Qıldı məni bəs füsürdə xatir,
Ümmidi-dirazü dəsti-qasir.
Sövda mənə eylə oldu dəmsaz,
De huş qanı ki, söyləyim raz!
Lütfün mənə salsa çeşmi-iqbal,
Tanuq ola anda surəti-hal.
Söylər bu bəla giriftari,
Mey dəf’ qılar qəmi-xümari.
Vacib bənə oldu dəf’i-sayil,
Ta necə ola həya həmayil.
Dur camə burax o lə’li-nabi,
Gündüz günü, gecə mahtabi.
Sun bəs bir-iki piyalə ləbriz,
Məxmuri-xümari qıl səhərxiz.
Ta nəş’əyi-mey aça zəbanım,
Rahın ola qüvvəti-rəvanım.
Rəf’ edə ol ab didədən xab,
Açəm sənə vəsfi-haldən bab.
Keyfiyyəti-qərqəfi-cəvani,
Cəmiyyəti-eyşi-zindəgani,
Çıxdı qəmu baş ilə əlimdən,
Yox mayə əlimdə hasilimdən.
Yıxdı məni bu xümari-piri,
Lə’l əşk ilə guneyi-zəriri.
Oldu o üqabi-bərqaşub,
Axırda kəbutəri-ləgədkub.
Ol şir salurdi gurə pəncə,
Hala birədin çəkər şikəncə.
Qıl tazə rüsumi-iltifati,
Göstər mənə mənbeyi-həyati.

Bu nəf'imə zahir edə isbat,
Ta fe'lə gələ təlafi-mafat.
Yandur o şərarədin çirağim,
Doldur gil o nurdin ayağim.
Rəf' eyləyə zülməti-vücudi,
Rövşən qıla xaneyi-şühudi.
Ver mayeyi-bixudivü məsti,
Atəş zənn-rəxti-tənpərəsti.
Qılsan məni məndin eylə məhcur,
Ta anlamayım qiyaməti sur.
Düz zinəti-bəzmi-köftgumi,
Doldur o şərabdən səbumi.
Gər qətrəsi düşsə kuhi-Turə,
Şurin yetürə dəmi-nüşurə.
Bun cür'əsi gər tökülsə xakə,
Həmduş edə xaki nuri-pakə.
Sun rah ələ aluban sürahi,
Ver qüsseyi-dövrdin fəlahi.
Ol rah ki, rəşhi düşsə xarə,
Bin gül verə şahidi-bəharə.
Ver gəl mənə mayeyi-cəvani,
Yəni ki, şərabi-ərğəvani.
Xarü xəsi-xüşkə salsın atəş,
Versin bədəlinə səbzeyi-xoş.
Yox əldə çü nəqdi-büdpərəsti,
Aciz məni qıldı təngdəsti.
Bu kişdə gərçi naqəbuləm,
Gər olsa qəbul həm məluləm.
Ver mənzil o xeymeyi-hübayi,
Qılgil məni sahibi-qəbayi.
Gər kəssə təfəqqüdən məvane,
Sanma ola sə'yi məndə zaye.
Haşa ki, xori-meyi-muğani,
Rəf' etmiyə zülməti-cəhani.
Lazım o meyi-süheyl tə'sir,
Göstərməgi kani-lə'lə təşvir.
Əlbəttə, o kimiyayi-irfan,
Bu qəlb misi zər eylər asan.

Sən lütfilə çək məni miyanə,
Mən zib verim rüxi-bəyanə.
Sən ver ələ rahi-bəhri-sağər,
Məndin dilə gəl xüruci-gövhər.
Qılgil məni qərqi-xümmi-Ceyhun,
Andin tələb eylə dürri-məzmun.
Versin bənə gər hilal badə,
Xurşidə kəmənd edəm qiladə.
Gər lafıma yoxdur e'timadın,
Qıl təcrübə bağla e'tiqadın.
Ver bir neçə sağəri-peyapey,
Rəf' eylə xümari-hiddəti dey.
Ta gül verə nikhəti-bəharım,
Sərsəbz ola toxmi-kişti-zarım.
Çün gül sala bağə çətri-sayə,
Mən bülbüli-can duram nəvayə,
Ahəngi-fəğani-əndəlibəm,
Üslubi-təriqeyi-ədibəm
Zahir qıla sidqimü xilafım,
İsbat edə iddiayi-lafım.
Bir növ' qılam fəsanə ağaz,
Harut ani görsə gizləyə raz.
Marut anın ər oxuya babın,
Suya sala dəftərü kitabın,
Sanma mənə meydən, ey düri-pak,
Məqsud ola əqdi-düxtəri-tak.
Ya xuni-dili-sürahi dəvən,
Ol saliki rahə düzdü rəhzən.
Qəflət ola xatiri-xəyali,
Hicran verə canə ittisali.
Saqi, nə o mahruyi-tənnaz,
Əxlat ola ona mayeyi-naz,
Dünya xələli və din füturi,
Aqillərə bəllüdür qüsuri.
Kim dil verə eyşi-müstəarə,
Mərbut ola bu iki nigarə,
Çün döndərədür o rahi-dövlət,
Qalə yerinə xümari-həsrət.

Rövşən ola xəlqə karü bari,
Ol mayeyi-eyşin e'tibari.
Saqi, bənə feyzdür hüveyda,
Məstiyi-mey, istilayi-sevda.
Ol feyz günə olanda məhrəm,
Aləm ola zərrə-zərrə aləm.
Sevda ki, əgər dutə dəmaği,
Rövşən qıla bu sönən çirağı.
Açub verə canə babi-ümmid,
Eyşi-əbədü həyati-cavid.
Sevda nə ki, sudi-mayeyi-can,
Arayişi-ruyi-bəzmi-irfan.

## BU, XUD VƏRQA İLƏ GÜLŞADƏN AĞAZİ-HEKAYƏTDÜR

Nəqqadi-nüqudi-gənci-əxbar,
Vəzzani-künuzi-rənci-asar.
Ustadi-müvərrixi-zəmanə,
Me'mari-müəssisi-fəsanə,
Gülzari-rəvayət abyari,
Əsrari-hekayət ixtiyari,
Açmış ruxi-bəzmə babi-işrət,
Vermiş güllü noqlə rəngü şöhrət.
Bin sə'y ilə zahir eyləyüb gənc,
Olmuş bu əda ilə göhərsənc.
Kim həyyi-ərəbdə bir cavanbəxt,
İqbal ani qıldı sahibi-təxt.
Ol sərvərin adı idi Haris,
Mülkə vali, sərirə varis.
Otuz min ev ol ilin[1] səvadi,
Mə'ruf Büneyni Şeybə adi.
Tikdükdə o cəm' içində rayət,
Qıldı qəmusi ona itaət.

[1] Elin

Ol bərrnəvərdü dəştpeyma,
Bir növ’ ilə qıldı zəbti-əhya.
Asudəlik oldu xəlqə baci,
Nəqdi-də’vat alan xəraci.
Dadından alub səbailər pənd,
Miş eylədi kürgə mu dəhənbənd.
Bəzlində yaşurdi hasilin kan,
Ədlində güm oldu zülmü ədvan.
Əndişeyi-xəsmə rə’yi dafe’
Tədbiri-ümurə fikri nafe’.
Cahi ona verməyüb təğəyyür,
Abasi təriqidən tənəffür.
Ol cümləyə gərçi oldu faiq,
Tərk eyləmədi təriqi-sabiq.
Əhşam ilə qət’ edərdi səhra,
Əksər ona bərri-Məkkə mə’va,
Gəh Tayifü gah sahili-Yəm,
Gahi hərəmi-hərimə məhrəm.
Salü məh ol aftabi-kamil
Yerdən-yerə dəgşirirdi mənzil.
Hər büq’ədə kim qılurdu təmkin,
Ol yerə düzərdi nafeyi-çin.
Afaqə nümuneyi-xəyami,
Vermiş şəbi-qədrdin pəyami.
Çadırləri yerdə aləti-zin,
Ağ üstə qəra çü qürrətül-eyn
Yurdunda xəyami-ənbərin fal,
Məhbub yüzündə xal timsal.
Simabi-sərab əksi-abi,
Qıldı ona çadırı hübabi.
Çadırlar içində aşkarə,
Şəh mahü həşəm ona sitarə.
Nəqqa’ çü şahidi-nəhari,
Fəyyaz çü əbri-novbəhari.
Həm qüvvəti-taleinə xürsənd,
Həm varisi-mülkdin bərumənd.
Ol taleyi yarü bəxti yavər,
Bulmuş sədəfindən iki gövhər.

İlki xələfə hümam olub ad,
Ad qoydu hilal o birə ustad.
Çün anları bəslədi zəmanə,
Hər birisin eylədi yeganə.
Daim olar ilə bəzmi-işrət,
Qaim olar ilə püşti-dövlət.
Gördü çü şəhi-xücəstə iqbal,
Təğyir ona oldu zə’fdin hal.
Tərkibdə nəş’eyi-qüsuri,
Gün-gün ona arturur füturi.
Öz hasilidin üzüb şümarə,
Xətt çəkdi hesabi-karü barə.
Oğlanlara ol niku şəmail,
Dapşurdi riyasəti-qəbail.
Dövran olara yetürdi növbət,
Ol xosrovə lazım oldu üzlət.
Axır buraxub libasi-rövnəq,
Dəryasına qətrə oldu mülhəq.
Qə’t eyləyüb arzuyi-peyvənd,
Peyvəndi götürdü azdən bənd.
Can mürği çü gözlədi məqamın,
Sındırdı qəfəs, buraxdı damın.
Qurtuldu o qeydi-çar sudən,
Dinləndi küdurəti-ədudən.
Xoş sahibi-bargahi-təmkin,
Həm dinə ola əlində, həm din.
Asudə qıla ani kəmali,
Rahət verə feyzi-layəzali.
Dirlikdə ola cahan şəfiqi,
Ölməkdə ola dua rəfiqi.
Nəsb eylədi çün sipəhri-minu,
Ol dür bədəlinə iki lö’lə.
Çün fərq adi ol iki güzidə,
Həmqədr olubən misali-didə.
Bu ona müti, o muna münqad,
Əhyayi-xərab olardin abad.
Amadə qəmu hüzuri-zahir,
Bağlandı qəmu qüsuri-zahir.

Liykən yox aradə meyvəyi-dil,
Rəf’ oldu hüzuri-şiveyi-dil.
Hazir qəmu nəqdi-ömri-məfqud,
Yox ərsədə cinsi-nəsl mövcud.
Yüz göstərə gər füturi-dövlət,
Yox varisi-dəstgahi-şövkət.
Novmid günü ola ümidi,
Əbvabi-səadətin kilidi.
Fərzənd ki, yaxşidür sifati,
Həqqa olur atənin həyati.
Oğul atadin qalur nişanə,
Oğulsuzun itürür zəmanə.
Ol iki hədiqeyi-rəyasət,
Rə’na güli-rövzeyi-kiyasət.
Çün görmədilər məali-məqsud,
Öz gülbinidin nəhali-məqsud.
Şur eylədi arzuyi-bülbül,
Görmək o nəhali-nəsldin gül.
Gülbün necə kim tikildi bağə,
Mərhəm necə kim qoyuldu dağə.
Nə bağdə gül camal buldu,
Nə zəxmi-dil əndi-mal buldu.
Dəryayə əgərçi düşdü baran,
Saçıldı zəminə toxmi-ehsan.
Bağlanmadı ol sədəfdə gövhər,
Bər vermədi aldı danədin bər.
Haris necə eylədi imarət,
Səbz olmadı daneyi-ziraət.
Ol sə’yidə çün güm oldu vayə,
Möhtac olundular duayə.
Hal əhlidin aldılar dualar.
Ümmid ilə qıldılar ətalar.
Açdılar üzə dəri-məbərrat,
Pəhn eylədilər büsati-xeyrat.
Axır, açulub dəri-icabət,
İbrami-dua yetürdi hacət.
Xətm eylədi arzu kitabın,
Hər mahvəşin bir aftabın.

Qıldı o hərəmsəradə kamil.
Təşrifi-süduri-nəslə qail.
Yer dutdu sədəf içində gövhər,
Fanusi-ümid olub münəvvər,
Ol nüqteyi-abə kilki-təqdir,
Qıldı rəqəmi-nişani-təsvir.
Düzdü əməli mürəbbiyi-kan
Bu mə'dənə dürr, o kanə mərcan.
Çün və'deyi-həml olundu axər.
Vəqt oldu çıxa şükufədən bər,
Doğdu biri hurü biri qılman,
Yə'ni biri qız, birisi oğlan,
Oğlan demə, ovci-qədr mahi,
Qız söyləmə, hüsn padşahi.
Oğlan demə, nuri-çeşmi-aləm,
Qız söyləmə, xəstə canə mərhəm
Oğlan demə, mayeyi-səbahət,
Qız söyləmə mülki-canə afət.
Oğlan demə ol məlik nişanə,
Qız söyləmə fitneyi-zəmanə.
Oğlan demə müştəriyi-iqbal,
Qız söyləmə Zöhreyi-nükufal.
Göstərdi oğul hümam nəxli,
Qız verdi rütəb hilal nəxli.
Şükraniyə hər birin atasi
Bitməkdin o yüzdə müddəasi.
Açdılar üzə zəxirə babın,
Bəzl eylədilər pozub hesabın.
Möhtaclərə verildi bəs gənc,
Vəzzanə yetişdi vəznədin rənc.
Əzbəs ki, xərabə oldu mə'mur,
Güm eylədi nəqdi-əql gəncur.
Sərf etdi ol iki incə ən'am,
Güm eylədi fəqrü məskənət nam.
Ol Zəhrəvü Müştəri nişanə,
Basduqda qədəm bu xakdanə,
Xatiləri safü üzləri pak,
Məhzi-xirədü təmam idrak.

Əvvəl günü duydilər məali,
Keyfiyyəti-hicr ilə vüsali.
Bildilər olu ədimi-tə’sir,
Təğyiri-qəzavü rə’yü tədbir.
Çün damə ola əsir mahi,
Nə sud ona iztirarü ahi?!
Verdilər olar riza qəzayə,
Xürsənd olub əmri-müqtəzayə.
Dil açdı qılub ol iki novzad,
Əfğan bədəlinə həmd bünyad.
Rəf eylədilər duyub hesabi,
Həm özidən, özgədən əzabi.
Salduqdə olar zəminə sayə,
Yerdən oları götürdü dayə.
Əldən-ələ çün güli-bəhari,
Gəzdürdilər eyləyüb nisari.
Aldı ələ dayə tiği-nüsrət,
Nə tiğ ki, cövhəri-məhəbbət.
Rəh bağladı üqdədin şikafə,
Ol iki rişəyə düzdü nafə.
Su yerinə dökdülər gülabi,
Yudular ol iki dürri-nabi.
Pəs çulğayub onları həririə,
Lütf ilə yetirdülər səririə.
Dil pərdəsi oldu, sinə bəndi,
Can tari o pərdənin kəməndi.
Çün gəncdin oldu xanə abad,
Vəqt oldu qoyulmaq anlara ad,
Ad oğlana qoydu atə Vərqa,
Gülşa qıza nam olundu ilqa.
Şərt eylədi ol iki bəradər,
Gər eyləsə ömr o lə’lü gövhər.
Həm bəxt ola ol iki mükərrəm,
Təzvic ilə bir-birinə məhrəm.
Əvvəl gün olar bulub məzadi,
Bir-birinin olundu namzadi.
Çün dövrdin oldular düsalə,
Ləb bağladi şirdin qəzalə.

Dayə olar ilə batdı gəncə,
Ta pənceyi-sal uruldu pəncə.
Əmma ol iki məhəbbət agah,
Bir-birilə idi gahü bigah.
Gün-gün ol ikiyə saqiyi-eşq,
Sunardı şərabi-baqiyi-eşq.
Şövq anlara eyləyüb ziyadə,
Zövq oldu müzaəf ol aradə.
Əksər o həsəb-nəsəb əmini,
Ol kişvəri-hüsn nazənini.
Gülşa evinə güzar edərdi,
Nəzzareyi-ruyi-yar edərdi.
Eylərdi təfərrüc ol səmənbu,
Bifikri-rəqibü tə’ni-bədgu.
Gəh qibləsinə durub namazə,
Gəh razidə ol rəhi-niyazə,
Bu həm ona mübtəlayi-ülfət,
Bağlu o həvadə payi-ülfət.
Gər görməsə ani eylər əfqan,
Bir və’z ilə san vida edər can.
Ta olmiyə ol şikəstə xatir,
Canani idi yanındə hazir.
Bu ona əsir, o muna məftun,
Bu ona həzin, o muna məhzun.
Gahi bu olub anın şikari,
Ol gah olub munun fikari,
Gəh rövzeyi-eşqə bu olur gül,
Gah ol biri bağı-şövqə bülbül.
Bu tərz olara keçərdi əhval,
Doqquz yaşa ta yetirdilər sal,
Pəs ol güli-bağı-cahü miknət,
Meyl eylədi oğlun edə sünnət.
Cəm’ etdi əazimü əali,
Yığdurdu əfaximü əhali.
Bir bəzm ki, etdi anda bünyad,
Nə bəzm fəzayi-işrətabad.
Əsbabi-ziyafətin rəğidi,
Pür qıldı məsafəti-bəridi.

Qıldı ola ta ki, zinəti-xan,
Cədyü həməlin büruci-büryan,
Mey etdi zəmini asiman fam,
Xur sağərü əncüm arədə cam.
Nahidi-fələk düzüb sürudi,
Qıldı özini o bəzmə udi.
Qoydu o sürurdin zəmanə,
Bin dağ nihadi-asimanə.
Bir həftə bu rəsmə eyləyüb sur,
Cəm-biqəmü əhli-bəzm məsrur.
Payanə çü yetdi şüğli-mərğub,
Təhsili-ülum olundu mətlub.
Bir bürc o mədarə oldu tə'yin,
Ta Müştərivü məh edə təmkin.
Ol iki nigar içün mürəttəb,
Bir eyşi-mücəddəd oldu məktəb.
Məktəb demə gəl ki, ol dəbistan,
Firdovs ona cəm'hürü qılman.
Cəbrili-əmin olub ədibi,
Ol iki pərirüxün rəqibi.
Ol şüğlə dutub təriqi-tə'zim,
Xur səfhəsin etdi lövhi-tə'lim.
Məh onlarə rəhl edüb hilalın,
Arturdu o rütbədə kəmalın.
Alub ələ xameyi-muradi,
Dərs onlara yazdı ustadi.
Bir gündə oxudular ədati,
Həm müfrədivü mürəkkəbati.
Az gündə ol iki cövhəri-pak,
Bu mə'dəni-əql, o kani-idrak,
Kəsb eylədi bu mələk, o huri,
Hər elmdən olduğu zəruri.
Əxlaqü mə'anivü qiraət,
Təfsirü hədisü fiqhü hey'ət,
İnşavü məsahətü stürlab,
Tarixü üsulü rəmlü ehsab.
Hər birisidin düzüb təbiət,
Nədür qərəz anladı həqiqət.

Gər zahiri ol iki yeganə,
Ol şüğl olarə olub bəhanə,
Məşğul o dərsü bəhsi-qalə,
Məhbusi-küdurəti-məqalə.
Liykən oları meyi-məhəbbət,
Sərməst qılub şərabi-ülfət.
Gün-gün olarə içürdi badə,
Keyfiyyəti-şövq olub ziyadə,
Dil bir-birinin qılub kəbabi,
Yüz bir-birinin edüb kitabi,
Guya ki, olan zəmanə məlhuz,
Hər bir-birə idi lövhi-məhfuz.
Həqqa ki, degil bu nüktə böhtan,
İsbatına vardur əldə bürhan.
Hər məs'əleyi-qəribü müşkil,
Aciz ola həllə xatiri-dil.
Bir-birə nəzər açanda rahi,
Mə'lum olur anlara gümahi.
Xoş mülk durur o mülki-mə'na
Bulmaz ona rahi-cəhl qət'a,
Daniş olara yetirdü çün neyl,
Adabi-cidalə qıldılar meyl,
Ta anlayalar bulub fərasət,
Qovğa günü zərbü rəddi-alət.
Rəzmində silahi-cəngə Vərqa,
Bir vəz' ilə oldu karfərma,
Bəhram görəndə atdı yayin
Təhsin ilə dutdu özgə ayin.
Çün ol iki seyidi-dəştyari,
Bir-birinin oldular şikari.
Ol bəhri-məhəbbət icrə Vərqa.
Qılduqda səfinə qərqi-sevda.
Su içrə susuzluğa giriftar,
Yar istər əlində daməni-yar.
Vəsl içrə həriqi-nari-hicran,
Gülzardə paybəndi zindan.
Rəncurə nə sud, əlində badə,
Gər içsə olur ziyan ziyadə.

Həm xanəsi kam o, eyşə nakam,
Hicranə əsirü vəslə bədnam.
Həqqa ki, bu aşiqə cəfadur,
Vəslət günü hicrəyin bəladur.
Gülşa dəxi anda kamə məhrum,
Ol bürcdə nəqdi-dürc məxtum.
Səbr əldənü getdi, didədən xab,
Ləb təşnə, əlində şərbəti-ab.
Nuş eyləməgə həzar mane’,
Xan hazirü xatir anda caye’.
Bu vəz’ilə ol iki qəmərtaş,
On ikiyə ta yetürdilər yaş.
Səbr eylədilər çəküb qəramət,
Ta yetmiyə anlara nədamət.
Yox arədə gərçi kami-xatir.
Səbr ilə güm oldu nami-xatir.
Zinətdehi-bəzmi-çərxi-əxzər,
Məşşateyi-çar cinsi-gövhər.
Dün-gün oların düzüb kamalın,
Arturdu məlahəti-camalın.

## VƏRQA SİFƏTİN BƏYAN EDƏR BU

Vərqayi-həmidətül-xəsayil,
Bir vəchilə hüsnə oldu kamil.
Gər qılsa ona fələk nəzarə,
Xur səhfəsin edə parə-parə.
Xiclətdəhi-hur olub camali,
Daği-dili-çərx olub xəyali.
Qaş ilə gözü açanda bazu,
Mizan olur andə gəc tərazu.
Gər qəmzəsi dursa ehtiyazə,
Bərcis ola Müştəri niyazə.

Mizan qaşi ta ki, düzdü məhmil,
Qıldı ani mehrü mah mənzil.
Pürpic o zülfi-gənci-malik,
Təqdisidə sübheyi-məlayik.
Çin kakili kambəxşi-Kabil,
Məftun zəqənində sehri-Babil.
Gül arizi daği-cani-lalə,
Zülfi xəmi ənbərin kəlalə.
Bini o cəmalə şəqqeyi-nur,
Ya lövhi-əqiqə xətti-kafur.
Ruxsaridə üqdi-xali-mişkin.
Səhrayi-xütəndə nafeyi-çin.
Ağzı ola gər bəyanə məhrəm,
Gül bərg ləbi, diş ona şəbnəm.
Cənnət yüzü nəqli abi-gövsər,
Ləb höqqeyi-lə'l içində gövhər.
Gər açsa yüzündən ol niqabi,
Doğdursa cəhanə aftabi.
Xur pərdə içində yaşurur ru,
Çərx eylər ona nisari-lö'lu'.
Gər gəlsə xüramə ol sənubər,
Gər sərvə durursa ol bərabər.
Naju itirür bəğəldə nazın,
Sərv ani görüb kəsər nəmazın.
Rə'na qədi touəmani-xubi,
Zibalıq ilə cəhani-xubi.
Gər nazı qədəm qoya miyanə,
Tufani-bəla düşər cəhanə,
Baş açub əgər dağıtsa kakül,
Aləm dola buyi-sünbülü gül.
Gər görsə cəmali-bakəmalın,
Eylər mələk arzu vüsalın.
Tövsifinə yoxdurur çü qayət,
Tə'rifidə gümdurur nəhayət.
Bəsdür bizə bu qədər güvahi,
Gəl döndərəlüm o yerə rahi.

## GÜLŞA HÜSNÜNDƏDÜR BU GÖFTAR

Ol şəms nəzirü mah mənzər,
Yə'ni Gülşayi-nazpərvər.
Bir vəz' ilə oldu hüsnə gəncur,
Kim buldu cəhan o gəncdin nur.
Bir qan tökücü cəhan bəlasi,
Üşşaqlərin günü qərasi,
Bir naz itabü qəmzə dastan,
Bərhəmzəni-kişi-bütpərəstan,
Bir can alıcı, könül xərabi.
Evlər yıxıcı, dil iztirabi.
Dilbərligə şivəsi mükəmməl,
Ünvani-girişməsi müsəccəl.
Şirin sözü xəndəsi şəkərriz,
Şəngül özü, işvəsi dilaviz.
Aləm-aləm həyavü azərm,
Dünya-dünya məlahətü şərm.
Rə'navü lətifü şuxü tənnaz,
Həmraz onadur təmam həm naz.
Gər açsa yüz ol niku şəmail,
Xurşid ola gördükində mail.
Güm eyləyə ol aradə namın,
Əldən buraxa öz intizamın.
Hər yan dögülən o zülfi-mişkin,
Dağılqan üzə o həlqeyi-çin.
Qılmış gülü sünbüli-brumənd,
Bəs can o kəməndədür glubənd.
Pişanisi qürreyi-səbahət,
Ol sübhə təlieyi-səadət.
Göz mərdümi hinduyi-nigəhban,
Əbrudur əlində tiği-bürran.
Kim qılsa xəyal anın vüsalın,
Qət' eyləyə rişteyi-xəyalın.
Yüz, pərçəmi-sübhədür müəvvəl,
Bini ələmi-səbahi-əvvəl.

Zülfini cəmali-cimü lami,
Mim ağzı, əlif burun bəyami.
Ağzı ola əqlə gər müməyyəz,
Dar daireyi-cəmalə mərkəz.
Daim səmər ilə nəxli-tazə,
Sibi-zənəxi dəlil o razə.
Zülfü durub atalı kəməndi,
Olmuş məhü mehr paybəndi.
Bu babdə gərçi raz çoxdur,
Söz qapusu xatirə açuqdur.
Liykən qılalum muna qənaət,
Ta rəf' ola şiveyi-şəfaət.

## BU, XUD BƏXŞİ-BƏLADUR AŞİQÜ MƏ'ŞUQƏ FİTRƏTDİN

Saqi, ələ algil aftabi,
Yə'ni ki, ziyaleyi-şərabi.
Qıl başın içün nəzər bu halə,
Sal gərdişə laleyi-piyalə.
Yetdükdə mənə ötürmə fürsət.
Olmaz qəmu vəqt vəqti-işrət.
Gözlə məni bikəsü həzinəm,
Bu dairədə əqəbnişinəm,
Danla nə bilür ki, kimsə gərdun,
Bu bəzmə verür şərab ya xun?
Çox kimsə bu gün vüsalədür yar,
Yarın qəmi-hicrədür giriftar.
Bu və'z ilədür nizami-dövran,
Bağlu şəbi-vəslə ruzi-hicran.
Tədbiri-ədib, şər'i-ənvər,
Hökm etdi müənnəsü müzəkkər.
Çün sayıla arədə şümarə,
Hər bir çəkə pərdə ruyi-karə.
Vərqa ola çün güli-bəhari,
Gülşa ola qönçəvəş hisari.

Bu lə'l sifət çirağı-birun,
Lö'lö' kimi ol sədəfdə məhzun.
Bu xur kimi cümlə ola taban,
Ol gizlənə misli-abi-heyvan.
Ta görmüyə hər kim ola cəmali,
Xatirlərə yetmiyə xəyali.
Məhbubə hücum am edər cəhd,
Ol cəm məgəs, bu zərfi-pürşəhd.
Ol vasifi-karü bari-ə'vam,
Bu cədvələ beylə çəkmiş ərqam.
Çün ol iki nəcmi-bürci-iqbal,
On dördə yetürdilər məhü sal.
Hər biri olub şəhiri-afaq.
Bu ikidə cüft, ol ikisi taq.
Hər necə ki, hüsn edərsə tüğyan,
Aşiq olur artuq anda nalan.
Çün hüsn olara yetürdi qovğa.
Getdükcə müzaəf oldu sövda,
Rəssami-rüsum edəndə abad,
Üşşaqə bu rəsm qoydu bünyad.
Kim hicrsiz olmuyə vüsali,
Ta anlaya qədri-ittisali.
Həqqa ki, bu rahü rəsmi-layiq,
Həm əqləvü nəqlədür müvafiq.
Ta çəkmiyə bir kişi bəlani,
Almaz gözə hasili-ətani.
Bimar bilür bulanda səhhət,
Səhhət onadur nə dənqlü ne'mət?
Düzdü gecə izzəti-nəhari,
Dey tazələdi rüxi-bahari.
Hər müktəsibin ki, az cəfasi,
Biqədr ola kəsbinin nəvasi.
Dövr eylədi çün nəzər o halə.
Rəşk etdi ol iki həmvüsalə.
Ayırməğə onları bəhanə,
İstərdi ətək çalub miyanə,
Əlqissə, qəzanəvisi-dövran,
Yazdı olara nişani-hirman.

Gərçi ol iki nəhali-ümmid,
Ol övci-səmayi-əqlə xurşid.
Pünhanü əgərçi aşkara,
Saxlarlar idi rəhi-müdara.
Bir idi olara qövlü girdar,
Ta kimsənə olmiyə xəbərdar.
Əmma əcəb ola fikrü tədbir?
Verə əsəri-qəzayə təğyir.
Hərçənd kişi düzə vəsilə,
Təğyir edəməz qəzani hiylə.
Gülşanın atasivü anasi,
Pünhan dutuban təriqi-pasi.
Oldilər olar o şüğlə casus,
Ta bulmiyə rəxnə hisni-namus.
Çün anladılar dutub şümarın,
Ol iki pərirüxün əyarın.
Gördülər ol iki mə’dəni-şərm,
Zahir-batində kani-azərm.
Eşq içrə ətəkləri nəmazi,
Bağludur üzə dəri-məcazi.
Buldu o xülasədin nicati,
Xalis oların nüqudi-zati,
Geydirdi o imtəhani-sami,
Vərqayə libasi-ehtirami.
Artdı çü o məhvəşin cəmali,
Ol ovcdə qayəti-kamali.
Hər kim özünə nigah edərdi,
Öz hasilini təbah edərdi.
Əmma o həsəb-nəsəb qüruri,
Ol dərdi-məhəbbətin səburi.
Heç kimsə ilə yox iltifati,
Qılmaz birini qəbul zati.
Xurşid sifət dutub kənari,
Həmsöhbət ona xəyali-yari.
Qılmaz birə dərdi-eşq izhar,
Yox kimsənə dərddin xəbərdar.
Gah-gah gəlüb görər nigarın,
Şad eyləyüb ol dili-figarın.

## İTABİDÜR BU, GÜLŞA ANƏSİNİN OL PƏRİRUYƏ

Gülşa anası batub xəyalə,
Salduqda nəzər o məhcəmalə,
Ol məhzi-ziyanü eyni-nöqsan,
Vərqanı çü gördü sahibi-şan.
Nisbət ona yox muna müdara,
Gəlməz gözümə məgər ki, Gülşa
Munun daxi çox ona niyazi,
Pünhan var aradə eşq razi.
Ol vəz'idin oldu rəncə xatir.
Bir gün duruban o əqli qasir,
Fikr eylədi hiyleyi-cüdalıq,
Şayəd kəsilə ol aşinalıq.
Bilməz qəmi-eşq düşsə canə,
Rəf' etməz ani dəxi fəsanə.
Gülşayə nəsihət etdi ağaz,
Key qəddinə cağlu mayeyi-naz.
Dil meyvəsi, canımın sifati,
Can nəqdivu cismimin həyati.
Dünyadə mənə nəvid sənsən.
Novmidligə ümid sənsən.
Ey sən mənə qədr ilə on oğlan,
Oğlum əgər olsa sənə qurban!
Can gülbünün güli-bəhari,
Gülzari-nişatım abyari,
Pir eylədi çün məni təcarib,
Ta anladım əsli-hər mətalib.
Vacib mənədür sənə verəm pənd,
Ol pənd qıla səni bərumənd.
Gər dutmaz isən sözüm xətadur,
Axırda mənə, sənə cəfadur.
Kim bəsləsə gülbün ol görər gül,
Gülbün gülə mayədür, nə bülbül.
Səndə bu niyazü nazü işvə,
Meyl etməgə canə oldu rişvə.

Səndin görünən bu zibü zinət,
Arayişi-ruyi-bəzmi-ülfət.
Sər gərmiyi-şuri-badeyi-zövq,
Zahir batin əlaməti-şövq,
Salmış məni vadiyi-gümanə,
Bin qəmlərə eyləmiş nişanə.
Qafilsən əgərçi sən özindən,
Mən vaqif özündənü sözündən.
Axır günü çəkməz oldu heyrət,
Kim saxladı  nəqdi-irzü qeyrət.
Kim zəbt edə bari-nəngü namus,
Yetməz ona dəsti-tə’nü əfsus.
Təxsis ki, biz büzürgüvaruz,
Mə’rufü şəhiri-ruzigaruz.
Bu silsiləyə degil müvafiq.
Mə’şuq ola adi, yoxsa aşiq?
Qorxum bu ki, karü bari-Vərqa,
Eyləyə bizi cəhanə rüsva.
Məğrur dimaq əlində badə,
Bu şüğlidə zövq ona ziyadə.
Gördükdə o şir sən qəzali,
Bulduqda o tö’meyi-vüsali,
İnsaf ver eyləsin neçük səbr,
Mümkünmüdür anda səbr ya cəbr?
Hər nurə durur dəmi-təcəlli,
Vəslin dəxi vardurur məhəlli.
Bil qədrini olmagil səbükbar,
Can nəqdini dildə saxlə zinhar.
Vərqa hərçənd əm pesərdür,
Təshifi anın qəmu bəşərdür.
Sən sadəvü fitnədür rəfiqin,
Qılgil həzər, ol degil şəfiqin.
Sən gülbüni-hüsnə bir ədu gül,
Gülzari-cəmalədür o bülbül.
Yox bülbül içün vəfadə yari,
Güldən-gülədür anın mədari.
Sən bəzmi-məlahət içrəsən şəm.

Pərvanədür ol miyaneyi-cəm.
Pərvanəyə xülqü xu cüdadür,
Hər şəm'i görər ona fədadür,
Sən işvədə qəndi-məclisara,
Ol tutiyi-şövqdür şəkərxa.
Tuti qaçan eyləmiş qənaət,
Bir qənd yolunda istitaət.
Qorxum bu durur o gül üzarın
Kim, anın ilə keçər mədarın.
Bu ülfəti-mən' ola aradə,
Çün rəf' ola mən o macəradə.
Səndin ola sir xatiri-yar,
Meyl eyləyə sehri-özgə gülzar.
Bizdən ona yox çü bimi-xatir,
Ta cür'əti səndin ola qasir.
Şayəd ki, o xosrov, ey səmənbər,
Şirin qoya dutə rahi-Şəkkər.
Zahir bu misal xasü amə,
Səyyad çü seydi çəkdi damə,
Bir özgə şikarə nəsb edər dam,
Budur ona şivə sübh ilə şam
Çün verməməkə səni o yarə,
Yoxdur bizə bir təriqi-çarə.
Zira atası ki, şahımızdır,
Hər müşkil ilə pənahımızdır.
Dutmuş o təriqi-ehtiyati,
Düzmüş kecilikdən irtibati.
Buzmaq munu qayəti-xətərdir,
Az qorxusu canə bimi-sərdir.
Liykən buna bir əlacımız var,
Vərqayə nə ehtiyacımız var?!
Ona dutalum rəhi-bəhanə,
Məsdud edəlüm təriqi-xanə.
Həm sən dutgil rəhi-fərari,
Tərk eyləgilən təriqi-yari.
Pünhan etgil müdam ruyi,
Göstərməgilən bu rəngü buyi.

Ənqa kimi Qaf olub məkanın,
Ləb açmıya bülbüli-bəyanın.
Nəğmə kimi pərdə çək xəyalə,
Qönçə kimi yüz bürü cəmalə.
Vermə bu çirağə yeldin afət,
Qıl abi-həyatə xanə zülmət.
Ey cani-cəhan saqın zərərdən,
Can gizlü gərək qəmu nəzərdən.
Qəd gizləvü qədr ilə əyan ol,
Qədr istər isən gözə nəhan ol.
Gül salduğidin həya niqabın,
Hər nakəsü kəs alur gülabın.
Ayinə əgər cəhannümadür,
Biqədrdür ol çü bihəyadür.
Lalə ki, görür yavuq-irağı,
Var həsrətidin könüldə dağı.
Su qıldı qəmu cəhani əhya,
Axduqidin oldu bisərü pa.
Ol neyyəri-xanigahi-aləm,
Öz cilvəsi etdi izzətin kəm.
Bir neçə zaman kəs andin ülfət,
Məzmuni-sözümnü bilmə külfət.
Ey canım oğul, bu fikrü tədbir,
Gər qılsa anın məhəbbətin sir,
Səndin kəsilüb bir özgə yarə,
Dil versə dutub rəhi-kənarə,
Mə’lumun ola həqiqəti-hal,
Dilxoş o zaman dut, ey niku fal.
Aşiq sənə çox ki, can verürlər,
Bir görməginə rəvan verürlər.
Qansısı olursa ixtiyarın,
Xatir diləsə ki, ola yarın,
Ta qılsən işarə ola həmsər,
Həmsər deməyim qülamü çakər.
Əmrində ola o zirdəstin,
Olmiyə qürurdin şikəstin.
Gər dutmasa ol rəhi-kənarə,

Açmasa nəzər bir özgə yarə,
Qə’t etməsə rişteyi-xəyalın,
Xahan ola ruzü şəb vüsalın.
Ol hicrdə dutsa şiveyi-səbr,
Çün dövridin içsə badeyi-cəbr,
Gün-gün ona arta iştiyaqın,
Canın yaqa atəşi-fəraqın.
Andin əgər ittisali-dövlət,
Yüz verə ona vüsali-dövlət.
Yadə sala cövri-intizari,
Anlaya o qədri-vəsli-yari.
Səndin dəxi qılmıyə cüdalıq,
Dutmuyə təriqi-bivəfalıq.
Gülşa ki, eşitdi ol məqali,
Bildi nədür anənin xiyali.

## BU, GÜLŞANIN DURUR ONA CAVABI

Ol məryəmi-xanigahi-hikmət,
Novbadeyi-baği-əqlü fikrət.
Saldı yüzünə həya niqabın,
Sövda sözüdin yumub kitabın,
Çün görmədi ani məhrəmi-raz
Ahəngi-müxalif etdi ağaz.
Şəmşiri-kəlamə ab verdi,
Anasına bəs cəvab verdi:
– Key mə’dəni-cövhəri-həyatım,
Vey məsdəri-siğeyi-sifatım.
Ey ayineyi-vücudim anə,
Vey sağəri-bəzmi-cudim anə,
Həqqa ki, sözün qəmu göhərdür,
Sər mənzili-xeyrə rahbərdür.
Amma məni sən çü am bilmə,
Zinhar ki, natəmam bilmə.
Səndin bu hədis bəs əcəbdür,
Bilmən bu kəlamə nə səbəbdür?!

Aya nə durur bu suzü dağın,
Dolmuş nə xəyal ilə dəmağın.
Gördün məni ya niçük səbükray,
Oldum kimə de məhəbbət əfzay?!
Gəl söylə mana ki, kim durur yar,
Qıldum kimə de təəşşüq izhar.
Vərqa ilə qılmaq aşinalıq,
Vermək o çırağə rövşənalıq.
Həqqa ki, degildi ixtiyari,
İncitməgilən bu dilfigari.
Ta sizdən olunmadı işarə,
Mən gəlmədim aradə şümarə.
Ol mə’dəni-nəngü mənbeyi-ar,
Əğyar sifət degil səbükbar.
Ta izn olunmasa ol ayə,
Qoymaz qədəm ol hərəmsərayə.
Zahir-batin o məh cəbini,
Gördüm qəmu qövlü fe’l əmini.
İnsan degil ol mələk şəmail,
On məncə durur həyayə kamil.
Ey aqilə sən, qıl imtəhani,
Ta rəf ola zənni-bədgümani.
Hala ki, səramədi-zəmandur.
Həm dövlətü ömr ilə cəvandur.
Vardur mana dəxi namünasib,
Olmaq o cəvanilə müsahib.
Minbə’d bizə bu iş xətadur,
Bədnamlığa nə müddəadur.
Mən munu bilürdüm abruliq,
Göstərməsəm ona nikxuliq,
Xəlq edə gümani-bəd qılub rəd,
Xulqimni yəman, məzacimi bəd.
Hala ki, bu şivə eyb imiş, eyb,
İmdən gerü görsən anlagil reyb,
Qoysam qədəm ər fəzayi-seyrə,
Açsam nəzər ər cəmali-qeyrə,
Qaşım tək ola qədim xəmidə,
Müjkan ola xari-çeşmi-didə.

Dil versəm əgər dəxi həvayə,
Ləb açsam əgər dəxi nəvayə,
Dil dərd odunun kəbabı olsun,
Ləb qəm sözünün kitabı olsun.
Gər qazələsəm rüxi-üzari,
Salsam ona zülfi-tabdari,
Kəm olmuyə yüzdən əşki-gülnar,
Hər zülf ola gərdənimdə bir mar.
Gər sürməyə çeşmim etsə ahəng,
Qaşım əgər olsa vəsmədin rəng,
Mil çub ola gözə mili-kuri,
Əbru ola tiği-can zəruri.
Dutsam əgər əl dəxi hənayə,
Xatir sala fərqü saçə sayə.
Hər barmaq ola əzabə bir mar,
Dəndaneyi-şanə ola münşar.
Əncüm əgər etsəm ayə halə,
Gər busə qılam ləbi-piyalə
Əşkim ola yüzdə dürri-nəbım,
Xuni-dil ağızdəki şərabım.
Gər gərdənə bağlasam gəlubənd,
Xüftanimə dügmə olsa peyvənd,
Zünnar ola gərdənimdəki tar.
Dügmə ola daği-sineyi-zar.
Gər silsilə nəsb edəm cəmalə,
Vər xal düzəm rüxi-xəyalə,
Ol gərdənimə ola səlasil.
Bəxtim üzünə o xal ola nil.
Bilmən nədür anə müddəani?!
Gördün bizə sən rəva cəfani.
Dünya görənin söz ibtidasi.
Bir özgə rəviş gərək ədasi.
Töhmətzədəliq bizə sitəmdür,
Bu nəqs sözün kəmali-qəmdür.
Bu rəsmilə ol büti-səmənbər,
Cəm eyləyüb od, dağıtdı əxgər.
Bir tərz cəvabə verdi təzyin,
Əql etdi ona həzar təhsin.

Durdu oradan pəs ol vəfadar,
Məhzi od olub çü şö'leyi-nar.
Lö'lö sifəti o dürri-ismət,
Dutdu o hərəmsəradə xəlvət.
Dəgşürdi libas, batdı yasə,
Dibayi-bədəl qılub pəlasə,
Gördü çü siyahruy bəxtin,
Çəkdi duruban səvadə rəxtin.
Məxsus özə tikdi ol yeganə,
Çün matəmi bir siyah xanə.
Azürdə olub o macəradən,
Yüz burdu cəm'i-aşinadən,
Qaşi kimi xəm qılub nəhalın,
Zülfi kimi bərhəm etdi halın.
Oldu dünü gün qəmilə məşhur,
Çün didəsi cismin etdi rəncur.
Yox məhrəm ona ki, deyə razın,
Yox qibləsi bağliyə nəmazın.
Hicran ona bəs ki, urdi şəbxun,
Qıldı o əqiqi gəhrüba gun,
Çün gördü anasi ol nigari,
Getdi yelə səbrü qərari.
Bildi ki, nədür məali-sevda,
Az qaldı ki, ola xəlqə rüsva.
Naçar dutub təriqi-çarə,
Dilculiq edib o gülüzarə.
Gahi qılır idi səbrə tə'kid,
Gahi verür idi vəslə ümmid.
El qızların ona qıldı məhrəm,
Ta kim olar ilə ola həmdəm.
Şayəd kəm ola o dərdü daği,
Hasil ola cəm'idin fəraği.
Ətrafın alub o nazəninlər,
Ol zər'i cəmalə xuşə cinlər,
Hər birisi bir təriq edüb saz.
Göstərməgə bir girişməvü naz,
Gəh tərk qılub libasi-zinət,

Zahir ola ta səfayi-tinət,
Gəh zinə qi-zülfi-xal edərlər,
Ərz ayinəyə cəmal edərlər.
Gəh dutuban əl-ayaq hənayə,
Salub gülü ərğivanə sayə,
Gəh qazələyüb ləbü üzari,
Gəh tazələyüb güli-bəhari,
Gəh pəncə düzərlər aftabə,
Bağlar başa bə'zi zər əsabə.
Gəh bazi içün o dilrübalər,
Bin saz edüb ol girehgüşalər,
Meyl etməz idi olara Gülşa,
Qılmazdı o mütləqa təmaşa.
Bəs olmadı getdi yar əlindən,
Həm bağrı dəlindi xar əlindən.
Yar olmasa əldə ruyi-gülzar,
Həqqa ki, rüxi-ümidədür xar.
Eylərdi zəman-zəman hekayət,
Bəxtindən edərdi ol şikayət.
Bir söz ilə düzdi dəstgahin,
Bağladı olarə mən'i-rahin
Bəl qansısının ki, var dərdi,
Oldu o qəzalə həmnəvərdi.
Gündüz qılar idi naləvü zar,
Çün gecə olurdu ol cigərxar.
Şəm'i görübən özinə həmdəm,
Ol sazə düzür təraneyi-ğəm.

## BU, GÜLŞAİ-HƏZİNİN ŞƏM'BİRLƏ MACƏRASIDÜR

Söylərdi ki, ey güli-həqiqət,
Vey hadiyi-Museyi-təriqət.
Ey məş'əleyi-təriqi-irfan,
Narın mənə nuri-ruyi-canan.
Ey gövhəri-şəb, çirağı-aləm,
Başında qəra ximari-matəm.

Bu səndə nə oddur, ey bəlakeş,
Oldu nəfəsin təmami-atəş?
Ey gecələr əncüməni firuzi,
Degil mənə əsli-dağü suzi.
Kimdəndür ola bu piçü tabın,
İşgənceyi-atəşi-əzabın.
Ey sufiyi-ərseyi-ğəramət,
Həqqa ki, bu səndədür kəramət.
Can qoyduğidin sifatın artır,
Başın kəsilür, həyatın artır,
Ey zülməti-leylə qürsi-məhtab
Müstəğrəqi-bəhri-atəşü ab.
Məndin dəxi olgilən xəbərdar,
Nisbət sana məndə qəm füzun var.
Sən bu oda gecələr giriftar,
Mən ömr ilə nari-eşqəyəm yar.
Sən atəşü şirədin müşəvvəş,
Mən saxlamışam könüldə atəş.
Bir od ki, çəkibdürür zəbanə,
Bin suz salupdurur cəhanə.
Andın saçulub gögə şərarə,
Göydürdü yeri qalub sitarə.
Hər nakəsü kəs sənin ənisin,
Məhrəm qəmu razuna cəlisin.
Mən cümlədin etmişəm kənarə,
Məhrəm nə rəva xəyali-yarə?!
Gördü o riyazi-qəm nəhali,
Kim şəm'i əritdi infəali.
Pərvanəni çəkdi ol miyanə,
Dərd oxuna eyləyüb nişanə.

## BU, CÜLŞA AÇDIĞIDÜR DƏRD İLƏ PƏRVANƏYƏ RAZ

Ver ona açub ləbi-iradət,
Key tayiri-laneyi-şəhadət.
Ey şövqə rəfiqü eşqə sadiq,
Ey zahirü batinin müvafiq.

Ey nuri vüsalə rah puyan,
Sərgəştəvü vəsli-yar cuyan.
Ta bal açasan rüxi-vüsalə,
Atəş düşə rəxti-infisalə.
Mümkün sanadur vüsali yarın,
Vəsl ilə keçər qəmu mədarın.
Sən gər bu rəvişdəsən yeganə,
Məndə dəxi dutmagil kəranə.
Bax gör nə bəlayəyəm giriftar
Yıxdı məni dərdi-firqəti-yar.
Sənsən gecə yar həmvisaqi,
Peyvəstə mənəm çəkən fəraqi.
Sən bəzmi-rüxi-nigarə rəqqas,
Mən sinci-fəraqi dinlədim xas
Sən ta görəsən cəmali-yari,
Can töhfəsin edəsən nisari.
Liykən bu mənə degil müyəssər,
Min bə'd mənü fəraqi-həmsər.
Sən vəsl fəzasidə xüraman,
Bəzmində çirağı-eyş xəndan.
Mən guşeyi-hicrə paybəndəm,
Xatir nigəranü dilnəjəndəm.
Dün sübhə dəkin qəm ilə ol yar,
Əncüm sifəti olurdi bidar,
Nə ruz ona eyşü istirahət,
Nə şam ona bəstəri-fərağət.
Qılmışdı əgərçi qamətin çəng,
Düzmüşdü əgər fəğanə ahəng.
Əldin o buraxmamış məali,
Ümmid ilə daməni-vüsali.
Hərçənd ki, qəm kəsər qərarın,
Qət etməz ümidi-vəsli-yarın.
Bu riştəyə bağlu e'tiqadi,
Bir gün açulur güli-muradi.
Əlbəttə, bular bu şami-firqət,
Bu sübhi-səadət ilə vəslət.
Gündüz-gecə batubən xəyalə,
Ümmid ilə talib ol vüsalə.

Gahi kona[1] zur edərdi hicran,
Bitab olub etdügündə əfqan.
Ta olmuyə kimsə andan agah,
Bu şe'ri oxurdu əksər ol mah.

QƏZƏL

Ah, kim dövrani-kəcrov halımı zar eylədi,
Dil pərişan, didə pürxun, sinə əfgar eylədi.
Tikdi keydi-bağban gül üzrə çətri-sayban.
Zülm əli, bidad cövrü bülbülə kar eylədi.
Aqibət ol dəstbürdi-tişeyi-cövri-fələk,
Bünyeyi-eyşim yıxıb iqbali ibdar eylədi.
Urdu zəxmi-dilxəraşi xatiri-naşadimə,
Nəqdi-vəsl əldən alıb, hicran ilə yar eylədi.
Eyləyüb məğlub əhvalımnı dövri-zali-dəhr,
Nəqsi-əhd ol nəqz rə'y iqrarə inkar eylədi.
Gecələr qəm heyrəti ol aftabın həsrəti,
Bəstəri-səncabü xəzimni gözə xar eylədi.
Gizlə razın, səbr qıl axır sənə dərman verir,
Ey Məsih, ol kim səni dərdə giriftar eylədi.

## BU, VƏRQA DUYDUĞUDUR NEYLƏMİŞ ƏĞYAR BİDADİ

Bafəndeyi-dəstgahi-əxbar,
Surətgəri-gargahi-asar.
Bu rəngilə nəqş ruyi-karə,
Vermiş qılub orduni şümarə.
Kim ol güli-növbəhari-xubi,
Başdan ayağa əyari-xubi.
Ol gövhəri-kani-mülki-şeşdər,
Yə'ni Vərqayi-vəslpərvər.

---
[1] Ki, ona

Hər vəqt ona şövq edərdi tüğyan,
Gülşa evinə olub xüraman
Təqribilə yarını görərdi
Qəm rəxnəsini durub urərdi.
Salub ələ saqivü şərabın
Tə'mir edər ol dili-xərabın.
Bir gün gəlüb ol təriqi-mə'hud,
Şayəd görə yarın ola xoşnud.
Gördü yüzə bağlu babi-ümmid,
Nə nuri-qəmər, nə zöv'i xurşid.
Şəm'i şəbi-vəsl qayib olmuş,
Xəsfi-qəmərü kəvakib olmuş.

## BU, VƏRQA QILDIĞIDUR ÇƏRXƏ TƏ'NƏ

Key çərx, nədür bu rəsmi-bidad,
Fəryad işinə həzar fəryad.
Netdim məni dilfikar qıldun,
Səddi-rəhi-vəsli-yar qıldun.
Çəkdün rüxi-vəsli-yarə pərdə,
Saldun məni səd həzar dərdə.
Qəsdində çu bu idi xəyalın,
Hicran verə aşiqə məalın.
Əvvəl nə idi şərabi-ülfət,
Ol saqiyi-eyş ilə məhəbbət.
Bir-birə bu iki narəvadür,
Bu aşiqə qayəti-cəfadür.
Vardur çü cibillətində nöqsan,
İşin qəmudur cəfayi-mehman.
Yol vardır əgər nə rahbərsən,
Dağın var əgərçi bixəbərsən.
Bin didə ilə olubsan ə'ma,
Gərdişdə rəhai bisərü pa.
Yoxdur sana çün həyavü azərm,
Tiksən nola yerə dideyi-şəpm.

Qıldı qocalıq qədin xəmidə,
Sən var həman o təngü didə.
Nə tərzi-xəlildür təriqin,
Şahid muna şəkli-məncəniqin.
Əldən gələni sən etdün izhar,
Məndən dəxi olgilən xəbərdar.
Hər yan qıluban təcəssüs ol yar,
Ta zahir ola rümuzi-əsrar.
Gördü kimə açdı rahi-mənzər,
Nisbət özünə anı giran sər.
Rəf' olmuş o şiveyi-səvabiq,
Yox söz əgər olsa namüvafiq.
Bildi əsəri-həsudi-bədbin,
Ol məzmə verüpdür özgə ayin.
Ta olmuya gövhəri səbükqədr,
Döndü səbük evə ol məhi-bədr.
Nə kimsiyə dərd qıldı izhar,
Nə kimsə o dərdidin xəbərdar.
Görməzdi münasib ol nikuray,
Öznü əbəs edə xəlqə rüsvay.
İş əql ilə dursa gər nizamə,
Axır yetəcəkdür intizamə.
Pünhan edüb atəşi-dərunin,
Əfsanəyə düzməyüb cününin.
Gəh dərdi-dil eyləyüb bəhanə,
Durar o vəsilədin fəğanə.
Bəs içməginə şərabi-həsrət,
Qılmazdı dəva qəbuli-şərbət.
Nəql eylədi əxtəri vəbalə,
Qəmdin qəməri dönüb hilalə.
Gahi ki, qılardı zur sövda,
Bin şikvə ilə düzərdi inşa.
Gizlü durar idi ruz əgər şəb,
Eylərdi fələkni ol müxatəb.
Eşq atəşi ilə gər olam sağ,
Uram yürəginə yengidin dağ.
Səkkiz sipərin dəlüb bilaşək,
Ahim oxu eyləsin müşəbbək.

Gər istər isən rüxi-səlamət,
Məndin sana yetməsin məlamət,
Döndər dövrün əvvəlki halə,
Çək nəqsini zirveyi-kəmalə.
Cananı ənisi-canım eylə,
Ol ruhi mənim rəvanım eylə.
Bu rəsmilə ol fəraqi-mərdi
Çərxilə dutub rəhi-nəbərdi.
Gördü baxuban o rəzmə kamil.
Səyyarəni nüqteyi-müqabil,
Bir-bir olara yetürdi mizrab,
Hər birini eylədi cigər tab.
Əvvəl qəmərə olub müqabil,
Ol dairəyə düzüb cəlacil.

## BU, VƏRQA MAHİLƏ RƏZM ETDİGİDÜR

Key mah nədür sənin xəyalın,
Gəh naqisü gəh olan kəmalın?
Nöqsanü kəmalə irdigündən,
Həm nami əmusənü əmuzən.
Guya olara qərabətin var,
Səndin dəxi külfət oldu izhar.
Üzdə sipərindür abginə.
Sana nə rəva təriqi-kinə?!
De ayinənin nədür səbati,
Bir ahilə rəf’ olur sifati.
Dur saxla bu gün əlində camın,
Rəf olmuya taki nəngü namın,
Ta görmüyəsən bu zərbi-dəsti,
Vermə özünə, bizə şikəsti.
Yoqdur sana çünki istitaət,
Bir özgə əlindədür iradət.
Yüz göstərə yetəsən kəmalə
Gər olmuya dönəsən xilalə,

Pəs məhzi-xətadür urduğun laf,
Ey saf zəmir, özün ver insaf.
Bilmə özüni qəni, gədasan,
Dəryuzeyi-fəqrə mübtəlasən.
Şahid onadur bu rəngi-kahi,
Ainən irsə eyləgil nigahi,
Çün yox idi qüvvəti-cidali,
Pəhlü ona mah qıldı xali.
Pəs açdı Ütaridə səri-kiş,
Aldı əlinə xədəngi-dilriş.

## BU, VƏRQANIN ÜTARİDLƏ TƏRİQİ-MACƏRASUDUR

Netdim sana ey dəbiri-aləm,
Vey səfhənəvisi-fərdi-adəm.
Mizan düzüb etmədün şümarə,
Qafil o hesabi-karü barə.
Təhvilə görədür al hesabın,
Gör fazilimi, kəs iztirabın.
Yox faidə yazmağında baqi,
Göndərmə mühəssili-fəraqi.
Ver dəftəri-bəxtimin səfasın,
İslah edə gör olan xətasın.
Təqvim açubən bax ittisalə,
Gör fərdi bərat yaz vüsalə.
Dutsan bu yüzə təriqi-ehmal,
Döndərməsən ər bu haldən hal.
Övraqi-dəfatirini asan,
Bir dəm durub eylərəm pərişan.
Yox səndə təriqeyi-mübazər,
Yıxmış səni fikri-həşvü bazər.
Təblin buraxub yaşur ələmni,
Sal oda dəvat ilə qələmni.
Ey gəcrəqəmi-hesabi-dəftər,
Vey rişvəsitani-həft kişvər.

Nadir əgər eyləsən rəqəm rəhm,
Səhvin səqəri ani qılur zəxm.
Səndin mana yetdi çün xüşunət,
İncinmə əgər qılam xüsumət.
Gördü çü Ütaridi hərasan,
Nahidə dedi o mərdi-meydan.

## BU, VƏRQA ZÖHRƏYƏ İÇİRDİGİDÜR CAMİ-ZƏHRALUD

Ey kamili-şiveyi-əğani,
Sazəndeyi-bəzmi-kamrani.
Aldun qopuzun, durub bərabər,
Tərğib edübən cidalə əsgər.
Noldu dutuban təriqi-salif,
Oldu mana gərdişin müxalif?!
Ey novhəsərayi-bəzmi-zari,
Zəxmin mana zəxmi-dilfigari,
Məndin sana yetdi de nə təqsir,
Ol surə nədür bu şurü təşvir?!
Sən qandənü lafi-cəngü mərdi?
Nisbət mana zuri-həmnəbərdi.
Ol qövsi-kəmançanın səhami,
Ol bərbətü təblü ney nizami.
Həqqa qəmu cəhlidür cəlafət,
Sazəndəyə dəviyi-şücaət.
Tənburəvü udü cəngü mizmar.
Qovğa günü udədür səzavar.
Ta sınmaya saxla əldə sazın,
Sındurma təharəti-nəmazın.
Dur bir dəxi cəngə urgilən çəng,
Əvvəlki məqamə düzgil ahəng.
Yoxsa verəm eylə guşimalın,
Bağrın dələ çəng görsə halın.

Yüzə dağudub kəmança saçin,
Göstərmiyə xəlqə şəkli-xaçin.
Yox Zöhrədə gördü rəzminə tab,
Az qaldı ki, Zöhrə eyləyə ab.
Andın çevirüb inani-himmət,
Xurşidə yetürdü rəxşi-hiddət.

## BU, VƏRQANIN KƏLİLƏK BABINI XURŞİDƏ AÇMAQDUR

Pəs dedi ona qılub nəzarə,
Key sərvəri-zümreyi-sitarə,
Ey Rüstəmi-rəzm, bəbri-xüftan,
Çün rəzmə olanda gərm cövlan,
Açsan kimə dideyi-sitizə,
Oldu nəzərin təmam nizə
Gər qılsa biri sana nəzarə,
Binalığidin dutər kənarə.
Ta çıxdun əyağ qoyub rikabə,
Ta rəxşini saldun iztirabə.
Yeddi iqlim olub müsəxxər,
Sikkə zərə urdu həft kişvər.
Nə faidə, ey çirağí-dövran,
Sübhün mana oldu şami-hirman.
Hər fərdə yetişdi feyzi-cudin,
İlla mana yetməz oldu sudin.
De qandasan, ey özünə məğrur,
Hər kamilədür zəvali-məşhur.
Bulduqda zəval irtifa'ın,
Sınduqda o nizeyi-şüaın,
Şəb çün batasan siyəh libasə
Məntək, bozula sına əsasə.
Ol dəm duyasan məali-dərdim,
Hali-təni-zarü ahi-sərdim.
İncə ona dökdü daneyi-raz
Tavus oldu şikari-şəhbaz.

## BU, VƏRQANIN DURUR RƏZMİNDƏ MƏRRİXƏ MÜLAQATİ

Döndü ləb açub o mərdi-meydan,
Bəhramə ki, ey şücai-dövran.
Ey gürdi-xüsuməti-məarik,
Sahib dili-məsləki-məhalik.
İqbal çü oldu həmnişəstin,
Xur qıldı özüni zirdəstin.
Hər qovmə olursə, talein yar,
Lazım düşə xəsmə zilli-idbar,
Eyb olmuya vergilən cəvabım,
Nisbət sana yetdigi əzabım
Kimsən durasan rəhi-cidalə,
Yol bağlıyasan rüxi-vüsalə.
Tənha mənü düşmən oldu vafir,
Min bə'd dutub xilafi-zahir.
Bu şivədə ol müinü yarəm,
Vergil ələ şəm'i-iqtidarəm.
Gər gözləməsən təriqi-yari,
Vər damə buraxmasan şikari,
Səndin dilü didə ola bizar,
Naçar qılam küdurət izhar.
Gər istəməsəm batəm vəbalə,
Səbrə səni eylərəm həvalə,
Gün doğdigidin yox ola şanın,
Adın qala, güm ola nişanın.
Çün görmədi anda çareyi-kar,
Bərcisə çevirdi ruyi-inkar.

## BU, VƏRQA MÜŞTƏRİDİN TALEİN FİRUZMƏND İSTƏR

Key Müştəriyi-mətai-təhsin,
Məşşateyi-ruyi-bəzmi-amin.
Salsan kimə dideyi-iradət,
Hasil qıla mayeyi-səadət.

Gər tale ola gərih mənzər,
Ainənə dursa ol bərabər,
Kəsb edə cəmali-ruyi-ümmid,
Qədr ilə ola ədili-xurşid,
Hala ki, gedib səfayi-surət,
Bəxtim yüzünü dutub küdurət.
Məhrumi-nəzareyi-nigarəm,
Məğlubi-fəraqü hicri-yarəm.
Düz bir dəxi ruyi-taleimni,
Rəf' eylə vüsalə maneimni.
Gər bitməsə dərgəhində kamım,
Gər dolmasa lütfün ilə camım,
Bir dəst ilə zud edəm əgər dir,
Alatü təbəqçini sərazir
Əsbabını dağıdam cəhanə,
Bin dağ qoyam sana nişanə.
Hicrin biləsən nədür rümuzi.
Əksilmiyə ömrün ola suzi,
Yetir özüni bizi məlul et,
Bu iki sözün birin qəbul et.
Gördü çü o mövridi-itabi,
Dutmaz dili ta verə cəvabi.
Keyvanə yetürdi iztirabın,
Açdı ona şikvəsi kitabın.

## BU, VƏRQA ŞİKVƏ BABIN AÇDIĞIDUR RUYİ-KEYVANƏ

Key rütbeyi-qədr ilə müəlla,
Vey hilyei-sədr ilə məhəlla.
Ey cövhəri-sabitatə fayiq,
Di, üzrdurur sənə nə layiq?!
Səndin bu əməl bəsi əcəbdür,
Aya ki, bu işə nə səbəbdür!
Gər qədr ilə ey büləndpayə.
Saldun yedinci çərxə sayə.

Leyk oldu nühusətin müzaəf,
Məzmuni-təkəllümün müzəxrəf.
Hər kim ki, sənə olundu mənzur,
Nakamlığına aldı mənşur.
Hər kimə ki, eylədün nəzarə,
İqbal ona eylədi kənarə.
Lütfün kimə sunsa badeyi-nab,
Ta sübhi-qiyamət ol qılar xab.
Çün var sənə bu nə'ti-məşhur,
Ni! Ni ki, sifati-qeyri-məşkur.
Noldu sənə bais, ey cigərsuz,
Evlər yıxasan durub şəbü ruz.
Doldu sitəminlə Qaf ta Qaf,
Dur dutgil üzə təriqi-insaf.
Rə'f eylə nühusəti-nəzərni,
Pak eylə xəbisdən ol göhərni.
Şayəd açıla güli-muradım,
Zahir ola üqdədin güşadım.
Gər dutmaz isən təriqi-yari,
Min bə'd sənü o ədli-bari.

## BU, VƏRQA YETDİGİDÜR SABİTATƏ

Ol farisi-rəzmi-dərdü hicran,
Çün ol yedidin ötürdi cövlan,
Gördükdə ötüb sabitati,
Tez çərxəcidin ötürdü ati.
Sövda olara yetürdi qovğa,
Bir cəm'ə yoluxdu bisərü pa.
Nə sər olara durur, nə sərdar,
Yox şüğli-mühümmü şiveyi-kar.
Başdan ayağa təmam didə,
Xatirələri cəm'ü arəmidə.
Yox heç kimdin olara külfət,
Cövhərləridür təmam ülfət.
Qoyduqda qədəm o sərzəminə,
Atdı buraxıb silahi-kinə.

Hər birini buldu dərdə bir gənc,
Pəs anlar ilə olub nəvasənc.
Key siz qamu suzü dərdə yekdil,
Hər birə səfayi-eşq hasil.
Bu dideyi-bazu çeşmi-giryan,
Bu daği-dili-fəraqi-canan.
Bidariyi-şəb bu rəngi-kahi,
Verməkdə durur qəmu güvahi
Kim, siz qəmi-eşqəsiz giriftar,
Mən kimi fəraqü hicrəsiz yar.
Ey mən sizə dərd ilə müvafiq,
Bəlkəm sizəyəm qəm içrə fayiq.
Mən guşeyi-qəmdə zarü nalan,
Siz şəm' sifət həmişə xəndan.
Qəmxanə edüb məni giriftar,
Fülki-fələk etdi sizni səyyar.
Bu tərz ilə ol qəm aşinasi,
Hər birün olub sifət şünasi,
Gördi necə dərd qıldı ə'lam.
Verməz ona bir cəvab-əcram.
Bildi ki, o qovmi-dil pərişan,
Hər biridür öz işində heyran.
Ol məsləkdə əsirü məcbur,
Öz mətləbidə həzinü məhcur,
Kimsə kola[1] özgənin əsiri,
Qeyrin necə ola dəstgiri!
Kim özü ola qəmə giriftar,
Özgə ğəminə əcəb qıla çar?!
İçdi qəmudin şərabi-heyrət,
Rə'f olmadı ol xümari-həsrət.
Bəl çəkdi zəbanə suzi anın,
Qəmdin siyəh oldu ruzi anın.
Yox gördü olarda ruyi-vayə.
Axır qəmudin götürdü sayə.
Dərd ilə təranə düzdi sazə,
Ərz etdi niyaz o biniyazə.

[1] *Kola* – ki, ola

## BU, XUD VƏRQAYİ-MƏHZUNUN MÜNACATIDURUR HƏQQƏ

Ey payə düzən bu çar taqə,
Vey dövr verən bu nöh rəvaqə.
Milad çü amədü nəvabit,
Səyyaratü degər səvabit.
Elmin rəqəmində cümlə mə'lum,
Hökmün qələmində cümlə məhkum.
Səndin qəmunun muradi hasil,
Zaresən, olar sənə əvamil.
Rəhm eylə mənə ki, natəvanəm,
Qıl bəstə şikəsteyi-zəmanəm.
Acizlərəsən müinü qəmxar,
Mən acizə gör nədür səzavar!
Səyyarəvü çərxü sabitati,
Gördüm qəmunun nədür sifati.
Qət' oldu çü cümlədən ümidim,
Heç birindən olmadı nəvidim.
Bildüm munu, ey həkimi-dana,
Cümlə yetürür sənə təvana.
Həqqa ki, bu fər'ə əsl sənsən,
Sazəndeyi-hicrü vəsl sənsən.
Düzdin rüxi-hüsnə sən cəmali,
Verdin ona qayəti-kəmali.
Həm eşqi sən eylədün cigərsuz.
Nə suz ki, şəm'i-aləməfruz.
Çəkdün məni bənd edüb bu damə,
Saldun qəmü möhnəti-müdamə,
Çün sən qıldun qəmə giriftar,
Həm sən qılgil ə'laci-bimar.
Yə'ni ki, ümidim eylə hasil,
Cananəyə canım eylə vasil.
Sənsən üç müəllifi-xəvatir,
Tədbirdəyəm ə'lacə qasir.
Sayən kimə düşsə möhtərəmdür,
Cövrün qəmu şəfqətü kərəmdür.

Mərhəm dili-zəxmə dərdi-qövrün
Ədl oldu həqiqət içrə cövrün.
Likən bizə yoxdur ol təhəmmül
Ta hikmətinə ola təvəkkül.
Versən əgər imtidadi-hicran,
Qıl qüvvəti-səbrimi firavan.
Vergil mənə istədükdə kamım,
Saxla bu həvadə nəngü namım.
Sungil mənə rahi-səbrdin cam,
Qılma məni xəlq içində bədnam.
Sən görmə rəva durub zəmanə,
Məndin düzə tillərə fəsanə.
Çün məndədür atənün ümidi,
Ümmiddin ona ver nəvidi.
Qılma ani naümid məndin.
Vergil əlinə kilid məndin.
Eylərdi bu tərz ilə münacat,
Qazisinə ərz edərdi hacat.
Gah eyləyübən hücum sövda,
Anın başına dutardı qovğa.
Ta saxlıya xəbtdin dimaği,
Ta dolmuya sərsər ilə baği.
Ol sahibi-namü nəngü təmkin,
Dərdin öz-özə qılardı təlqin.
Tənhalıq edüb özünə pişə,
Bu bir qəzəli oxur həmişə.

## QƏZƏL

Ah, kim firqət şərabi bağrımı qan eylədi,
Dil pərişan, sinə büryan, didə giryan eylədi.
Açmaz oldu qönçeyi-ümmidimi feyzi-səhər,
Gərçi min gül bağara hər sübh xəndan eylədi.
Bəxti varun, taleyi dun, rütbeyi-iqbali pəst,
Görmədi bir mən kimi ta çərx dövran eylədi.
Bavücud rəhmi yox, dün halımı gördü fələk,
Üzə dürrün dağudub, saçın pərişan eylədi.

Eylədi gözdin nihan, öznü o mahi-xərgəhi,
Eylə kim zülmətdə məva abi-heyvan eylədi.
Saldı hər saət ona min üqdeyi-şəkli-həyat,
Ey xoş ol kim hicr işin ölməklə asan eylədi.
Mən vüsal istər olub, hicran mənə ruzi-qəza,
Səddi-rahilə, Məsih, isbati-bürhan eylədi.

## BU, VƏRQA QILDIĞIDUR HƏM ÖZÜ-ÖZ DƏRDİNƏ ÇARƏ

Ol bülbüli-bağı-hicrü külfət,
Dil bəsteyi-şaxsari-ülfət,
Zahir dutuban təriqi-nazi,
Pünhan qılub atəşi-niyazi,
Yüz burdi o xaneyi-əmudin,
Döndərdi təriq o cüstü cudin.
Yar oldu ona xəyali-yari,
Keçər o xəyal ilə mədari.
Likən bilməzdi ol müşəvvəş,
Ol xərmənə kim buraxdı atəş.
Aya, bu nəticə yardandür?
Ya bülbülə cövr xardandür?!
Bir gün ona əql edub dəlili,
Sərmənzilə yetirüb zəlili,
Dedi pəs ona ki, narəvadür,
Məchul işə qəm yemək xətadür.
Dutgil yüzə rahi-imtəhani,
Təhqiqə yetürgilən gümani.
Gər yarda durur təriqi-sabiq,
Bu qəmdə durur sənə müvafiq.
Bil minnətü çəkgilən cəfasın,
Ta ömr ola hicrinin bəlasın.
Vər dutmuş ola rəhi-xilafi,
Qalmamış ola əvəlki lafi.
Necə yaxa canı nari-hirman,
Bu bağdə gül durur firavan.

Dil verməgi yari-bivəfayə,
Salmaqdür özü əbəs cəfayə.
Tə'limi-dəbiri-əql tə'sir,
Qıldı ona, saldı yenlə təşvir.
Fikr eylədi yazə yarə məktub,
Ta zahir ola xəyali-mətlub.
Aldı ələ xameyi-göhərsənc,
Ol tişə ilən əyan edüb gənc.
Ahuyi-xəta gəlüb xüramə,
Ol ərsədə müşk saçdı kamə.
Cananına ərz qıldı halın,
İzhar edübən qəmü məlalın.

## BU, VƏRQAYİ-HƏZİNİN NAMƏSİDİR CANİBİ-YARƏ

Ünvani-kəlamə düzdü rövnəq,
Yazdı ona nami-namiyi-həq.
Ol şahi-səriri-mülki-həsti,
Ol sahibi-cahi-bişdəsti,
Danəndeyi-nəqşi-ruyi-əsrar,
Xanəndeyi-xətti-lövhi-əfkar,
Andandür olan nizami-aləm,
Tərtibi-müzəlləlü mükərrəm.
Çün həmd ilə naməsin müsəddər
Qıldı acub anda dürci-gövhər.
Tiri-giləsin qoyub kəmanə,
Cananını eyləyüb nişanə.
Yazdı ona key mənim rəvanım,
Viraneyi-təndə gənci-canım,
Ey nameyi-bəxtimin səfasi,
Tən məhcəsi, didə rövşənasi.
Noldu səbəb eylədün cüdalıq,
Nə baisi-qət'i-aşinalıq?!
Əvvəl nə idi o gərmiyi-dil,
Axır nədurur bu fikri-batil

Düşdü çü təbibə ehtiyacım,
Gör başın üçün nədür əlacım?!
Mən bilməz idim fəraq dərdin
Hicr odidə ehtiraq dərdin
Yaxdı məni atəşi-fəraqın,
Yıxdı məni dərdi-iştiyaqın
Əyyami-vüsalın eyləyüb bad,
İşim dunü gün fəğanü fəryad.
Zülfün kimi tirə ruzigarəm,
Bərhəmzədə və'zi-karü barəm.
Ağzın sifəti daraldı xuyim,
Tə'n etdi zərirə rəngi-ruyim.
Yadi-rüxün ilə əşki-gülnar,
Cibü bəğəlimni qıldı gülzar.
Bilməz bu həzinü zarü məhcur,
Ol firqətinin qəmilə rəncur.
Səndin bu qəziyyə imtəhandur,
Ya məhz təvəhhümü gümandur.
Ya vəsvəseyi-həsudi-bədbin,
Bədxahlığından etdi təqlin.
Kim keçə bu tərz ilə mədarın,
Rəf' ola vəfadə e'tibarın.
Səndin əcəb, ey büti-yeganə,
Neyrəngi-fəsaneyi-zəmanə.
Ta kim yetə döndərə məzacın,
Ola bu nəsihət ehtiyacın.
Doldurma dəmağə bu xəyali,
Öz fikridə rişteyi-məhali.
Hərçənd olasan mənə giransər,
Pünhan edübən o nəxlidin bər.
De, səbrdin özgə nə ə'lacım?
Kimi bula dönsə gər məzacım.
Ol danəvü damü zülfü xalın,
Peyvəstə səlasili-xəyalın,
Qılmış məni şövq paybəndi
Etmiş təni hicri-dil nəjəndi.
Ta ömr olalı sənə əsirəm,
Olsam nola şəh sənə fəqirəm.

Səndin dutuban rəhi-kənari,
Dil bulsa əgər bir özgə yari,
Düşsün yoluma həzar müşkil,
Qəndili-məzarım olsun ol dil.
Açam nəzər ər cüdayə, ey yar,
Müjgan ola gözdə növgi-mismar.
Ey laleyi-növbahari-ülfət,
Vey qönçeyi-rövzeyi-məhəbbət,
Eyb olmaz əgər qılam səvali,
Ta vəsvəsədin yığam xəyali,
Noldu o məhəbbətində lafın,
Vəchi nədurur bu e’tigafın?!
Ol vəsl günü içəndə badə,
Verdin sənə eşqə min ziyadə.
Xalidür o söz bu gün əsərdən,
Ya yox xəbərim mənim xəbərdən.
Gər dutmamış ülfətin giranə,
Xani degilən ona nişanə?!
Zahirdə əgər məvanein var,
Dərdi-dilin eyləməkdən izhar.
Dur salma məni bu bəd gümanə,
Yaz namə gətürməgil bəhanə.
Düz meyvə o nəxli-e’timadə,
Ver hamili-səfheyi-vidadə.
Ta hirzim ola hücumi-qəmdə,
Tüğyani-məşəqqətü sitəmdə,
Gər oldu isə məhəbbətin sir,
Dəxi ona nə əlacü tədbir?!
Yegrək məni eyləmək xəbərdar,
Xeyrin ola necə olsun, ey yar.
Sən dut o təriqü mən bu rahi,
Hər biri-birə verə güvahi.
Zahir ola bu ikidə gövhər,
Bir rəsm ola hər birə müqərrər.
Mən şükr ki, möhkəməm vəfadə,
Hicranına qayiməm cəfadə.
Qoyman əldən təriqi-yari,
Badə vermən bu nəngü ari.

Bin suz ilə ol qəm aşinasi,
Yazdı nə ki, var müddəasi.
Çün mənzil kəsdi rəxşi-xamə,
Təhriri yetişdi ixtitamə.
Pəs dayəsini görüb nihani,
Əsrarinə məhrəm etdi ani.
Key anə, mənim gör iztirabım,
Guş eylə sözüm verüb cəvabım.
Yox məndə həmin fəraqi'-dildar
Səndin sənə dəxi çox giləm var.
Bir gəz dimədin nə hali-zarın,
Nə baisi-iftiraqi-yarın?!
Sən anmasan ər məni-figari,
Bəs kimdən ümum təriqi-yari?!
İstərsən əgər xəti-mə'afi,
Təqsirinə qılgilən təlafi.
Bu naməni al, apar o yerə,
Anın xəbərin gətür bu zarə,
Əmma sənə bir vəsiyyətim var,
Kimsə gərək olmasın xəbərdar.
Xoş ol ki, həyasi ola qalib,
Azərm ilə kəsb elə mətalib.
Əqli düzə payə dəstgahə,
Rə'yi tökə danə mürği-cahə.
Dayə eşidüb o macərani,
Bildi nədür əsli-müddəani.
Til açdı ki, ey gözüm çirağı,
Can mayəsi, gönlümün fərağı.
Qılmış qocalık məni pərişan,
Vermiş mənə tab duki-dövran,
Yox göz nuri görəm cəmalın,
Can nəqşi durur rüxi-xəyalın.
Qafil məni qıldı natəvanlıq,
Çəng etdi qədimni sərgiranlıq.
Rəglər bədənimdə sazi-tari,
Yetdi mənə guşmali-xari,
Gər yox xəbərim bu goftgudin,
Qafil olam ər bu rəngü budin.

İncinmə ki, səndin oldu təqsir,
Necə bilə rəmzi-qeyb mən pir.
Hala məni eylədün xəbərdar,
Duydum ki, nədir rümuzi-əsrar.
Əvvəl gedübən görüm nigarın,
Kim necə durur səninlə yarın.
Gər anda bulam nişani-ülfət,
Asandur o gün əlaci-külfət.
Atəş buraxam o infisalə,
Hicrani bədəl qılam vüsalə.
Vər görməsəm onda dərdü suzi,
Ol sabiqə lafdin rümuzi.
Var anda dəxi əlacə rahim,
Çoxdur bu rəvişdə dəstgahim.
Qıldun məni çünki sirrə məhrəm,
Dur çəkmə dəxi məşəqqətü qəm.
Tez hasil edəm nədür muradın,
Süst etmə bu qövlə e'tiqadın.
Pəs naməni aldı ol köhən sal,
Mürğinə anınla bağladı bal.
Uçduqda yetişdi bürci-yarə,
Kim anda idi o mahparə.
Xali görüb ol evi nəzərdin,
Qüfl açdı durub dəri-xəbərdin.
Tapşurdi əmanəti-nihani,
Şərh etdi sifarişi-zəbani.
Peyğaminə eylə düzdü ahəng,
Kim qıldı o sərvi-qamətin çəng.
Ta açubəni görə kitabi,
Min piç ona saldı iztirabi.
Ta sayə sala ona hümayi,
Öpüb başi üzrə qıldı cayi.
Pəs saçdı açub o nik mənzər,
Ol ənbəri-xüşgə gövhəri-tər.
Nəqdi-dil edüb anın nisarın,
Arturdi dəmadəm e'tibarın.
Gördü yazılan kəlami-pakin,
Oxudi hədisi-dərdnakin.

Duydu o hərifi-dərdi həmdəm,
Cananəsini vəfadə möhkəm,
Bildi nədür ol nükatə məzmun,
Hər şikvəsi bin vəfayə mərhun.
Yazmış gile gər o macərayə,
Vardur həqi çəkdügi cəfayə.
Likən bilməz ki, bu giriftar,
Nə dəklü bəlavü dərdədür yar.
Munda qəmi-hicrədür do çəndan.
Zindani-bəla içində heyran.
Zahir dəhrin bu macərasi,
Hər kimsəyə bəllü öz cəfasi.
Bildi yoqdur ötən cəfadən.
Cananəsinə xəbər bəladən.
Ərz etməkə vacib oldu halın,
Keyfiyyəti-durivü məlalın.
Aldı ələ zaği-bustani,
Saldı yola tutiyi-bəyani.
Az ləfzilə ol büti-vəfadar,
Çox dərdini yarə qıldı izhar.

## CƏVABİ-NAMƏDİR BU, CANİBİ-GÜLŞAİ-MƏHZUNDAN

Tuğrayi-səhifə nami-bari,
Canım ola adının nisari.
Ol düzdü şükufeyi-məhəbbət,
Bu baği-cəhanə badi-ülfət.
Hicran gecəsi vüsal ruzi,
Andin almış bu zövqü suzi.
Pəs ey dili-didə rövşənəsi,
Mən, sən degülüz qəza xüdasi.
Çün əldə degil inani-təqdir,
Dutmaq nə rəva təriqi-təkfir.
Gülşadə gər ixtiyar oleydi,
Öz rə’yi ilə mədar oleydi,

Haşa ki, qıleydi ol cüdalıq,
Səndin kəsə idi aşinalıq.
Bu firqətə mayeyi-səburi,
Oldu mənə qayəti-zəruri.
Gər istər isən nədür mədarım,
Bilmək diləsən vəfadə arım,
Öz halına öyləgil nəzarə,
Düzgil məni dəxi ol şümarə.
Bilmək diləsən gər, ey nikuru,
Kim kəsdi durub bu cuydən su,
Ya kim bu büsati-eyşi qarət,
Qıldı açubən dəri-xəsarət,
Ya kim məni səndən eylədi dur.
Kim qıldı bizi bu dərdə rəncur.
Örtüb yüzə ehtiyat babın,
Təhrirə gətürmədim cəvabın.
Leyk ey güli-şaxi-dilnəvazi,
Vey bülbüli-baği-eşqbazi,
Qıldım bu tərəfdə hər xəbər var
Əsrarinə dayəni xəbərdar.
İzhar edübəm nəqirü qətmir,
Bir-bir sənə eyləyəndə təqrir,
Mə’lumun olur həqiqət, ey yar,
Bu rəxneyi-vəslə urdi kim xar.
Əmn olgilən, ey mənim həbibim,
Asudə ol, ey mənim təbibim.
Var canıma ta ki nəqdi-həsti,
Ruhim qıla cismə tənpərəsti.
İqrarıma eylər olsam inkar,
İqrarın ola qənimin, ey yar.
Gər döndərəm etdigüm qərari,
Bu şivədə xəsmim ola yari.
Gər qeyrə ola rüxi-nəvidim,
Məsdud oluna dəri-ümidim,
Gər adını unuda bəyanım,
Tovhiddə kəng ola zəbanım.
Can özgədin istər olsa vayə,
Daim düşə anda ahü vayə.

Dil özgiyə açar olsa mənzər,
Səd çak ola çün bəri-sənubər,
Məndin sənə bu hədis bəsdür,
Sər məhmilə naleyi-cərəsdür.
Kim eyləsə seyri-bağə adət.
Sər sayeyi-sərvidin fərağət.
Hala ona məskən ola gülxən,
Di xatiridin çıxarmı gülşən?!
Ey dərdə qılan məni giriftar,
Qıl hikmətilə əlaci-bimar.
Gər mərdsən uymagil xəyalə,
Bir fikr edə görgil ittisalə.
Hicran qəmi iczədür dəlalət,
Qüdrət sənə var, nədür bu halət?!
Həm sən olasan fəraqə həmduş,
Hicran mənə həm ola həmağuş.
Bəs məndəvü səndə, ey nükufal,
Noldu degilən təfavütü-hal?!
Səndə ola aləti-şünayi,
Verə bizə abi-qəm cüdayi.
Sən dəxi mənim tək olasan qərq,
Bəs bu ikidə degil nədür fərq?!
Necə olasan həyayə tabe,
Azərm çox oldu rizqə mane.
Sən şiri, bu şiveyi-qəzali,
Rəncur edə arzu xəyali,
Eyb ola sənə durub ayağə,
Mərhəm qoya gör bu zəxmi-dağə.
Algil ələ şiveyi-həjəbri,
Vergil yelə müqtəzayi-səbri.
Gər əmr ilə gəlsə-getsə qasid,
Düşməz ələ daməni-mərasid.
Dəmdür ki, bulaq vüsaldin keyf,
Bir fikr edə gör ki, vəqtdür heyf.
Getsə belə eyşi-zindəgani,
Yə’ni ki, bu mayeyi-cəvani.
Nə faidə de o gün vüsalə,
Nə sud o hali-ittisalə.

Güldən gedə çün təravətü rəng,
Bülbül dəxi bağə qılmaz ahəng.
Töksə pəri-əndəlibi idbar,
Duzəx onadur fəzayi-gülzar.
Gülzarə xəzan yetürsə afət,
Göz açmıyə ona çeşmi-rif'ət.
Bu tərz ilə ol büti-səmənbər,
Düzməkdə hənuz iqdi-gövhər.
Xətm eyləmədin qələm nükati,
Sövda ilə pür dili-dəvati.
Bin nüktə hənuz dildə məknun,
Gül verməde şaxsari-məzmun.
Şövq eylədi anda tey müsəccil,
Ol məcmeyi-xasi qıldı yekdil.
Ahəstə verüb rəsuli-yarə,
Dərdi-dil ona qılub şümarə.
Çün anladı qasidi-nigufal,
Gülşadə nədür həqiqəti-hal.
Dedi qılubən həzar təhsin,
Key çak təni-vəfavü təmkin.
Qəm çəkmə ki, qılam bu dərdə dərman.
Durdi oradan rəvan səbükxiz,
Vərqayə özün yetürdi ol tiz.
Ol şəhneyi-eşq dəstyari,
Verdi gülə müjdeyi-bəhari.
Zinət düzübən rüxi-pəyamə.
Ərz eylədi halü verdi namə.
Vərqa açub oxudi kitabi,
Fəhm etdi mə'aniyi-xitabi.
Buldu qəmu ol xücəstə girdar,
Yaqutinə qarşu dürri-şəhvar.
Duyduqda nigarının vəfasın,
Ol babdə çəkdügi cəfasın.
Birinə yüz artdı dərdü suzi,
Oldu qəmdən siyah ruzi.
Saldı ona eşq şurü qovğa,
Qeyrət başına çıxardı sövda.

Qovğa ani çəkdi iztirabə,
Sövda ani saldı piçü tabə.
Nə vəslə bular rəhi-səlamət,
Nə səbrə təriqi-istiqamət.
Keyfiyyəti-şövqi-vəsli-canan,
Azürdegiyi-xümari-hicran.
Bərhəmzədə qıldı eylə ani,
Az qaldı qəfəsdən uça cani.

## BU, VƏRQA DAYƏSİNİN DƏRDƏDİR TƏDBİRİ-DƏRMANI

Dayə baxuban o dilfigarə.
Heyran oldu o karü barə.
Bildi ki, batubdur ehtiyacə,
Möhtac hərifdür ə'lacə.
Var sineyi-gərmü ahi-sərdi,
Bilməz nədurur dəvayi-dərdi.
Dedi ona, ey mənim ümidim,
Bu babdə var sənə nəvidim.
Qoy qüssəni yemə qəm firavan,
Verdi güli-vəsl şaxi-hirman.
Getdim ki, düzəm o davə xəsli,
Bu ruzi-fəraqə şami-vəsli,
Bu halə müqarin ol kəman qəd,
Çün tir özün andin eylədi rəd.
Filhal o hərimi-xasə məhrəm,
Vərqa anasına oldu həmdəm.
Xatun ani gördü bəs girami,
Göstərdi lüzumi-ehtirami.
Ol məhfili-üns həmnişini,
Məqsudə dutub rəhi-kəmini.
Təqrib ilə ta o macərani,
Xatuninə söylədi nihani.
Nigah o dürri-bəhri-ismət,
Banuyi-hərəmsərayi-iffət,

Tuti sifət oldu nüktəpərvaz,
Pəs dayəni qıldı məhrəmi-raz.
Key sahibi-rə'yü əqlü fərhəng,
Vərqa qəmi qıldı qamətim çəng.
Bir neçə zəmandur, ey nikuxuy,
Görmən o gülə təravətü buy.
Gün-gün o gülün gedər gülabi,
Artar tənü canə iztirabi.
Açmaz üzə babi-sirri-mübhəm,
Qılmaz məni həm o razə məhrəm.
Mə'qul ola eyləyəm əlacın,
Məkruh ola döndərəm məzacın.
Ömr ilə odur çü nəqdi-kanım,
Can cismimə, cismə oldu canım.
Dövran olalı o bəhri-zacir,
Bir dür bu sədəfdən etdi zahir.
Əyyam olalı mənimlə həmtaş,
Bir nəqş bu lövhə çəkdi nəqqaş.
Can parəsi, gözümün qərasi,
Dil mətləbi, ruh müddəasi.
Əvvəldə gərək ə'laci-bimar,
Getdükcə olur dəvasi düşvar.
Dayə ki, eşitdi ol məqali,
Bər verdi şükufeyi-xəyali.
Pəs söylədi, ey büti-yeganə,
Məh peykərü Müştəri-nişanə.
Sən dərdi-dərunin etdin izhar,
Məndin sənə dəxi bir xəbər var.
Bu piri-şikəsteyi-diləfkar,
Vərqa qəmidin olub xəbərdar,
Anladım olan bu dərdü suzi,
Duydum bildim nədür rümuzi.
Durdum o həvadə cüstü cuyə,
Mindim o səməndi-arzuyə.
Gülşa evinə güzar qıldım,
Təhqiqi-o karü bar qıldım.
Sən görmiyəsən ki, zicri-madər,
Qılmış o məhi-siyah mə'cər.

Matəmkədə künci-e’tikafi,
Dutmuş anasi rəhi-xilafi.
Hasil bu anın xəyali-xami,
Mahiyyəti-vəz’i-natəmami.
Sizdən dutmuş rəhi-gəranə,
İstər salə lə’lin özgə kanə.
Ərz eylədi dayə çün həqiqət,
Ol mahə müzaəf oldu külfət.
Ey anə, dedi səvab qıldun,
Agah bu dilxərab qıldun.
Versəm sənə pay müzdi-cani,
Bir bəzli-həqirdür nihani.
Zahir sənə verəm ol qədər mal,
Müşkül ola nəqlü həllü tərhal.
Ver oğluna müjdə, ey nikuxah,
Çün hali-dilindən oldum agah.
Həm həclə qılub ona nigarın,
Şadan qılayım dili-figarın.
Pəs dayəyə qıldı çox ətalər,
Yola salub eylədi sənalər.
Xəlvət qılub ol hərəm nigari,
Çağırdı hümami-namdari.
Dedi ona gizlü Vərqa halın,
Gülşanın anasının xəyalın.
Ol bəbr nijadü şiri-millət.
Dedi ona key güli-məhəbbət,
Layiqmi durur bu qədrü şanə,
Övrət sözüni salam miyanə.
Kamillərədür  kəmali-nöqsan,
Nəql edə aradə hərfi-nisvan.
Qeybətdə nolur duran itabə,
Yüzdə desə sayulur hesabə.
Dir aqil olan o goftguni,
Eylərmi əbəs bu arzuni.
Qəm yeməgil, ey mənimlə həmsər.
Anlar manadur kənizü çakər.
Bir iş ki, qılam ona işarə,
Qadir nə ki, dutalar kənarə.

Min xiffət ilə dutub giriban,
Gülşanı bu gün gətirmək asan.
Likən düşə dillərə fəsanə,
Tə’nə oxuna olam nişanə.
Rəncur ola xatiri-bəradər,
Külfət bitə ol nihaldin bər.
Yegrək bu ki, edəlüm ərusi,
Salub işə təblü nayü kusi.
Həm xəlqə ola bu hal məşhur,
Həm izzət ola aradə mənzur.
Arta dəxi qədrü şani-Gülşa,
Həm ola sürurі-cani-Vərqa.
Muni dedi çünki ol niku nam,
Filhal hilalə qıldı ə’lam.
Key qüvvətü qüdrətim pənahi,
Fərqi səri-mülkə taci-şahi.
Mə’lumum olundu kim tüfeylin
İşrət dəmidə sürurі-seylin.
Qərq olmuş o ləcceyi-məhalə,
Salmış o məhal ani xəyalə.
Kim dutsa xilafi rəsmü adət,
Gümrah ani eyləmiş şəqavət.
Zinhar sənə vəsiyyətim var,
Dutgil muni səd həzar zinhar.
Mə’ruf ola ürfi qoyma əldən,
Zən naqisdür, saqın xələldən,
Bildün sən əgər bu macərani.
Razi oldun de əql xani?
Qafilsən əgər olan cəfadən,
Yoxdur xəbərin o macəradən.
Həqqa ki, bu nəqsidür kəmalə,
Qafil olasan ev içrə halə.
Ey bəxt ilə dövlətim pənahi,
Yetdükdə bu nüktələr gümahi.
Külfət düzüb etmə qəti-işrət,
Bil muni nəsihətü nə külfət?!
Zahir sənə olsun, ey qərindaş,
Munlar qəmudur başına şabaş.

Bir muyini vermənəm cəhanə,
Sənsən atə-anədin nişanə.
Hala budur iqtizayi-adət,
Çün saətədür qərin səadət.
Lütf ilə məni qılub sərəfraz,
Əsbabi-ərusi edəsən saz.
Budur qərəzimdə, ey bəradər,
Həmduş ola sərvə ol sənubər.
Ol gülni bu şaxə eylə peyvənd,
Vərqanı ümiddin bərumənd.
Ol lə’l gərək düşə bu kanə,
Bu cism gərək yetə rəvanə.
Ol neyyəri-ovci-dustkami,
Rövşən qıla dün hərəmsərami.
Ol şahidi-gül düzəndə bazar,
Bu bağə ola ciraği-gülzar.
Ey bəzmi-nişatü eyşə camım,
Banu Qəmərə yetür pəyamım.
Pəs söylə ona ki, ey qələtray,
Bu danişə olma cəhl fərsay.
Vərqani zəlilü xar bilmə,
Bu şüğli özünə ar bilmə.
Gər lə’ldür ol, bu lö’löyi-nab,
Mərcan isə ol, bu dürri-sirab.
Ol gülbin isə bu nəstərəndür,
Naju isə ol, bu narvəndür.
Ol mahi-şəbü bu neyyəri-ruz,
Ol qədri-düni, bu eydi-novruz.
Ol şəm’i-şəbi-hərəmsəradur,
Afaqə bu bizeyi-ziyadur.
Ol zöhrə misal, bu müştəri fal,
Məh bəxt, o, bu, aftab iqbal.
Gülşadur əgərçi abi-heyvan,
Vərqa cisimi-cəhanədür can.
Ol hüsn ilə gərçi nazənindür,
Bin onciləyn muna rəhindür.
Ol bişeyi-ismət içrə haris,
Bu təxt ilə tacə oldu varis.

Vərqa ki, bu gün kəmalədür taq,
Hər nə'tdədür şəhiri-afaq.
Həm rəzmdə xətm ona şücaət,
Həm bəzmdə hətm ona səxavət.
Ol aqilədin bu tərzü üslub,
İzhar sifati-qeyri-mərğub.
Nisbət bizə çünki narəvadur,
Həqqa ki, təvəhhümi-xətadur.
Yəxşimi olur bu eyləmək laf,
Sizdən dilərəm bu sözdə insaf.
Yüz döndərib edəsiz cüdalıq,
Mən sağ hənuz bivəfalıq.
Vərqa zahir ki, növcəvandur,
Ləhvü lə'b ilə kamrandur.
Yox-var demən anın qüruri,
Hər yaşə bir əmrdür zəruri.
Vəz'i əgər olsa namülaim,
Dutma muni xatirində daim,
Zira yox o şivənin dəvami,
Tez püxtə olur o kari-xami.
Andin əgər oldun isə rəncur,
Pəs mən degiləm aradə mənzur?
Xidmətdə ol eylədisə təqsir,
Təqsir xud etməmiş məni pir.
Mən bilmən anın işində nöqsan,
Bağışla gər oldu isə üsyan.
Tərtib etgil cihazi-düxtər,
Dəmdür ki, gələ bu bürcə əxtər.
Məsmu' degil dəxi bəhanə,
Vəqt oldu qədəm qoyub miyanə.
Var fürsətin eyləgil ərusi,
Nagah ki, çərxi-abnusi.
Qəlb edə bu hali özgə halə,
Sağər sına tökülə piyalə.
Asudə dil ol bu sözdin, ey mah,
Dur eyşidin etmə dəsti-kutah.
İrsal edəm ol qədər zərü sim,

Kim düşə zəminə lərzədin bim,
Xətm oldu çü hökmi-əmrü ə'lam,
Əzm eylədi bin qüdusi-ilham.
Təbliğü ədayi-şərti-tənzil,
Qıldı düzübən kəlamə tərtil.
Bulduqda hilal övci-iqbal,
Keyfiyyəti-qalü nəş'eyi-hal.
Xiclət aparub o rəngü budin.
Hikmət suyu ilə şüstü şudin.
Til açdı durub ki, faif ənna,
Bizdən bu səvalədür ət'ənna.
Çün oldu o şahdən işarə,
Bu müjdədurur bizə bəşarə...
Fərman-fərmanü ray-rayi,
Əvvəlki qərardur qərari.
Pəs döndü o qasidi-göhərsənc,
Salmış əlinə kilidi-ol gənc.
Qılduqda zəxirəsin şümarə,
Dapşurdi hümami-namdarə.
Pəs ol sözü pak, özü nəmazi,
Dutdu yüzə şüğli-karsazi.

## HÜMAMINDIR BU DURMAQ QILUBAN OĞLU İÇÜN SURİ

Saqi, məni yıxdı zə'fi-halım,
Qərq eylədi qülzümi-vəbalım.
Xali görürəm əlində sağər,
Cənnətdə nədən yox oldu gövsər?
Noldu degil ol rəhiqi-nabın
Bəhcət abın, rüxi-şərabın.
Xümxanədin al o qıflü bəndi
Pür eylə kəduyi-nuşxəndi.
Doldur ələ alubən piyalə
Məhcurləri yetür vüsalə.
Ta necə olam fəraq əsiri,
Bir cam ilə eylə dəstgiri.

Hicranü təəşşüqü cəvani
Hər birisi od durur nihani.
Gər hər üçü göstərə cəmali
Bir kimsədə de nə ola hali?
İmdi mənəm ol üçə giriftar,
Səndin mənə rəhmdür səzavar.
Lütf ilə kəm eylə dərdü daği,
Sun vəsli-şərabidin ayaği.
Keyfim verə bəzmə ruyi-tazə
Rüxsareyi-nöqlə rəngi-qazə
Çün ol düri-dürci-bəri-miknət
Əsbabi nikahə saldı himmət.
Hər çəndin eylədi müqərrər
Min fərd töküb hesabi-dəftər.
Bin əsb əqiqi-bərq rəftar
Rə'd avazü mürəssə əfsar.
Məhməl çulü sim nə'lü zər zin,
Sərsər seyranü kuhi-təmkin.
Cövlan günü rəxşi-vəhmə sabiq
Dövran dəmi bərqi-hifzə fayiq.
Bir dəm kişi çəkməsə inanın,
Şərqin qərbə verür səlamın.
Bin üştüri-püştə püşti-xoşmu
Tən sürxü siyah çeşmü zanu.
Ol məhmələ bin himar edüb dərc,
Bin əstəri-pürbəhavü kəm xərc.
Bin mişi-hərirpəşmü məh düm,
Bin sur tən əsğərü siyəh süm,
Bin rətli-əbirü müşkü ənbər,
Bin dürci-əqiqü lə'lü gövhər,
Bin vəznə gümüş, həzar mən zər,
Bin vəqr nəbatü qəndü şəkkər,
Bin sadə qulam, sim-qəbqəb,
Mu sünbülü ru gülü şəkər ləb,
Bin cariyeyi-lətifü çəngi,
Çinivü xətayivü firəngi.
Hər yerdə ola nə cins faxir,
Cəm' eylədi cümlə ol əkabir.

Hər növidin ol həzar xəl’ət,
Düzdü rüxi-karə verdi ziynət.
Bu cümləni qıldı ol yeganə,
Əsbabi-nikah içün rəvanə.
Çün ol səri-xeyli-izzü iqbal
Bu şüğlidin oldu fariğübal.
Yığdı mə’ruf əhli-hali,
Məşhur əkabirü əhali,
Bir bəzmə ki, etdi anda bünyad,
Kim görməmiş ani adəmizad.
Açdı rüxi-xan, bəxşişi-am,
Ne’mət yığuban dağıtdı ən’am.
Əlvan tə’am edüb mühəyya,
Hər növ’i qüsurdin mübərra.
Əqsami-mühəlviyatü şirə,
Yetməkdə qəliləvü kəsirə.
Ənvai-tənəqqilati-can nəf’.
Əcnasi-mükəyyəfati-qəm dəf’.
Əsnafi o meyvəhayi-nami,
Misri ilə tayifivü şami.
Əlhəqq nə dilərsə anda xatir,
Firdövs sifət aradə hazir.
Vərqa dəxi rəf’ edüb məlali,
Eyş etmək üçün yığub xəyali.
Həmtaşlərinə yazdı namə,
Yığdurdi o bəzmi-ehtiramə.
Həmduş qəmu əmirzadə,
Xurtək dilü çöhrə safü sadə.
Bibakiyi-nəş’eyi-cəvani,
Cəmiyyəti-bəzmi-kamrani,
Vermiş olara nişat dövran,
Qılmış qamunu çü sübh xəndan.
Yox xab olara çü çeşmi-lalə,
Ləbxəndədə çün dəmi-piyalə.
Gəh şe’r oxuyub, gəhi rəvayət,
Gəh eşqidin eyləyüb hekayət,
Gəh nüktəsəray olub ədəbdin,

Gəh zülfü üzarü çeşmü ləbdin,
Gəh der biri öz məhəbbətindən,
Ol eşqi-filanə ülfətindən.
Gah ol birinin sədayi-sazi,
Zövq ilə edər tərəbnəvazi.
Açub bir oxur rəfiqə fərdin,
Hicr azarın, fəraq dərdin.
Bə’zi başidə həvayi-ali,
Bə’zidə sifati-laübali.
Bə’zisidə əczidür təkəbbür,
Bə’zisidə əczidür təhəyyür.
Hasil ki, o qövmi-nikmənzər,
Hər birisi bir təriq edüb sər.
Əsbabi-nişatü eyş hazir,
Hər nə diləsən aradə vafir.
Hər kimə nə olsa arzusi,
Ol rah ilə pür olur səbusi.
Əmma büti-sitəmrəsidə,
Yə’ni Vərqayi-qəmkəşidə,
Gər eylər idi şegeft zahir,
Olmazdı vəli şegeftə xatir.
Görməz xali könlünü qəmdin,
Sərvin azadə ol ələmdin.
Guya ki, anın dili-nizari,
Fəhm etmiş olan məali-kari.
Duymuş ki, verür təgərg-tüğyan,
Ol kəşti-ümidə bari-hirman.
Olmaz bu dəva nəsibi-rəncur,
Bu surə durur nəticeyi-şur.
Heyran özü həm o və’zü halə,
Qərq olmuş o lücceyi-xəyalə.
Likən çü anındurur bu qovğa,
Naçar qılardı dəf’i-sevda.
Saət-saət durub niyazə,
Ol cəşnə verirdi ruyi-tazə.
Bu yüzdə var ər fərağəti-dil,
Gülşa tərəfindən olma qafil.

## BU, GÜLŞƏN XUD TƏMAŞAGAHİ-BƏZMİ-SURİ-GÜLŞADIR

Əsbabi-təhəmmüli-ərusi,
Qılduqda hilalə paybusi,
Buyurdu düzün yəraqi-suri,
Tərtib edün aləti-süruri.
Söz yolda hənuz kam fərsa,
Əsbabi-nikah olub mühəyya.
Ol gülbünə verdilər bəşarə,
Ta necə xəyali-intizarə.
Batub yürəginə qoyasan dağ,
Ey laleyi-bağü səbzeyi-rağ.
Dur yetdi həvayi-novbəharın,
Dəmdür açıla güli-bəharın.
Pəs anası gəldi ol miyanə.
Ta mürğinə verə abü danə.
Təqrib ilə söylədi həqiqət,
Verdi rüxi-nəqlə zibü zinət.
Gülşa dutuban təriqi-nazi,
Nə naz ki, eyni-karsazi.
Dedi ona, ey əzizim ana,
Qəm oduna abrizim ana!
Qılma məni oxlara nişanə,
Min bə'd mənü bü künci-xanə.
Ol nəş'əni anlamaz məzacım,
Yox məndə həvayi-izdivacım
Qoygil məni başın içün əldən,
Nə sud mənə de ol əməldən?!
Məndin sənə yox bu işdə təmkin,
Qanı, degil ol əvəlki ayin?!
Heç gəldin olub mənimlə həmdəm,
Dedün nədurur bu və'zi matəm.
Qoygil bu məni siyah bəxti,
Niyli qıləyim müdam-rəxti.
Mən qandənü zinəti-ərusi,
Ya meyl libasi-rumü rusi.

Hala zərurin oldu malə,
Saldun məni xəstəni xəyalə.
Az eylə məni cəfayə həmsər,
Sən talibi-malsan nə düxtər!
Ol pəzmdə göstərüb cəladət,
Tiği-süxən ilə min cərahət.
Urdu anasına ol siyəh bəxt,
Dilrəncələrin olur sözü səxt.
Durdu anası rəhi-əlacə,
Möhtac idi çün ol ehtiyacə.
Əfsun nəqdin töküb miyanə,
Ol vəhşiyə qıldı damü danə.
Ahəstə der, ey gözüm qərasi,
Can rahəti, xatirim səfasi.
Sən söylə olurmu, ey səmənbər,
Bu ikidə fikrü söz bərabər?!
Mən aqilənin sözü həqiqət,
Sən cahilə yox məgər nəsihət?!
Çün bilməz idün məali-kari,
Qorxum bu idi olub şikari,
Cəhl-abi verəydi şüstü şuyin,
Qalmazdı bu gündə rəngü buyin.
Ey cismi-zə'ifimin rəvani,
İnsaf ver anla bu bəyani.
İslahına eylədim cəsarət,
Namusuna yetməsin xəsarət.
Oldun neçə gün əgər həsari,
Saldun yüzə pərdeyi-əyari,
Açdun yüzə babi-niknami,
Aldun qəmudin xəti-qulami.
Zəbt eylədügündə nəqdi-məqsud,
Həm mayə bu gün əlində, həm sud.
De olduğuma bu əmrə mane,
Nə maye əlindən oldu zaye?
Bəlk oldu bu yüzdə e'tizalın,
Cananına rəğbəti-vüsalın.
Gər bağlamasam rəhi-təmənna,
Tez verməz idi nəticə sövda.

Hərçənd ki, az olursa rəğbət,
Mən’ arturur arzuvü həsrət.
Vəqt oldu dur imdi, ey xiridar,
Tök nəqdini al vüsali-dildar.
Şəbxanədə neçə bir qünudin,
Dəmdür doğa neyyəri-şühudin.
Axır bu vücudə çün ədəmdür,
Dur eyş keçürmə dəm bu dəmdür.
Hiç istəmiş ola der nişanın,
Durub ana qızının ziyanın?!
Ey iki gözüm, özün qıl iqrar,
Səndin özgə mənim kimim var?!
Çün dövr edə növbeyi-cəvani,
Yüz göstərə ruyi-natəvani.
Üzdin gedə görəsən özümni
Sən umasan ağzımı, gözümni.
Çün mərg iyidin dola dəmağım,
Sən uzadasan əlü ayağım.
Cismim ola xakə çün nəvalə,
Gəh-gah məni salub xəyalə,
Gəh göndərəsən mənə dualər,
Gəh lütf ilə edəsən ətalər,
Güm olmuya xəlq içində namım,
Baqi ola səndin ehtiramım.
Əfsaneyi-bülbüli-köhən sal,
Çün qöncə o gülün eylədi lal.
Gördü dolu cami-müddəasın,
Ayineyi-təb’inin səfasın,
Fəhm eylədi rəmzi-qalü-qili,
Pəs qıldı nəvaziş ol əlili.
Dedi ona ey qəmim ənisi,
Atə-anədür qızın vəlisi.
Yox məndə bir iş xilafi-rayın,
Eylə nə ki, vardur ixtiyarın.
Qıldı o sənəm çü nikxuliq,
Dildarliqü güşadə ruliq.
Pəs anəsi dilgüşad durdu,
Qəmnak oturdu, şad durdu.

Bir cəşni-zənanə qıldı tərtib,
Yetdi ona çeşmi-zəxmi-asib.
Cəm’ etdi gülün o büstanın,
Xatununu hər hərəmsəranın.
Təklif edüb evbəev ulusi,
Çağırdı qəmu qızü ərusi.
Bir nəhc ilə qurdu bəzm o məşku,
Firdovs ani gördü gizlədi ru.
Firdovs o məhfili-sururi,
Bakirələr anda düxti-huri.
Nə ism təamə qoydu rəssam,
Hazır qəmu qılmış anda mün’am.
Gər məşrəfti-tir edə hesabi,
Xəm eyləyə qövsi iztirabi.
Bin naz ilə ol pəriliqalər,
Dil riştəsidin girehgüşalər.
Bir-birinə eyləyüb sədaqət,
Göstərdilər oynamaqda halət.
Ol məcmə’ içində aşkarə,
Gülşa məh idi, olar sitarə.
Hərçənd durub o nazəninlər,
Xatirləri, özləri əminlər,
Sə’y ilə düzüb səfayi-tiynət,
Bir-birinə artururdu ziynət.
Şayəd olalar o mahə həmqədr,
Pərvin necəsi olur məhi-bədr.
Ol hüsn ilə aləmin xəraci,
Ol məhfili-surin ibtihaci.
Bir rəng ilə qıldı ərzi-surət,
Məşşateyi-əqlə yetdi heyrət,
Doğduqda o kövkəbi-nəhari,
Yetdükdə o şahidi-bəhari
Gizləndi şüa’idə kəvakib,
Güm eylədi qönçələr məratib,
Odğazəyə saldı rəngi-ruyi,
Xəm sünbülə urdu piçi-muyi.
Mirvari yetişmədi vüsalə,
Dun safda olmaz ayə halə.

Sürmə gözidən olub siyəh ruz,
Vəsmə qaşı rəngidin çigər suz.
Dil vermədi ol səfid abə,
Tə’n etdi o girdi-asiyabə.
Anınilə der səfa tələfdür,
Məh ruyinə qeyri-məh kələfdür.
Dövr etdi otağə atdı pəncə,
Der bu səri-hüsnədür işkəncə.
Xatir sevməz bu ixtiyari,
Sər necə yetər xurə şüayi.
Rəngi-rüxi-ol büti-pərivəş,
Gülzari-cəhanə saldı atəş.
Yüz xaneyi-Kə’bənin misali,
Şəbə həcər oldu yüzdə xali.
Gördükdə dişin zəmani-göftar,
Saldı suya öznü dürri-şəhvar.
Ta ağzına baxdı qönçə bitab,
Şərməndə olub buraxdı təbbab,
Kuyi zəğənində çahi-hirman,
Gülzar bulanda babi-zindan.
Ol zülfi-siyahi-tabdərtab,
Gündüz gecədür kəsincə təvvab,
Hər kim ki, girəm desə o bağə,
Meyl eyləsə seyri-bağü rağə.
Əvvəl sala ölüçə cəmalə,
Axır çəkə zirveyi-kəmalə.
Əvvəl duruban asa o çahə,
Axır çəkə övci-mehrü mahə.
Əvvəl qıla dəstü paybəndi,
Axır ola yarlıq kəməndi.
Yox-yox o xülasədür əyarə,
Kimin düşə nəqdi e’tibarə.
Məşşatəsiz ol qəmə giriftar,
Açduqda o cəm’ə ruyi-rüxsar.
Kim gördü dedi o məhzi-nuri,
Həqqa ki, degil məgər bu huri?!
Ol saxtə və’zə vermədi dil,
Kamil olan istəməz mükəmmil.

Çün hüsn özidin bula rəvaci,
Məşşatəyə qalmaz ehtiyaci.
Saət-saət o kani-təmkin,
Ol bəzmə düzərdi tazə ain.
Bir növ’ əsasi-eyşi-möhkəm,
Qıldı özünü güm-eylədi qəm.
Leyk ol gülə iştiyaqi-bülbül,
Düşmüş getmiş olan təhəmmül.
Xatirdə xəyali-yar-mehman,
Başında həvayi-vəsli-canan.
Der necə əsir olam xəyalə,
Ola yetişəm şəbi-vüsalə.
Sur əl ura daməni sürurə,
Bu zülməti yetürə o nurə.
Gəh səbr ilə eylər ittifaqi,
Kim səhl ola iki gün fəraqi.
Bilməz guya ki, əksər ovqat,
Tə’xirə durur nəticə afat.
Çox kimsə içəm dedi müdami,
Əldin düşübən uşandi cami.
Gər aqil isən eşit nəsihət,
Bil əldəki fürsəti qənimət.
Bu amileyi-həzar didə,
Sə’y ilə qəd eyləmiş xəmidə.
Təhrir edə çərx ruznamə,
İltə o hesab gah şamə.
Təğyir verə səfayi-halə,
Edə qəmə baqisin həvalə.
Bir və’z ilə yox anın mədari,
Əhbabə nəqiz karü bari.

## BU, VƏSFİN EŞİDÜB ƏMR OLMAĞI GÜLŞAYƏDÜR AŞİQ

Saqi, nə durur bu rəsmi-bidad,
Çıqdı fələkə nəfiri-fəryad.
Qılma məni binəva nəvadən,
Kəsmə kərəmin bu aşinadən.

Tök xuni-dili-sürahivüdən
Bu məcmə'ə sal bir özgə şivən.
Sun sağəri-eyş bəxtü qəmgah,
Həm çöhri-hilalü həm rüxi-mah.
Nagah qılur dur olma qafil,
Ol xəsmi-xümar qarəti-dil.
Dut zeyli-ərusi, nəş'eyi-cam,
Ta ki, çıqarur başından əyyam.
Kam al çü quruldu bəzmi-işrət,
Sür rəxş çü var əlində fürsət.
Kimsə nə bilür ki, dövri-axir,
Nə lə'bi-müşö'bəd edə zahir.
Ol katibi-hadisati-dünya,
Beylə bu misalə çəkdi tuğra.
Çün qövmi-Büneyni-Şeybə əksər,
Ol rahi-sürurə gərm edüb sər,
Batdılar o qülzumi-nişatə,
Məşğul o tərhi-ixtilatə.
Bir həftə içildi rahi-rahət,
Kəsb eylədi kami-dil fərağət.
Axır oları durub zəmanə,
Qıldı həsəd oxuna nişanə,
Yağdurdu olara tiri-bidad,
Qıldı l nişatü eyşi bərbad.
Gördükdə ol iki həmxəyali,
Bulduqda yavuğ şəbi-vüsali.
Dutub yüzə şiveyi-nifaqi,
Cəm eylədi ləşkəri-firaqi.
Saldı arayə hüsami-şəbxun,
Məğbun ola ta ol iki məftun.
Yıxmaqda durur zəmanə bünyad,
Qafildür özündən adəmizad.
Bilməz başa gəldügi ümuri,
Var başidə aləmin ğüruri,
Ol əsrdə bir pəlidi-xunxar,
Bəxti ona yar, o cəm'ə sərdar.
Əmr ismi, eli adı Bənu Zeyf

Səhragüzər ol şitavü gər seyf,
Dutmuşdu rəhi-xilafi-islam,
Kəsmişdi rəhi-Hicaz ilə Şam.
Azar işi cünbişiydi qarət,
Əbnai-səbilə şərrü afət.
Əclaf, zəmanə dəstyari,
Bidad ilə zülm karü bari,
Xəsm ona açanda babi-rahi,
Məhsureyi-bər anın pənahi.
Bir dəşt ki, vəhmi-mürği-calak,
Güm eyləmiş anda rahi-idrak,
Abü çəməni sərab ilə xar,
Hər xar kəfi-xəyalə mismar.
Fülki-ələmə zəfər imadi,
Tufani-xətərdə gərdi-badi.
Ol əf'iyi-dəştü quli-səhra,
Qılmış o yeri özünə mə'va
Ol ərsədə bağlamış səməndi,
Ta kimsədin olmasın gəzəndi.
Casusi anın gəzərdi hər yan,
Pünhan gözə çün bəlayi-dövran.
Eylərlər idi o gəbri agah,
Hər vaqiyəyə ki, bulsalar rah,
Bir gün ona cəm olub cəvasis,
Çün amileyi-cünudi-iblis.
Kim gördügidən qılar rəvayət,
Eşitdügidən kimi hekayət.
Kim dust sözün salub miyanə,
Kim düşməndin düzüb fəsanə,
Kim şərh qılur rüsumi-əhya,
Kim nəql eylər səfayi-mə'va.
Söylər kimi gördügi məhəldin,
Tumari-kəlam açub gözəldin.
Casusi-büneyni-Şeybə axir,
Açdı gəncin saçub cəvahir.
Dedi ona, ey əmiri-kamil,
Bəhram sənə qulami-müqbil.

Lütfü kərəmin mənə pərü bal,
Düzmüş ki, gəzəm fəzayi-iqbal.
Dutdum yüzə hər məkani lanə,
Hər ərsədin aldım abü danə
Az qalmış ola ərəbdə əhya,
Kim qılmamış ani mən təmaşa.
Gördüm onları gəzüb sərasər,
Əhlini müənnəsü müzəkkər.
Gördüm gözəlini hər məkanın,
Məhbublərini bu zəmanın.
Ellərdə əgərçi var cəmilə,
Hər birisi nadiri-qəbilə.
Əmma gördüm məlik hilalın,
Var bir qızı qabili-vüsalın.
Gülşa adı bir büti-yeganə,
Az görmüş anın kimi zəmanə.
Tövsifidə lal anın zəbanım,
Tə’rifidə bağludur dəhanım.
Ol nadirənin misalı yoxdur,
Hər guşədə dərdməndi çoxdur.
Bir cövhərin olmasa nəziri,
Qalmaz təşbihə dəstgiri.
Həml eyləmə sidqimi xilafə,
Mən yar degil bu sözdə lafə,
Çox kimsənə istəmiş vüsalın,
Salmış başa nə’şeyi-xəyalın.
Heç birinə olmamış müyəssər,
Vermək o nihali-vəsldin bər.
Vəchi bu əmu görüb o sərvi,
Öz daminə salmış ol təzərvi.
Oğlu içün eyləmiş güzidə,
Ol çeşmi-cəhanə nuri-didə,
Verdi o dəğəl düzüb bəyanın,
Həm pərinin, elinin nişanın.
Canü dili-Əmrə düşdü atəş,
Sövda ani eylədi müşəvvəş.
Aşiq ani eylədi fəsanə.

Ol gövhəri-pakə qayibanə.
Fikr eylədi xatiri-nəjəndi,
Bu rə'y anın oldu dilpəsəndi.
Kim cəm' edə cümleyi-sipahın,
Duta o Büneyni-Şeybə rahın.
Əvvəl qıla ani xastgari,
Duta yüzünə təriqi-yari.
Verilsə cavab ru səvalə,
Pəs dura təriqeyi-cidalə.
Hər nö'v ilə olsa ol qəzali,
Damə saluban bula vüsali.
Cəm' etdi o şüğli-paymərdi,
Otuz iki min yəli-nəbərdi.
Hər birisi fitneyi-zəmanə,
Nə fitnə, bəla biladi-canə.
Həm suri-səlahdin mükəlləl,
Həm şuri-səlahdin mükəmməl.
Seylabi-bəlavü bərqi-cansuz,
Ol məzrəə yol kəsüb şəbü ruz.
Olmuş bələd ol yolun dəlili,
Ta sihhətə yetürə əlili.
Çün badiyə qət' qıldı məhmil,
Əksildi yolü kəsildi mənzil.
Pünhan dutdu o quli-səhra,
Bir guşədə ehtiyat edüb ca,
Həm rəf' oluna məşəqqəti-rah,
Həm tazə xəbərdin ola agah.
Göndərdi Büneyni-Şeybə casus,
Ta yemiyə qıldığından əfsus.
Casus olara qılub üburi,
Gördü bildi o şüğli-suri.
Əmri gəlüb eylədi xəbərdar,
Ol qövm sürurin etdi izhar.
Dedi ona: getdi ixtiyarın,
Vərqayə nəsib olundu yarın.
Yarn gecədür şəbi-zifafi,
Yox başın içün munun xilafi.

## BU, ŞƏBXUNDƏ ALUB QAYITDIĞIDUR ƏMR GÜLŞANIN

Çün Əmr eşitdi bu məqali,
Ol şüğlidə bərhəm oldu hali.
Bildi ki, od aldı nəxli-külfət,
Yox faidə dəxi qıla ülfət.
Öz-özünə fikr edüb o məl'un,
Cəzm etdi ura o qövmə şəbxun.
Şayəd ki, bula vüsali-dilbər,
Ol dürcdin ala əqdi-gövhər.
Çün zaği-zəmanə açdı balın,
Saldı yerə sayeyi-vəbalın.
Tavusi-fələk olub hisari,
Ol məşğələdin dutub kənari,
Şahənşəhi-Çin olundu məğlub,
Ceyşi-həbəş oldu mülkə mənsub.
Xaqani-nəharə yetdi idbar,
Rayatini eylədi nigunsar.
Divi-şəb açub yədi-tətavül,
Ləşkər yeridüb düzüb qəravül,
Ta göz aça dideyi-zəmanə,
İlqar ilə yetdi ol məkanə.
Kim cəm' idi anda nazəninlər,
Təşvişi-zəmanədin əminlər.
Məşğuli-sürur mərd əgər zən,
Nə bimi-ədu, nə xövfi-düşmən.
El cümləsi qafil ol bəladən,
Kim nə yetər onlara qəzadən.
Ruz oldu qərini-şami-nikbət,
Yağdurdu bəla səhabi-külfət.
Şəbxun olara yetürdi düşmən,
Şay əhlinə şivə oldu şivən,
Nagah olara yetişdi yaği,
Sərsər yeli sovdurub çirağı,
Kim göz açdı töküldü yaşi,
Baş qavzadi kim kəsildi başi.

Ol məzrəə düşdü bərqi-atəş,
Çün zülfi-təban olub müşəvvəş.
Saldı ələ Əmr arzusun,
Yə'ni o cəmaətin ərusin.
Düşdükdə ələ o dürrətül-tac,
Ol fövcə açıldı dəsti-tarac.
Düşdü ələ gövhərü zərü sim,
Həm vəzni-xəraci-həft iqlim.
Qafil gecə xəsm zurdəsti,
Naçar olara verüb şikəsti,
Yüz gizlədi cümlə yarü əğyar,
Sər neyləyə olmaz isə sərdar?!
Hərçənd qoşun ola dilavər,
Qafil ona həmlə qılsa ləşkər,
Axır gedüb əldən ixtiyari,
Dutar yüzünə rəhi-fərari.
Hiç anlamadı o cəm'i-məğlub,
Talib kimü qanda vardı mətlub?
Məclis dağulub pozuldu ain,
Oldu çü Benat nə'ş Pərvin.
Hər fərd qılub özünə çarə,
Bin hiylə ilə çıxub kənarə,
Göstərdi o zülmi-pür qəramət,
Ol cəm'ə nümuneyi qiyamət.
Ayrıldı qız atadan, anadan,
Əldən-ələ düşdü ol bəladan.
Damad ərusin eylədi güm,
Ər övrətə qılmadı tərəhhüm.
Kim qaçdı çıxardı müft-cani,
Baş saxladı verdi xanümani.
Əksər el olundu qətlü ğarət,
Rahat güli oldu xari-möhnət.
Zur eylədi Əmrə dəstgiri,
Gülşani qılub anın əsiri.
Bulduqda o zülmdin fəraği,
Qayıtdı səbükrəvan o yaği.
Kəsb eylədi kam o müddəadən,

Çıxmaq dilədi rəvan aradən,
Bozduqda o dun ara qəbili,
Dutdu yüzə gəldüki səbili.
Vəhm eylədi ol pəlidü xunxar,
Əhya əgər olsalar xəbərdar,
Nagah dönə şiveyi-tətavil,
Qurtulmaq aradan ola müşkil.
Çün şaməti-Şam olundi axir,
Sübh eylədi rayətini zahir.
Bami-fələk üzrə kusi-zərrin,
Çaldurdi-düzüb bir özgə ain.
Göstərdi ələm dağıtdı pərçəm,
Ol xosrovi-çar rükni-aləm,
Cəm' oldu o qövmi-dil pərişan,
Didə giryanü sinə büryan.
Hər birə cəfa qılub zəmanə,
Ev yıxmışü pozmuş aşiyanə.
Sayə olar üzrə salmış idbar,
Qılmış qəmuni bəlalərə yar.
Vərqayi-həzinü zarü əfkar
Nə dil əlidə, nə daməni-yar.
Çıxmış dutulan şikar əlindən,
Dökmüş badeyi-xümar əlindən.
Bir növ ilə qıldı ahü nalə,
El cümləsi ağladı o halə.
Dərdi-dilini qılub şümarə,
Yağdurdi o məcməə şərarə.
Ol firqətə yarü hicrə həmsər,
Bu bir qəzəli oxur mükərrər.

## QƏZƏL

Ey fələk, netdim həmişə gözləyib azarımı,
Dil evin ğarət qılub pozdun rüxi-bazarımı.
Dəhr içində tiri-bidadə məni qıldun hədəf,
Zülm ilə bu dün ara əldən çıxardun yarımı,

Noldu cürməm əxtəri-bəxtim vəbalın gözləyüb,
Lütf ilə qıldun təvana taleyi-əğyarımı.
Bünyeyi-iqbalıma bin qəhr ilə saldun şikəst,
Eylədün faiq durub iqbalıma idbarımı.
Dəsti-zülm ilə məni əğyarə qıldun zirdəst,
Vüs'əti-mərdanəlikdə təng edüb həncarımı.
Paybusi-yarə yetsən qoyma əldin, zinhar,
Ey səba, lütf ilə dutgil daməni-dildarımı.
Qəm hücumunda Məsihi tək mənim halımnı gör
Söyləgil əğyardan pünhan ona əsrarımı.

Gördükdə anın ədayi-yasın,
Ol cəm' unutdu öz bəlasın,
Bir-bir gəlüb etdilər nəsihət
Key bülbüli-rövzeyi-həqiqət,
Yox nəf' özü salmağın cəfayə,
Qıl səbr bu düşdügün bəlayə.
Ta kim görəlüm bu zülmü ədvan,
Kimdən bizə yetdi qətlü talan?!
Kim urdu bu dün içində şəbxun,
Kim qıldı səni vüsalə məğbun.
Ey şah, əgər müşəyyət Allah,
Qəm yemə gülün olursa həmrah,
Zirü zəbər edəlüm o xeyli,
Qandan yeridüb zəminə seyli.
Sər səbz edəlüm bu toxmi-lafi,
Birinə yüz edəlüm təlafi.
Can eyləyəlüm sənin nisarın,
Asan salalum ələ nigarın,
Atası dəx açdı riştədən tab,
Yağdurdi səhabi-mehridən ab.
Dilcuyluq eylədi firavan,
Ol kəşti-ümidi qıldı rəyyan.
Vərqayi-sitəmrəsideyi-zar,
Səbr eylədi anda çarü naçar.
Nə səbr ki, ol bəlayi- dilduz,
Bir od ona saldı xanümansuz.
Yox əlhəq əlində bir əlaci,
İslah edə döndügi məzaci.

Düşdü ol qəmdə piçü tabə,
Qovruldu ol atəşi-əzabə.
Casus duyulmaq içün əhval.
Ətraflara olundu irsal.
Gün axiridə yetişdi müxbir,
Dedi olara ki, Əmri-kafir
Şövq eyləmiş ol bəlani sərkəş,
Urmuşdur o neystanə atəş.

## YETÜB ƏMRƏ HÜMAM İLQAR İLƏ CƏNG ETDİGİDÜR BU

Duyduqda xəbər şəhü sipahi,
Ol vaqiə rəmzini kəmahi
Yığdurdi əsakirin təmami,
Atlandı pəs ol hümami-nami.
Mən' eylədi şan o şəhryari,
Kim istəyə qeyridən o yari?!
Te'dadi-əsakir etdi nazir,
On iki min ər yazıldı hazir.
İlqar ilə dutdu rahi-birah,
Yol kəsdi tülu'i-sübhədək şah.
Rəf eylədi pərdə çöhreyi-hur,
Afaqə buraxdı pərtovi-nur.
Bir məş'ələ oldu aşkarə,
Gizləndi ziyasidə şərarə.
Göründü dəmi-səhər güşadi,
Orduyi-müxalifin səvadi.
Gürdani-Büneyni-Şeybə yekdil,
Düşmənlərini görüb müqabil,
Çün ləşkərdə nəvərdi-tə'cil,
Kəsmişdi o gecə rah otuz mil.
Sürməkdə ikən səməndi-ğeyrət,
Aramiş içün göründü fürsət.
Düşdülərü qondular bərabər,
Ta dinlənə bir dəm anda ləşkər.

Bir az saət bulardin əqdəm,
Ol mənzilə Əmr düşdü məqdəm.
Düşmüş qıla bir zaman fərağət,
Rənci-səfərindən istirahət,
Dəxi görə ol pəri misali,
Nuş eyləyə badeyi-vüsali.
Əmn olmuş idi hümamü əskər,
Yetməz ona olsa badi-sərsər.
Gərçi o müxalifi-rəhi-həq,
Almazdı gözə əduyi mütləq.
Verdilər ona xəbər ki, ey şah,
Düşmən bizə yetdi olgil agah,
Güldü dedi: – Olmayın müşəvvəş,
Onlar xəsi-xüşkdür, mən atəş.
Bir şö'lədə yanduram təmami,
Vərqa ilə öldürəm Hümami.
Bəxt olsa əgər rəfiqü yarım,
Ol vəhşi durur mənim şikarım.
Çün var idi qayəti-qüruri,
Həm kəsrətidin dili-hüzuri.
Əmr eylədi atlana sipahi,
Ta bağlıya düşməninə rahi.
Ol müşriki-müdbiri-firəngi,
Əvvəl özü geydi sazi-cəngi.
Fuladə girüb çü kani-cövhər,
Tərtib üzə qıldı dər'ü miğfər.
Əsbani-cədəl çəkildi zinə,
Qovğayi-süheyli-rəxş kinə.
Çaldı orada nəfiri-suri,
Göstərdi nişaneyi-nüşuri.
Əsbabi-cidal olub mürəttəb,
Dərya kimi cuşə gəldi mövkəb.
Gürdani-mübarizi-cidali,
Baş kəsməgə bağlayub xəyali.
Ol qaidi-ləşkəri-zəlalət,
Çaldurdu nəfirü açdı rayət.
Məhmiz urub ol səməndi-lafə.

Girdi özü mə’rəzi-məsafə.
Çağırdı ki, ey rəisi-əhya,
Bu ləşkərə qılgilən təmaşa.
Salmış əcəlin səni bu rahə,
Baxgil gözünü açub sipahə.
Başında nədür xəyali-xamın,
Nə fikirdə əqli-natəmamın.
İnsaf dilər bu iki ləşkər,
Bir-birə neçün olur bərabər?!
İlğar ilə kəsdiyimdə rahi,
Azmış qəmu ləşkərü sipahi.
Qılsan yarın olar nəbərdi,
Bu gün mənü sən cidali-mərdi.
Gəl verməyəlüm cidayə azar,
Bu ləşkəri edəlüm səbükbar.
Hər kim birin olsa zirdəsti,
Olsun o cəmaətin şikəsti.
Gər mərdsən etməgil bəhanə,
Qoygil tez özün qədəm miyanə.
Vərqa ki, eşitdi ol məqali,
Bildi nədür atanın xəyali.
Durub anın oldu səddi-rahi,
Düzdü özü cəngə dəstgahi.
Atayə der, ey mənim pənahım,
Hər nayibədə ümidgahım.
Sən saxla cinahü qəlbi-ləşkər,
Vərqani cidalə qıl müqərrər.
Qanda aparım bu nəngü ari,
Sən cəngdə, mən dutam kənari.
İgidlərədür cədəl münasib,
Ol cinnə mənəm şəhabi-saqib.
Kəm görmə məni, əduni büsyar,
Yandurdu şərarə püşteyi-xar.
Xəlq içidə bu məsəldürür faş,
Min qarqaya bəs atanda bir daş.
Zahir bu qəmuyə zəhri-kari,
Bir od qiyəsi yıxar həzari.

Bəlli dağıdur açanda bəndi,
Bir gürg həzar gusfəndi.
Xur zib verəndə ruyi-karə,
Əncüm gəlməz dəxi şümarə.
Əmrə verəm eylə guşmali,
Unuda cənub ilə şimali.
Mə'zurdur ol zəman həyca,
Görmüş özünü aradə tənha.
Gər ərsədə görməz olsa bəbri
Rubah edə də'viyi hüjəbri.
Qəm çəkmə anın mənəm ədili,
Bəsdür ona zərbi-müşt səbili.
Sayə ona salsa zilli-miğim,
Bir loğma qılar nəhəng tiğim.
Var cövhəri-tiğimə hüveyda,
Tuğrayi-bərati-ömri-ə'da,
Qılsa yələ navəkim iqabın,
Ta göz açasan alur əzabın.
Bir zərb ona tapşuram əmanət,
Bilsin ki, necə olur xəyanət!
Gər kuh isə gürz ilə qılam kah,
Getdim mənə himmət eylə həmrah.
Çün gördü hümam o dilnəjəndi,
Olmuş o xəyal paybəndi.
Lütf ilə nəsihət etdi ağaz,
Ol razə müvafiq eyləyüb saz,
Til açdı ki, ey mənim rəvanım,
Vey qüvvəti-cani-natəvanım,
Zinhar bu sözdən açmagil ləb,
Qaim sanadur nizami-mənsəb.
Mən cümleyi-ləşkəri-tüfeylin,
Rəhm et mənə saxla rəxşi-meylin.
Zinhar sənə həzar, zinhar,
Gər mur isə görmə düşməni xar.
Təxsis bu mərdi-ruyi-meydan,
Cəng eyləməgi degüldür asan
Çün od salmış o solü sağə,
Çox sərləri salmış ol ayağə.

Çox tacdən ol qapub otaqə,
Çox vəsli yetürmüş ol fəraqə.
Əksər işi hiylədür cidalın,
Kim məşq durur ona xəyalın.
Hərçənd nihal ola tənumənd,
Təhriki-səba qılur ani bənd.
Çün bağda nəxl ola kehin sal,
Təğyir ona sərsər etməz əhval.
Gər zahiri pirü natəvanəm,
Batində pələngə həminanəm.
Gər çəngi-kühulətə əsirəm,
Adabi-cidalə gürgi-pirəm.
Ey canım oğul, bu quli-çəngi,
Çağırdı savaşa mən nəhəngi.
De muni qəbul edərmi qeyrət,
Düşmən durub edə ərzi-sovlət?!
Xahan məni mən buram inani,
Salam ol arayə tərcümani.
Yox varmamaqa mənim əlacım,
Bu şərbəti istəməz məzacım.
Vacib içmək meyi-fəraqi,
Kim oldu degil cəhandə baqi?!
Gər buzsa qəza düzən misali,
Sən ol məlikü sərirə vali.
Çün bal aça dövlətə hümayın,
Qılgil nədür iqtizayi-rayın?!
Bu gənci alub bozam tilismin
Zində qılubən cidal rəsmin,
Gər ruzəyə qalmış abü danə,
İqbalıma yar ola zəmanə,
Geymək tənə mərdlik libasi,
Asan degil, ey gözüm qərasi!
Ər bilməsə qeyri-bəzmü badə
De övrətədür nəsi ziyadə?!
Yetdükdə nəsihəti kəmalə,
Tapşurdu durub ani Hilalə.
Geydi tənə cövşəni-təharət,
Tökdü yanına silahü alət.

Pəs özüni çulqayub hərirə,
Səd bağladı rahi-tiğü tirə.
Sancub belə xəncəri-cigərxar,
Çün qəmzeyi-çeşmi-məsti-dildar.
Geydi bir dər' ol güzidə,
Çün çeşmi-xürusi-təngdidə.
Ni ni, o nəhəngi-adəmi-xar,
Rəzmində fülusin etdi izhar.
Qoydu başa beyzə ol yeganə,
Çün xudi-mürəsseyi-zəmanə,
Asdı belə tiği-abdari,
Çün bariqeyi-şəbi-bəhari.
Asudəliqində kani-cövhər,
Cünbişdə xuri-səmayə həmsər.
Qüttal özü şərbəti həlahil,
Saqi camında zəhri-qatil.
Tir ilə kəmanə yetdi fərman,
Bağlandı sadaq, asıldı qərban.
Tirkeş demə bir dəhani-əjdər,
Peykan ona nabi-zəhrpərvər
Qərban demə ğar bil o cayi,
Sö'bani-bəla içində yayi.
Ta dəf' edə düşmənin ziyanın
Aldı ələ əf'iyi-sinanın,
Çün hərbeyi-dideyi-əzabi,
Xunabi-cigərdin abü tabi.
Çignində sipər, sipəhrdür mehr,
Məh qübbəvü çərx dövrü xur çehr.
Ol sayeyi-gürz, məğzi-xayi,
Eylər kimə düşsə can rübayi.
Həmlə günü salsa badi-peykər,
Kuhi qıla kahilə bərabər.
Mindi o səməndi-badpayə,
Saldı çərxə hümay sayə.
Nə rəxş ki, ol üqabi-meydan,
Çün badeyi-vəhm tündseyran.
Qovğa günü səm çalub zəminə,
Yetürdü simak payi-zinə.

Cövlan verüb ol həjəbri-navərd,
Əflakə yetürdi abdin gərd.
Çün şir görə şikari-guri,
Arturdi ona qüruri-şuri.
Yanar od tək saçub şərarə,
Yetişdi o Əmri-nabəkarə.
Çağırdı ki, ey şərirü bədkar,
Gəldi əcəl ölgilən xəbərdar.
Ey müşrikü xayinü mücahid,
Vin suqdə bəs mətayi-kasid.
Kimsən yetüşür kimə nijadın,
Elin kimü qandadür biladın?
Oğruluq ilə keçən mədari,
Kim ola özü, nə e'tibari?!
Namərd dutar oğurluğa rah,
Fe'lin onadur dəlili-cagah.
Kim heyf edə sakini-hicazə,
Yetməz o nəmazdin niyazə.
Bu şivə ki, səndən oldu zahir,
Əcrini onun bularsan axir.
Ey gürg rüxü şəğal şivə,
Qürrə oluban bu məkrü rivə.
Qafil dutuban rəhi-xəsarət,
Aldun ələ tiği-qətlü qarət.
Ol səhl ola dur bu gün bərabər,
Gör qüvvəti-tiğü zərbi-xəncər.
Əldən qoymaz səni bu düşmən,
Durgil öz-özünə eylə şivən.
Üzdü səni kəsrətin qüruri,
Düzdü sənə nəkbətin bu şuri.
Qafil bu kəlami-hikmətindən,
Kəm min fisətin qəlilətindən.
Var ləşkərim içrə çox dilavər,
Hər birisi on sənə bərabər.
Ədnasinə eyləsəm işarə,
Səndin qoparur gögə şərarə.
Hala mənəm od bəlayi-canın,
Bu ərsədə qabizi-rəvanın.

Muni deyibən götürdü nizə,
Əmr ilə durub rəhi-sitizə.
Yüz həmlə olundu nikü ya bəd,
Nikü bəd özündən eylədi rəd.
Ol iki pələngə artdı sovlət,
Tir ilə kəmanə yetdi növbət.
Durdu məh alub ələ hilalın,
Seyd etməgə çərx açdı balın.
Bir-birinə ol səhabi-neysan,
Yağdurdu təgərg tiri-baran.
Cəng etdi iki bəla düçari,
Ta mardan oldu qar xali.
Şəmşirə yetişdi növbəti-cəng,
Timsah şikarə qıldı ahəng.
Əmr əvvəl o şahə çaldı şəmşir,
Döndərmədi yüz o zərbədin şir.
Qol qavzadi başə çəkdi qalxan,
Rədd eylədi ol bəlani asan.
Növbət çü yetişdi ol Hümamə,
Kar etmədi tiği cirmi-xamə.
Çalışdı ol iki mərdi-meydan,
Ta sındı qılıc, uşandı, qalxan.
Bir-birə ol iki kuhi-Əlbürz
Çün kubeyi-pütk çaldılar gürz.
Necə ki, uruldu zərbi-cansuz,
Olmadı biri-birinə firuz.
Yandurmağa dökdilər şərarə.
Heç birinə batmadı sitarə.
Verdi ol iki cidal dadin,
Birdən biri bulmadı muradin.
Baqmaqda olarə dustü düşmən,
Ta kimə qıla zəmanə şivən,
İqbal kimə verə kəvahi,
Kimnin ola kəştisi təbahi,
Ta cəngi-züha yetişdi şamə,
Göstərmədi fəth ru hüsamə.
Heç birisi olmadı müzəffər,
Asayişə təbl çaldı ləşkər.

Hər birisi gözlədi məqamın,
Saxladı dolu əlində camın.
Bilməz ol iki cədəl figari,
Yarın kimə tale edə yari.
Ta yetdi çü ol əduyi-bidin,
Amaci-xədəngi-ahü nifrin.
Qondu yenə düşdügi məqamə,
Eyş etməgə sayə saldı camə.
Nəsb eylədi hər tərəf qəravül,
Ta yetmiyə onlara tətavül.
Açub yerə qoydu dər'ü miğfər,
Yığdurdu xəvasini sərasər.
Sazəndələr əl uzatdı sazə,
Bazində durub rəhi-niyazə.
Sər səcdəyə xəm qılub sürahi,
Dökdi qədəhə sirişki-rahi.
Başlar qızdı gedüb güdurət,
Rəf' oldu xəyaldin xüsumət.
Çıxdı başa şuri-nə'şeyi-cam,
Əksildi qərarü getdi aram.
Ol müşriki-qurnazi-neyran
Dilsuxteyi-əzabi-hicran,
İltin-dedi-ol səmən üzari,
Ta şad edəyim dili-figari.
Necə ola həm visaqi-hicri,
Ola ki, görəm fəraqi-hicri
Şövqi məni yıxdı qayibanə,
Oldum qəmu dillərə fəsanə.
İmdi ki, vüsalə yox məvane'
Mümkünmi olam xəyalə qane'?!
Çəkdi nəzərə güli-rəqibi,
Şad etməgə cani-əndəlibi.
Hər kim ki, göz açdı gördü ani,
Qoydu həvəs atəşinə cani.
Çün Əmr ona eylədi nəzarə,
Can caməsin etdə parə-parə.
Hər vəsf ki, eyləmişdi vəssaf,
Gördü verdi qəmuyə insaf.

İstərdi özünə qıla dəmsaz,
Lütf ilə kəlamə qıldı ağaz.
Ərz eylədi gəncü tökdü mali,
Gülşa baxub açmadı cəmali.
Hərçənd ona qıldı nikxuliq,
Dilcuyliqü güşadə ruliq.
Eşitmədi hərfi-nasəvabın,
Aldanmadı vermədi cəvabın.
Hərçənd görür ədudən ülfət,
Dutur Gülşa təriqi-külfət.
Açmaz yüzə babi-ixtilati,
Almaz gözə məhfili-nişati.
Xatirdə həmin həvayi-yari,
Ol qəmdə xəyal qəmgüsari.
Həmdəm ona ahının səğiri,
Həmxanə o vəz’i-nagüziri.
Xunabi-sirişk edüb rəvanə,
Gövhər dağudurdi ruyi-kanə.
Ağlardı anub o təngi-halın,
Bilməz necəsi olan məalın.
Gördü çü o quli-div surət,
Ol vəhşət ona verür küdurət,
Yetməz ona iztirabdən kam,
Səbr eyləyübən buraxdı ibram.
Dedi neçə gün qılam müdara,
Şayəd kəm ola bu suzü sövda,
Mə’zurdur ol sənəm bu halə,
Dil verməsə gər bu qilü qalə,
Ayrılmış atadənü anadən,
Qət’ olmuş ümidi aşinadən.
Getdükdə çü qaim ola ülfət,
Ülfət o gün olmağa nə minnət?..
Görsə ölü Vərqavü Hümami,
Püxtə ola ol xəyali-xami.
Aşiq necə olsa səngi-xara,
Mə’şuqə yəqin qılar müdara.

Artux ona qılmayub cəfani,
Tapşurdi əminə yenlə ani.
Əmr içdi neçə qədəh peyapey,
Saldı ani xakə hiddəti-mey,
Məst oldu şərabü düşdi saqi,
Hər kim dutdi rəhi-visaqi.
Gülşayi-həriqi-nari-hirman,
Olmuş o bəla içində nalan,
Yığlardı görüb o macərani,
Ta uyxuladı nigahbani.
Çün gözlərə xab urdi mismar,
Əncüm sifəti o qaldı bidar.
Gəh taleyidən edər şikayət,
Gəh öz-özünə qılar hekayət.
Gəh pənd verür dili-figarə,
Gəh dərd deyər xəyali-yarə.
Söylərdi ki, ey tən içrə canım
Vey qüvvəti-cismi-natəvanım.
Göz nurivü sinəmin süruri,
Yadın qəmu xatirim hüzuri,
Gəl gör nə bəlayeəm giriftar
Əlhəq mənə rəhmdür səzavar,
Ol pa ki çəkərdi güldən azar,
Zəncirə olupdurur giriftar.
Ol əl kona[1] düşsə sayeyi-cam,
Zahir olur idi rənci-cümmam,
Bu dünara bağludur qəfayə,
Düşmüş o şigəncədin cəfayə.
Gəl bir xəbər al bu cismü təndin,
Azürdeyi-tari-pirəhəndin.
Dil necə dəxi verə sükunə,
Bağlu görə öznü bü sütunə.
Ol fərqə hərir edərdi maliş,
Duş olmuş ona bu gecə baliş.

[1] *Kona* – ki ona

Ol gərdənə vəqti-eyşü gəlubənd
Zəncirlər oldu bari-gərdən,
Çulqamış o gənci mari-ahən.
Bilmən nədurur sənin xəyalın,
Bu dünara bəhcətü məlalın.
Dur rəf' edə gör bu suzü dərdi,
Zahir qıluban nişani mərdi.
Yatmış hala təmam yaği,
Yetgil mənə, ey gözüm çirağı.
Bulmaq diləsən məni-zəlili,
Ahim şərəri qılur dəlili.
Məndən sənə dərd qılmaq izhar,
Dur yatma əgər məhəbbətin var.
Gəlgil diləyib mədəd xudadən,
Qurtar məni kami-əjdəhadən.
Bu bir qəzəli münasib ol mah,
Saət-saət oxur çəküb ah.

## QƏZƏL

Əldən aldun, ey fələk, nəqdi vüsali-yarımı,
Eylədün ümman sirişki-çeşmi-gövhərbarımı.
Ta göz açdım badə verdin xərməni-namusü nəng,
Bixəbər zülm atəşin yaxdı mətai-arımı.
Nola, ey bidadgər qılsan tərəhhüm halıma.
Qəmlovam bu dünara yetür mənə qəmxarımı
Surəti-halımnı qılgil cümləgi cananə ərz,
Başın üçün, ey səba, görməkdə sən bazarımı.
Demə oldum bivəfa dur tazə qılgil imtəhan
Aç vərəq bir-bir oxugil nüsxeyi-girdarımı.
Hiddəti-düşmən ənisü şiddəti-bəndim cəlis,
Ey bəgim, gəl üstümə görgil nədür azarımı,
Dutsan iqrarın əgər, təmkin verəm əğyarına,
Qoyman əldən çün Məsihi daməni-iqrarımı.

## BU, QURTARMAQDURUR VƏRQA NİGARIN DƏSTİ-Ə'DADƏN

Ol katibi-varidati-adəm,
Ol mümliyi-vaqiati-aləm,
Acmış dəri-mə'dəni-rəvayət,
Ravisidin eyləmiş hekayət.
Çün cəngdin ol hümami-dindar,
Şam oldu qayıtdı yurda naçar.
Alub qıldı vüzu nəmazın,
Ol həzrətə bağladı niyazın.
Artmış tənü canə iştiyaqi,
Kim tərk edə aləmi-nifaqi.
Miğbərlərə nəsb edüb qəravil,
Ordu içində tiküb yəsavil,
Olmiyə gecə o qövmi-nəsnas,
Şəbxun ura cümlə saxladı pas.
Hər kimsənə bəkləyüb kəmini,
Dəgşürmədi olduğu zəmini.
Vərqayi-həzin anardı yarın,
Kəsmiş o xəyal anın qərarın.
Şövq eylədi zur o biqərarə,
Sövda ani çəkdi bir kənarə.
Der tə'n ilə: – Ey əsiri-hicran,
Dur, olma ğəriqi-bəhri-hirman,
Bağla belinə nitaqi-qeyrət,
Dut gəl yüzünə təriqi-cür'ət.
Bəsdür olmaq fəraq əsiri,
Algil ələ kari-bəbrü şiri.
İç badeyi-şövqdən gülabi,
Başdan yerə qoy xümari-xabi.
Ey dövləti-mülk, yatma zinhar,
Dövlət ola yeg həmişə bidar.
Aldanma gələn xəyalü xabə,
Dur sargil ayağə paytabə.
Gir şəbrov tək siyəh libasə,
Qoy ləşkərü tərk qıl əsasə.

Dur hirzi-təvəkkülü sipər qıl,
Orduyi-müxalifə güzər qıl.
Şayəd sənə tale edə yari,
Asan salasan ələ nigari.
Həm hasil ola könül muradın,
Mənşur ola həm ərəbdə adın.
Hər kim ala canına cəfani,
Lazım görə ruyi-müddəani.
Gər sə'yi yetişməsə muradə,
Mə'zur olacaqdur ol aradə.
Bu söz ona saldı atəşi-əzm,
Ol əzm könüldə eylədi cəzm.
Səbr eylədi sakin oldu ləşkər,
Durdu ayağa o mah peykər.
Düzdü üzə vəz'i-şəbrəvanə,
Pünhan o yana olub rəvanə.
Duymadı o hali yarü əğyar,
Yox kimsə o şivədin xəbərdar
Yel tək durub ol səri' seyran,
Orduyi-əduyə girdi pünhan.
Çadır-çadır gəzərdi ol şah,
İqbali rəfiqü bəxti həmrah.
Şayəd ki, bula məkani-yari,
Qəmgininin ola qəmgüsari.
Hər çadıra kim güzar edərdi,
Casusluq eyləyüb gedərdi.
Gəzməkdə yetişdi rahi-Vərqa,
Ol çadıra konda[1] idi Gülşa.
Ol vəqtdə şe'r oxudu yari,
Vərqanı anub qılardı zari.
Bəxt ona yetürdi müddəasın,
Eşitdi nigarının sədasın.
Gördi irəlü gedüb nihani,
Uyxudə qəmu nigahbani.
Yox-yox qələtəm ki, çeşmi-ə'da,
Ta görmiyə olmuş idi ə'ma.

---

[1] Konda – ki onda

Çün çadıra girdi ol səbükseyr,
Gördü ki, yox anda yardin qeyr.
Zülmətdə göründi abi-heyvan,
Sərsəbz oluban nihali-hirman,
Gülşa dəxi baxdı, gördi yarın,
Tanıdı o rahəti-rəvanın.
Açdı ağız anda ahü zarə,
Ta şərh edə dərdin ol nigarə,
Ahətsə o şiri-bəbr ahəng,
Gülşayə dedi ki, vəqtdür təng.
Olmuya ədu ola xəbərdar,
Çıqmaq bizə dəxi ol düşvar.
Salub oda daneyi-sepəndin,
Açdı o qəzalə paybəndin.
Can etməgi yarının nisari,
Asan ələ saldı vəsli-yari.
Tişrə çıqub ol iki yeganə,
Mərdanə ətək çalub miyanə,
Yatmaqda o cəm'i-pasibani,
Bildilər özə qənimət ani.
Bu tiğ çalub, o, zərbi-xəncər,
Üç yüz təndin qopardılar sər.
Olduqda üqabü çərx həmbal,
Ol əzmdə qanə batdı cəngal.
Ta vermiyə əksi-nəqş tədbir,
Tez çıxdılar andan ol iki şir.
Verdi əl-ələ ol iki həmraz,
Bizəbti-rəqibü tə'ni-qəmmaz.
Əğyarsız ol iki vəfadar,
Bir-birə qılardı dərdin izhar.
Hər bir-birin oxuyar kitabın,
Leyk açmaz üzə zəxirə babın.
Vərqadur əgər o gecə Gülşa,
Bir-birinə eyləyüb təmaşa.
Məsdud idi çün dərdi-iradə.
Göz açmadı heç bir ol muradə.

Bülbül gülü görsə bitəkəllüf,
Yox qeyr təfərrücə təsərrüf.
Ol iki şəhi-səriri-iffət,
Dutdular üzə təriqi-ismət.
Gahi o muna durar müqabil,
Gəh bu qol ona edər həmail.
Şərbət bu ona verür ləbindən,
Gəh ol muna busə qəbğəbindən.
Gər girsə bu qəmzədin kəmanə,
Ol şivəsini salur miyanə.
Bu ona baxub gedər qərari,
Eylər o muna baxanda zari.
Gah ol birisi gedər özündən,
Gəh yox xəbəri birin sözündən.
Gəh bir-birinə olub həmağuş
Olurdu ikisi dəxi mədhuş.
Qafil oları qılub o halət.
Ta keçdi bu rəsmə neçə saət.
Axir yetişüb rümuzi-ilham,
Göstərdi təriqü qıldı ə'lam.
Key süxteyi-məhəbbətü həmm
Ol dərdə degil dəva bu mərhəm.
Tez təprənübən çıxın aradən
Qurtula görün qəmu bəladən.
Yol yeriyübən kəskin məsafət,
Var onda hənuz xovfü afət.
Səhl ola bu bir zəman vüsali,
Salın ələ qürbi-mahü sali.
Əlhəq necə ola qürbə xürsənd,
Aşiq kola[1] vəslə manevü bənd,
Çün sazə düzüldi tari-qanun,
Pəs ola iki bir-birinə məftun.
Ta görmiyələr aradə afət,
Qə't eylədilər durub məsafət.
Tavusü üqabə rüx zəmanə,

---
[1] *Kola* – ki ola

Döndərdi, yetürdi aşiyanə
Düşdi o cəmaət içrə qövğa
Gülşani varub gətirdi Vərqa.
Kim göz açdı o məh cəbinə,
Döndərdi səlami afərinə.
Əzbəs saçılub, dua nisari,
İtürdi yazan mələk şümari.
Vərqa o gecə şükuftə xatir,
Can hazir ona, o canə nazir.
Çaldılar aradə kusi-şadi,
Ta anladi ləşkəri-iadi.
Aya dedilər bu nə əməldür,
Şad olmaqla bu nəçük məhəldür,
Məhbub əsirü xanə qarət,
Yox eyşə əsaseyi-imarət,
Guya ki, bu gecə tazə ləşkər,
Yetmiş, vermiş o bəzmə zivər.
Əlbəttə, əbəs degil bu şadi,
Bu sur verür nəvidi-yadi.
Axir duydi təmam ləşkər,
Gülşa işin ol gecə sərasər.
Pəs Əmri-pəlidi çarü naçar,
Ol vaqiədən qılub xəbərdar,
Eşitdi çü Əmr o macərani,
Həsrət oduna tutuşdi cani.
Gördi çıxmış şikar əlindən,
Qurtulmuş o gül bu xar əlindən.
Getmiş yelə xərməni-xəyali,
Qalmış ol arada dəst xali.
Bər dökmiş o nəxli-müddəasi,
Zaye'qəmu çəkdügi cəfasi.
Təqsirinə var həzar heyrət,
Hər heyrətə səd həzar həsrət.
Səbr etdi o gecə ta səhərgah,
Qəm yarü rəfiqü qüssə həmrah.
Bəxt aldı çü verdügi xəraci,
Səbr eyləməyə nədür əlaci.

## BU, QÖVĞADƏ HÜMAMIN İÇDÜGİ ŞƏHDİ-ŞƏHADƏTDÜR

Çün aləmə doğdi bizeyi-nur,
Afaqə dağıldı gerdi-gafur.
Zağ oldu nihan, göründi tavus,
Şəm' oldu əyan yaşundi fanus.
Meydanə girüb xürusi-cəngi,
Açdı ələmi-dümi-pələngi.
Təprəndi yerindən iki ləşkər,
Ləşkər demə ki bəhri-ovxər.
Avazi-fəğani-kusi-zərrin,
Ol cəm'ə verürdi mərg təlqin.
Hər qövmdə bu idi əqidə,
Kim fəthdin ol olur güzidə.
Şah əvvəl qıldı cəngə ahəng,
Ahəngə düzüb səlasili-cəng.
Durdu qıldı düzüb silahi,
Arəstə qəlbivü cinahi.
Seydinə açub üqab bali,
Tib eylədi ləşkərə hilali.
Rəzmə pəhi-gicgə dutdı Vərqa,
Naçar o biqərari-qovğa,
Verməzdi hümam cəngə rüxsət,
Bu mən' indi ona dami-möhnət.
Gürdan ona dutdi rahi-məqsəd,
Yə'cuci-əduyə bağlayub səd.
Geymiş qamusu libasi-cövşən,
Fuladə batub çü kani-ahən.
Qoymuş başa cümlə xudi-fulad,
Qan tökməgə hər birisi cəllad.
Kim həlqələmiş kəməndi-piçan.
Almış ələ gürzü cəngə qalxan.
Kim almış əlinə mar nizə,
Ram eyləmiş əf'yi-sitizə.
Almış ələ bir xədəngi-dilduz,
Çəkmiş biri tiği-xanüman suz.

Gərdi-səmi-badpayi-navərd,
Geydürdi cəhanə cübbeyi-gərd.
Ol ərsədə pəs hümami-nami,
Sıçratdı səməndi-tündgami.
Səbr etmədi gördi çün qənimi,
Qərz almağa gözlədi qərimi.
Ol Əmr dəxi düzüb sipahin,
Durmuş gözədüb hümam rahin.
Meydanda çü xuki-tir-xürdə,
Xar olmiş o rəxneyi-nəbərdə,
Əgninə geyüb libasi-matəm,
Tə'rizdə rəcəz oxur dəmadəm.
Nisbət özünə verüb şücaət,
Öz-özə satub alur bəzaət.
Fəryad edər, ey cəmaəti-dun,
Əqlə kəmü rayü fikrə məğbun.
Aya nədən uydunuz məhalə,
Durub özü saldunuz vəbalə
Gər mərdsiz eyləyin səbati,
Meydanə salın inani-ati.
Siz xarə, bu qövmi-səng xarə,
Saçsın niyə yenglədin şərarə,
Töküb meyü sınduram o cami,
Vərqavü hilal ilə Hümami.
Bir-bir oları qılam giriftar.
Salam ələ yenglə daməni-yar.
Hərçənd ki, canə düşmənimdür,
Ta canım ola o can mənimdür.
Bel bağlaman ol silahü sazə,
Var fərq o kəbk ilə bu bazə,
Adabi-cidaleyəm müsəlləm,
Məndin yeyə rəm hüjəbrü zeyğəm.
Mən rəzmdə Rüstəmi-zəmanəm,
Mərrixi-səmayə həminanəm.
Əl ursam əgər kəmanü kişə
Durmaz yüzümə hər bozi-bişə.
Bu rəsmə minüb səməndi-lafə,

At sürdi o ərseyi-güzafə
Hər yan duruban edərdi cövlan,
İstərdi özinə mərdi-meydan.
Nagah yetişdi baz açub bal,
Seyd etməgə yaymış ona çəngal.
Şir eylədi həmlə ol gürazə,
Ta ruyi-sinanə verə qazə.
Çün anladı Əmr o macərani,
Rədd eylədi zərbəti-sinani.
Növbət ona verdi çün sitizə,
Qıldı şəhə bəs həvalə nizə.
Göstərdi çü taleyi büləndi,
Rəf eylədi şəhdin ol gəzəndi.
Fürsət bulub eylədi təkapu,
İldurdi əduyə nişi-suku.
Gördü anı Əmri-zişt girdar,
Qalmadı əlində hiylədin bar.
Ta urmiyə ilk mari-əf'i,
Vacib görünür əlacü dəf'i.
Vəhm arturub ona iztirari,
Əl urdi dutub gəluyi-mari.
Bin sə'y ilə qıldı zuri-bihəd,
Ol nişi özündən eylədi rəd.
Müşkül özə gördü ol bəlani,
Rədd etməgi qoymadı cidani.
Alım dedi saldı piçü tabə,
Tab etmədi nizə ol əzabə.
Yox verməgü almağında çarə,
Oldu neyi-nizə parə-parə.
Şəh nizədən oldu dəsti-xali,
Düşmən ona verməyüb məcali,
Qıldı ona pəs həvalə nizə,
Bənd etdi sinan o nagürizə.
Çün gördü Hümam o madi-xunxar,
Ol gənc təsərrüfinədür yar.
Çaldı ona tiği-bərq razi,
Qət' eylədi külbeyi-gürazi.

Çün düşdi neyistanə atəş,
Durdu ol iki olub kəmankəş.
Qövsi-qüzeh oldu aşkarə,
Dökdü yerə bərqdin şərarə.
Bir-birini qıldı tirbaran,
Gülbünlərə qönçə oldu peykan.
Oldi tən'i-ol iki əcəlgir,
Çün cövşəni-xar püşt pür tir.
Çeşmi-zireh etdi xunfəşani,
Göstərdi cərahəti-nihani.
Çün cə'bədin oldu tir xali,
Şəmşirə yetürdilər cidali.
Urdi ol iki şücai-meydan,
Bir-birinə zəxmlər nümayan.
Tən parələnüb söküldi cövşən,
Can çıxmaq içün açıldı rövzən.
Çeşmi-zireh oldu dami-pürxun.
Tənlər içidə nəhəngi-Ceyhun,
Ta zöhr çalışdı iki xuni,
Heç bir-birin olmadı zəbuni.
Durmuş rəhi-intizarə ləşkər,
Ta kam ola qansiyə müyəssər.
Gördü muni anladı xəlaiq,
Heç biri degil birinə faiq.
Gər belə keçə bir-iki saət,
Can edə ol iki mərgə qarət.
Düşdü oda ləşkərivü əqvam,
Fikr eylədilər munu sərəncam.
Təğyir verüb olan qərarə,
Hər kim ala şahını kənarə.
Leyk anlamayub işin məalin,
Duymadı biri-birin xəyalin.
Bu fikrə iki tərəfdən ahəng,
Olduqda quruldi yenlədin cəng.
Gürdani-ərəb olub səbükxiz,
Ol arayə oldular inan riz.
Rəf' eylədilər rüsumi-mə'va,

Bir-birə qarışdı iki dərya,
Hər qövm qılub birə himayət,
Pərçəm açulub tikildi rayət.
Bir-birə yetüb o seyli-hamun,
Adab bozuldi, sındı qanun.
Kim çəkdi qılıc, götürdi qalxan,
Yusif çıxıban, buşandı zindan.
Kim tirü kəmanə yazdı bazu,
Kim gürz ilə oldu həmtərazu,
Kim nizəyə saldı zuri-pəncə,
Kim xəncərə eylədi şikəncə,
Ol rəzmi-bəladə zərbi-şəmşir,
Bir bərq idi xanə suzü cangir.
Əzbəs ki, atıldı tirü zubin,
Gög oldu zəmin səqfi-çubin.
Ta uçmuya ruh görgəc azar,
Damü qəfəs oldu səhmi-ədvar.
Başlar kəsilüb çözüldi ləşkər,
Ləşkər bozulub yıxıldı peykər.
Canə əcəl eyləmiş məhəbbət,
Cəhd ilə dilər vüsalə fürsət.
Vərqa atası qəmilə bimar,
Gərm etdi cidalə sazi-bikar.
Tiğin kimə eyləsə həvalə,
Verür ona mərgdin nəvalə.
Kimə yetə əf’iyi-sinani,
İlk andan alur hədiyyə cani.
Sayə kiminə salur üqabi,
Görməz dəxi nuri-aftabi.
Kimə yetə sərsəri-əmudi,
Xaki-rəh olur anun vücudi.
Açanda o həlqeyi-kəməndi,
On şirin olurdu dəstbəndi.
Bu rəsm ilə ol yəli-cəvanbəxt,
Ol rəzmdə qıldı kuşeşi-səxt.
Hər yan təpüb ol hüjəbri-bibak,
Başlar kəsüb etdi sinələr çak.

Miğfər yerə saldı, sökdi cövşən,
Qopardı qiyamət ol təhəmtən.
Cəhd eylədi zur edüb silahə,
Ta zöhri yetürdi ol rəvahə.
Həm özü götürmüş idi yarə,
Həm dərdinə eyləmişdi çarə,
Yüz baş kəsubən yüzə cərahət,
Urmuş idi göstərüb şücaət.
Gürdani-Büneyni-Şeybə əksər,
Baş saxlayuban qopardılar sər.
Etdi əcəl onlara tərəhhüm,
Zülmatə ziyasın eylədi güm.
Əncamə yetüb zəmani-tufan
Aramişə yetdi mövci-ümman.
Ayrıldı pəs ol sipahi-xunxar,
Döndi gerü yurda çarü naçar.
Çün mənzilə saldı bari-məhmil,
Ol bar ilə rövşən oldu mənzil.
Şəb ləşkər edüb ədu şümarə,
Min olmuş idi vəli se barə.
Ölmüşdü bu qövmdən beş yüz ər,
Hər birisi bir guruhə sərvər.
Yetmişdi hümami-namdarə,
Yetmiş yedi yerdə zəxmü yarə.
Ol gecədə kəsrəti-cərahət,
Sundu ona şərbəti-şəhadət.
Çün anladı əsli-müddəani,
Dutdu rəhi-kişvəri-bəqani.
Qıldı yelə dutduqi şikari,
Asudəlik oldu karü bari.
Bu dövr ilədür cəhani-məkkar,
Mehmankeş olupdurur bu qəddar.
Kim qondu ona, yedürdi nanın,
Ol nan əvəzinə aldı canın.
Yetdükdə o qövmə bu müsibət,
Çıxdı gögə dudi-daği-həsrət.
Quruldi əza, dutuldi matəm,
Güm oldu nişan, bozuldi xatəm.

Liyk etmədilər küdurət izhar,
Düşmənləri olmasın xəbərdar.
Pünhan edüb atəşi-dəruni,
Ta xəsmə duyulmasın zəbuni.
Ol gecədə düşdügü məlalə,
Döndərdi hilali çün hilalə.

## BU, VƏRQANIN ATASI FÖVTDİN AHÜ FƏĞANİDÜR

Vərqayi-həzin çü gördi ani,
Divarının uçdi püştbani.
Bildi ki, düşüb əsasi-rahət.
Görməz dəxi sayeyi-fərağət.
Duydu muni ol qəmə giriftar,
Açdı ona didə çeşmi-idbar.
Bu aşiqə əvvəli-bəladür,
Şad olmaqı aşiqin xətadür.
Bin suz ilə ol bəla düçari,
Eylərdi fəğan, edərdi zari.
Əldən getdükdə şahi anın,
Nəzlini kəm etdi rahi anın.
Yığlar özünə anub atasın,
İnlər dəhrin görüb cəfasın.
Çün kan savururdi başə əsləb,
Babasını eyləyüb müxatəb,
Söylərdi ki, ey mənim pənahım,
Gümrahlığımda ruyi-rahım.
Tənha qoyuban bu binəvani,
Getdün mənə eyləyüb cəfani.
Yetsə mənə dəhrdin həqarət,
Dəxi kimə eyləyim şikayət.
Kimə qaçayım hücumi-qəmdin,
Ya xatirə yetişən ələmdin.
Dərdi-dilim eyləyəndə tüğyan,
Səndin görünürdü dərdə dərman.

Ey dövləti-bəxtimin səfası,
Vey kövkəbi-taleim ziyası.
Noldu məni xarü zar qoydun,
Tən xəstəvü dilfigar qoydun.
Ey kaş ki, qət’ oleydi ruzi,
Görmeydi könül bu dərdü suzi.
Məndin sənə yetdi de nə külfət?
Kəsdün duruban təriqi-ülfət?
Həmrahlığımdan etmə ikrah,
Qılgil məni həm özünə həmrah.
Ey əbr, götürmə sayə məndin,
Baran verü kəsmə vayə məndin.
Noldu degil ol əlaqeyi-dil,
Qoydun məni dutdun özgə mənzil.
Məndin döndü məgər məzacın,
Bu fikrilə eylədün əlacın.
Qıl başın içün məni xəbərdar,
Təqsirə tədarük eyləyim yar.
Şəb ta səhər ol əza rəsidə,
Suz ilə tökərdi abi-didə.
Ol atəşə gəh əmu saçub ab
Dilculiq edərdi, gah əhbab.
Gahi Gülşa qılub təcəlli,
Verür ona dəmbədəm təsəlli.

## ƏMR ÖLMƏGİNİ BƏYAN EDƏR BU

Ravi usanub bu göftgudin,
Vermiş xəbər axiri-ədudin.
Çün cəngdə ol hümami-dindar,
Urmuşdu hərifə zəxmi-büsyar.
Yıxmış bürcün, söküb əsasın,
Kəsmiş cigərin bozub həvasın.

Qalmamış idi olan hüzuri,
Uçmuş əqli, gedüb şüuri.
Asayişə çün verildi rüxsət,
Aramiş içün göründi fürsət.
Həmrahlıq eyləyüb əşirə,
Ta Əmru yetürdilər sərirə.
Hərçənd həkim edər müdava,
Şayəd göz aça o quli-səhra,
Döndərdi məniş əlacdən ru,
Zəhr oldu məzacə nuşdaru.
Artdı tənü canə iztirabi,
Gördükdə müvəkkili-əzabi.
Bin zəcr ilə ol iqab əsiri,
Can verdivü gözlədi səiri.
Yox əldə əlaci-naxoşü xoş,
Çəkdi üzünə ləhabi-atəş.
Tən eylədi tö'mə marü murə,
Can dağladı atəşi-səburə.
Keçmiş gecədin bir-iki saət,
Kim Əmri-ədu olundu qarət.
Ləşkər qamu anda batdı yasə,
Verdilər o dünara əsasə.
Yekdil olub etdilər qərari,
Dutmaq üzə yeg rəhi-fərari,
Fikr eylədilər ki, xəsmi-xunxar,
Bu şivədən olsalar xəbərdar,
Qurtulmaq aradan ola müşkil,
Düşmən bizə mülkü cavü mənzil.
Bilməzlər idi işin hümamın,
Fövt olmağını o niknamın.
Götürmək içün büsati-çalak,
Cəmmazələr oldu rovrovi-xak,
Casusi-Büneyni-Şeybə hali,
Ta duya o xəsmi-laübali,
Çıxmışlar idi səbük aradən,
Qaçmışlar o kami-əjdəhadən.

## BU, BÜNYADİ-SİTƏMDÜR YENGLƏDİN VƏRQAYİ-MƏHZUNƏ

Qafil biri-birdən iki ləşkər,
Göstərdi tilayə xosrovi-xur.
Çün anladı ol Hilalü Vərqa,
Əmr ölmüşü ol güruhi-ə'da
Qaçmış qəmusu kəsib mənazil,
İlğar ilə yetməz ona acil.
Çün qalmadı durməgə bəhanə,
Dutdular olar təriqi-xanə.
Matəmzədə ləşkəri-təmami,
Ta evə yetürdilər hümami.
Tərtib edübən anın cəhazın,
Qüslün verüb etdilər nəmazın.
Gizləndügidin o gənc kanə,
Fəxr etdi səmayə gurxanə.
Çün ol xəbər oldu amə zahir,
Yığıldı əkabirü əsağir.
Bu surətə nəqşi-xətti-pərgar,
Tə'ziyyətə qıldı təhniyət yar.
Kim gördi deyüb xəm etdi tarək,
Sən sağ olü mənsəbin mübarək.
Dəhr aldı hümamdən xəraci,
Dapşurdi hilalə təxtü taci.
Dövri-fələgin budur mədari,
İqraridə yoqdurur qərari.
Təxtə biri çıqərur səbahi,
Salur ani təxtiyə rəvahi.
Dünya dedügin bir əjdəhadur,
Düşmən ani bilməmək xətadur.
Əsbabi-cəhan nəkaldur bənd,
Aqil necə ola bəndə xürsənd?!
Vərqayi-siyahbəxtü bədruz,
Yedi yenə tazə zəxmi-dilsuz.
Öldi bozulub qalan əsasi,
Atasi əzasidə anasi,

Əsbab gedüb bozuldi lanə,
Ərbab gedüb yıxıldı xanə.
Qondi əmuyə hümayi-dövlət,
Qaldı muna dərdü daği-həsrət.
Öldü ata-anə, getdi mali,
Ol aradə qaldı dəst xali.
Oldu ona zirdəsti faiq.
Kəm oldu təvəccöhi-xəlaiq.
Naçizlik etdi çoxları xar,
Xəlq içrə əzizdür bu mürdar.
Həqqa ki yetişsə dəst təngi,
Rubah edə bəbrivü pələngi,
Gər bir igidün yox olsa mali,
İsa ola nəqsdür kəmali,
Gər tazə cul eyləsən himarə,
Məqbul ola çeşmi-e'tibarə.
Vərqa yaxılub o tarə düşdü,
Naçiz olub iztirarə düşdü.
Əmma qəm ona edəndə tüğyan,
Gülşani görüb olurdu şadan.
Cananı çıqarmaq ol aradən,
Qurtarmaq o kami-əjdəhadən.
Banu Qəmər olmuş idi razi,
Rəf olmuş idi o mən'i-mazi.
Seyd etmədügi görüb qəzalə,
Döndərdi o şiri çün xəlalə.
Hicran qəmi gərçi bir bəladur,
Üşşaqə bu bir əcəb cəfadur.
Gül verməgə mane ola xari,
Seyr eyləməgində novbəhari.
Sövda doluban sərü dimağə,
Bəs durdu əlac içün ayağə.
Çağırdı bir-iki kədxudani,
İzhar edübən qəmi-nihani.
Şərh eylədi cümlə üzrü əhval.
Gülşa tələbinə qıldı irsal.

Çün gəldi bu dərdi-dil bəyanə,
Gülşa anası dutub kəranə.
Ol naqisə durdu saz edüb cəng,
Əvvəlki məqamə düzdi ahəng.
Der: – Qarətə getdi cahü mali,
Yox əldə bu gün əvəlki hali.
Ruzi bədü haləti bətərdür,
Avarəvü xarü dərbədərdür.
Qılmış ona bəxti ru siyahi,
Bozmuş nə ki, var dəstgahi.
Kim qadir ola bu gün cihazə,
Gülşa yüzinə durar nəmazə.
Kim verməsə istəgimcə mali,
Bihudə bişirməsin xəyali.
Gülşa vəsli nə rayigandur,
Bu rəmzə nə hacəti-bəyandur?!
Ölmüş anın atasi, anasi,
Qarətzədə xişü əqrəbasi.
Yoxdur mənə dəxi ol qədər mal,
Ta kim düzəyim zərurəti-hal.
Bü fikr ona hali-narəvadur,
Gər olur isə yəqin xətadur!
Göndərməsə yazılan cihazi,
Verilməz ona degil bu bazi.
Ya mal düzər bu şüğli, ya cəbr,
Ya ruz gərək bu işə, ya səbr.
Çox qıldı Hilal ona nəsihət,
Gördi ki, səmər verür fəzihət.
Ol daşə nəsihət eyləməz kar,
Döndərdi cəvab səbrə naçar.
Vərqa eşidüb qəmu cəvabi,
Banu Qəmər eyləyən itabi.
Gül hicr düzüb, şəkib bülbül,
Dutdi yüzə şiveyi-təhəmmül.
Cəm olməgi səbrü eşq heyhat,
Ta xeyrə durur nəticə afat.

## VİDA EDÜB YƏMƏN SUYİNƏ ƏZMİDÜR BU, VƏRQANIN

Saqi, qanı kövkəbi-yəmani,
Müştaq onadür bu lə'l kani.
Dur başın içün gətür zühurə,
Qoyma məni mübtəla qüsurə.
Sungil mənə badeyi-rəhiqi,
Qıl cöhreyi-kahimi əqiqi.
Tarını düzüb bu ruyi-kanə,
Zinət verəyim ruxi-bəyanə.
Səndin mənə salmaq aftabi,
Məndin göstərmək abü tabi.
Sərrafi-məcalisi-məani,
Bu növ ilə qıldı nüktədani.
Vərqayi-həzinü dil pərişan,
Oldu öz işində zarü heyran.
Səbr etməgə qalmadı qərari,
Yox kisədə nəqdi-vəsli-yari.
Zira ki, ona əlindəki mal,
Olmazdı kilidi-babi-amal.
Himmət diləməz riayəti-qeyr,
Gəlməz gözünə bəzaəti-qeyr.
Bir gün durub ol xücəstə girdar,
Ətrafə salub bəridi-əfkar.
Kimdən görünə anın güşadi,
Ya kim aça ol dəri-muradi.
Yetişdi süruşi-huşi anın,
Hər babdə pərdəpuşi anın.
Dedi ona: – Ey həzar dəstan,
Dilxəsteyi-xari-bağü bostan.
Əcz etmə dəxi hilalü mahə,
Dur yetür özün Səlim şahə.
Ol sayeyi-rəhməti-ilahi
Mülki-Yəmənin durur pənahi.
Xalu sanadur o sahibi-təxt,
İqbalı rəfiqü yaridür bəxt.

Nəğğa' özü, sayəsi hümayun,
Hatəm kərəmindən aldı qanun.
Gördükdə anı bitər muradın,
Bağla bu kəlamə e'tiqadın.
İstər səni daim ol sərəfraz,
Vacibdür o tarə düzməgin saz.
Xatirdə sənin xəyalü fikrin,
Ağzında müdam mədhü zikrin.
Duysa bu müsibəti əzani,
Kefiyyəti-cəngü macərani.
Əlbəttə, durub o bəhri-zaxir,
Bir firk səninçün eylər axir.
Vərqa çü bu razə oldu mülhəm,
İlham ona açdı babi-mübhəm.
Filhal düzüb o sazi-rahi,
Pəs getdi görüb hilalü mahi.
Min üzr ilə dedi ol yeganə,
Sizsiz mənə imdi atə-anə.
Dövrümə müxalif oldu dövran,
Qarətzədəliq qılub pərişan.
Yox bir yerə munda ruyi-rahim,
Qaim ona ola püşti-cahim,
Sizdən mənə yetmədi himayət,
Yox faidə qılməgim şikayət.
Meylim bu, gedəm Səlim şahə,
Salam özümü o bargahə.
Hala qəmu xəlq malədür yar,
Bimalə bu gün yox oldu miqdar.
Gördüm sizə həm o müddəadur,
Bu iqdəyə ol girehgüşadur.
Gər olsa rəfiq feyzi-bari,
Tale mənə qılsa qəmküsari.
Rəf ola küdurəti-xəcalət,
Şad edə məni hüsuli-hacət.
Varmaq mənədür bu gün zəruri,
Namusa xələl durur səburi.
Vacib sizi eyləmək xəbərdar,
Getdim mənə himmət eyləyin yar.

Bir şərt edərəm sizə nihani,
Ta gəlməgimin ola nişani,
Altı aya dək nəbudü budəm,
Mə'lum olunur ziyanü sudəm.
Səbr eyləyübən bu intizarə,
Ol müddəti eyləyün şümarə.
Gər bazuma tö'mə versə iqbal,
Bu ovcə açam yenə pərü bal.
Bər versə əgər nihali-məqsud,
İnşallah ki, qayıdam zud.
Gər ruzi-ümidim aftabi.
Rəf etmiyə zülməti-hicabi.
Çün vermiyə əl fərağəti-dil,
Dutmaq dəxi yüz bu rahə müşkil.
Gəlməz dəxi ol göhər bu kanə,
Avarə olub düşər cəhanə.
Çün olmiyə bəxtimin nəvidi,
Siz dəxi durub kəsin ümidi.
Ol gövhərə kim ola xiridar,
Verün o gün ixtiyarınız var.
Yazılmış əgər bu tərz təqdir,
Mümkünmüdür olmağında təğyir.
Yox kimin əlindən eyləyəm dad,
Sizdən mənədür yetən bu bidad.
Munu deyüb ol sitəm rəsidə,
Çıxdı tökübən sirişki-didə,
Çağırdı pəs ol pəri xisali,
Ta bir də görə rüxi-vüsali.
Gəldükdə hüzurə ol səmənbər,
Gördükdə ani qəmə təvangər,
Rəf' eylədi pərdeyi-müdara,
Pünhan qəmin etdi aşkara.
Dedi ona, ey mənim rəvanım,
Vey maliki-mülki-cismü canım
Yox dərdi-dərunimə nəhayət,
Qansı biridin açım hekayət.
Gördün ola neylədi zəmanə,
Yalquz məni qoydu atə-anə.

Şəbxuni-ədu yetürdü bidad,
Oldu qəmu malü cah bərbad.
Əm qılmadı əhdinə vəfani,
Anan durub eylədi cəfani.
Mənsəb gedübən pozuldi ləşkər,
Yanmadı çirağü sövdi əxgər.
Can içmədi şərbəti-vüsalın,
Tən bulmadı qürbi-ittisalın.
Avarəligə verüb qərari,
Min bə’d mənü fəğanü zari.
Qorxum bu durur ki, zilli-idbar.
Hicrə məni eyləyə giriftar
Yoqdur çü təmizi bağbanın,
Bu bülbülə cövri çoqdur anın.
Sala durub ol hərif ayağə,
Bülbül yerinə zəğən bu bağə.
Əmma sənə çoqdur e’tiqadım,
Üzülmiyə rişteyi-muradım.
Gər bülbül irağ olursa güldən,
Gözdən gedə, getmiyə könüldən.
Unutmiyəsən məni figari,
Tərk etmiyəsən təriqi-yari.
Qayim oluban rəhi-vəfadə,
İncimiyəsən çəkən cəfadə.
Yetdi mənə nəkbəti-ziyanəm,
Yoldu pərü pozdu aşiyanım.
Bidadına eyləyüb nişanə,
Çəkdi xəti-neyl o xanümanə.
Getdim mən əgər, sən imdi sağ ol,
Asib zəmanədin fərağ ol.
Gər var o qərarının qərari,
Xərc eyləmə nəqdi-e’tibari.
Dut guşeyi-səbrü saxla rahim,
Gözlə məni bozma dəstgahim,
Ömrüm ola gər yetəm hüzurə,
Səbr ilə bu firqəti-zərurə.
Bu rəsmə durub niyazü razə,
Dərd ilə bu şeri düzdü sazə.

## QƏZƏL

Mənəm ki, dərdə kan oldum sirişkim lə'li-nabından,
Məhəbbət nəxlni sərsəbz qıldım didə abından.
Dəbistani-məlalətdə verür hər ləhzə ləb açsam,
Müəllim dərsi-novmidi mənə bəxtim kitabından,
Bizə ol müddəi bidad cövrin hədən aşurdi,
Əcəb ol səngdil vəhm eyləməz yarın əzabından.
Cəfa hərçənd edər zahir burub yüz himməti-xatir,
Əl üzməz qönçə dək ol bağbanın ictinabından.
Yetişmiş əhli-bəzmə dövrdən bin nəş'eyi-rahət,
Xümari-dərdi-sər yetdi mənə dövran şərabından.
Nə qəm, talanə getdi cümlə malım şükrilillah kim,
Hesabın aldı qurtuldum qəmim yövmül-hesabından.
Degil layiq verəm dərdim, Məsihi, nisbət əğyarə,
Mənəm əvvəlki qəmfərsa cəhanın müntəxabından.

* * *

Vərqa oxumaqda nəqşi-fərdi,
Tür sinəsində hənuz dərdi.
Gülşayə bu şivə oldu zahir,
Əzmi-səfər eyləmiş müsafir.
Firqət ələmi qılub müşəvvəş,
Şövq urdi məta'i-səbrə atəş.
Namusi buraxdı bir kəranə,
Əfğani yetürdü asimanə.
Çabük ələ dutdi daməni-yar,
Dil açdı ki, ey olan vəfadar,
De başın içün nədür bu halət,
Ayrılməgə eyləmək icalət.
Göz görmədi seyri-rəngi-ruyin.
Eşitmədi can məşami-buyin.
Fikrin nəvü bu nəçük səfərdür,
Kimin sənə şövqi rahbərdür.
Gördün kimi yaxu kimni andun,
Tərk eyləyübən məni usandun.

Ver sən mənə, ey şəhiri-afaq,
Qəmdin mənim oldu taqətim taq.
Gəzməkdə sənin bu olsa halın,
Saxsa durub atəşi-xəyalın.
Pəs rəhm edə görgilən fəqirə,
İnsaf gətür bu guşəgirə.
Hicran güni qəm açan əbvab,
Düşvar degilmi eyləmək tab?
Ey bülbüli-baği-inbisatım,
Arayişi-rövzeyi-nişatım.
Gər ömr ilə eyləsən cüdalıq,
Dutsan yüzə rahi-bivəfalıq,
Olmaz mənə səndin özgə bir yar,
İqrarımdur əvəlki iqrar.
Bir gül degiləm mən, ey həbibim,
Hər gün ola tazə əndəlibim.
Ey mərhəmi-sineyi-figarım,
Əldə necə vardur ixtiyarım,
Qəm çəkmə ki, saxlaram səlamət,
Tapşurduğini mənə əmanət.
Eylər dünü gün dua məni-zar,
Tanrı ola xandasan nigəhdar.
Meylim budur olmuyam fəramuş,
Yadım ola yaduna həmağuş.
Çün getməməgində yox əlacın,
Tərk etməgi xahişi-məzacın.
Vergil mənə bari bir nişanə,
Ta hirz edəyim gəluyi-canə.
Yadın bilə ola yadigarın,
Arami-dili bu biqərarın.
Həngami-fəraqi-nagüzirim,
Şayəd ola əldə dəstgirim.
Həddən aşurub fəğanü zari,
Əngüştərin aldı yadgari.
Bir növ ilə ol qəmə giriftar,
Dərdi-dilini qılurkən izhar,
Ruyi-məhə yağdurub sitarə,
Bu bir qəzəli oxidi yarə.

QƏZƏL

Mənəm ki, sinə çak etdim fəraqın iztirabından,
Yeritdim cuyi-xun ol rövzəyə heyvan hübabından
Bir özgə sübhə tiksin əhli-aləm dideyi-ümmid,
Ki bu sübhi-səadət tirə oldu qəm səhabından.
Gördüm ol kimsə kim ayırdı mən biçarəni səndən,
Ki ta sübhi qiyamət durmasın ol cayi-xabından.
Qənimətdür əgərçi vəsl, yoqdur görməgim gəh-gəh,
Gedüb yandurma bir gəz atəşi-hicrin şəhabından.
Ola başında kimnin iştiyaqi-badeyi-səhba,
Nədür bais qayıtmaq təşnələb, meyxanə babından.
Qənaət eyləmək bilmən nədəndür dərdi-hicranə,
Urub əl şişeyi-mey içməmək vəslət şərabından.
O gün oldum Məsihi tək cəfayi-eşqə rasix pey,
Açub ta dərs oxudum səfheyi-hüsnün kitabından.

## TƏMAMİYİ-SÜXƏN

Çün söylədi ol kigari-tənnaz,
Cananəsinə həqiqəti-raz.
Vərqa ona qıldı üzrxahi,
Əzm etdigü yola dutdi rahi.
Öz canını hər bir etdi xali,
Can hər birə yarının xəyali.
Düşdü o fəraqü hicrə məhşur,
Bin həsrət ilə nigardən dur.
Yalquzluqü suzi-nari-qürbət,
Bikəsligü iztirari-firqət.
Mənzil-mənzil kəsüb təriqi,
Qəm həmdəmivü ələm rəfiqi.
Yüzə ərəqi qılub gülabi,
Badə tökülən sirişki-nabi.
Ac olmağıda qəzasi həsrət,
Suzuluğuda şərabi heyrət.
Bu növ ilə ol hümay sayə,
Xaki-Yəmənə yetürdi vayə.

## BU, VƏRQAYİ-HƏZİNİN HALİ-XALUDƏNDÜR ƏXBARİ

Bir qafiləyə yetişdi rahi,
İstəşdi durub Səlim şahi.
Ol qafilə adəmi sərasər,
Göstərdilər ol şükufədin bər.
Bu tərz ilə verdilər cəvabi,
Mizanə çöküb rüxi-hesabi,
Key sahibi-əqlü huşü fərhəng,
Əhli-Yəmənə mədardur təng.
İlqar ilə Kişü Bəhr şahi,
Səksən min igit anın sipahi.
Meymun ləqəbivü Əntər adi,
Gizlü kəsüb ol təriqi-vadi.
Durmuş salub öznü bu diyarə,
Yetdükdə o qəl'əvü hisarə,
Məhşər qurulub qopub qiyamət,
Götrüldi Səlimdən səlamət.
Dövlət itirüb dəri-təmənna,
Şah oldu əsirü şəhr yəğma.
Axırda vəzir olub hisari,
Saldı bünəyə özün şikari.
Qılmış qibəl ol hisari düşmən,
Düşmən demə, seyli-xaneəfkən.
Gər dönməsə mənzilinə Əntər.
Məğlub ola tez vəzirü ləşkər,
Tüğyan edə qəm, yox olsa qəmxar,
Sər neyləyə olmaz isə sərdar?!
Vərqa çü eşitdi ol cəvabi,
Birinə yüz oldu iztirabi.
Qeyrət anı qıldı eylə mədhuş,
Kim öz qəmin eylədi fəramuş.
Sündü dünü gün səməndi-qeyrət,
Ta məzreə yetdi əbri-rəhmət.
Nə baxdı görüb təgərgi-hirman.
Qılmışdur o keştzari pəjman.

Ol ceyşi-ədu kəsüb məabir,
Çün xərməni-mahə halə dair,
Bildi ki, səhih imiş kəlami,
Ol qafilənin sözü təmami.
Tədbir ona verdi bu qərari,
Kim səbr edə duta bir kənari.
Ta yandura məş’əlin sitarə.
Bir hiylə ilə özün hisarə
Salub görə ləşkərü vəziri,
Ol məcmənin ola dəstgiri.
Liykən qəm edüb hilal o mahi,
Yox kimsə ola dəlili-rahi.
Bilməz nə tərəfdən ol hisarə,
Tale ola dun o mahparə.
Çün batdı günəş olub şəbi-tar,
Dil verməyüb uyxuya o bidar,
Keçdi gecənin bir-iki pasi,
Dəgşürdi durub rəvan libasi,
Ta qoydu qədəm rəhi-muradə,
Qarşusinə gəldi bir piyadə.
Tənha o bəridi-bisərü pa,
Dutmuş rəhi Buqübeysü Bətha.
Dutdu ani gördügündə möhkəm,
Ahəstə dedi ki, çəkmə gəl qəm.
Doğru deməgündədür səlamət,
Sadiqlərə yetmiyə qəramət.
Kimdənsənü kim sənin pənahın,
De kimə durur bu ruyi-rahın?!
Gər yar ola kizbə e’tirafın,
Həqqa səni öldürər xilafın.
Naçar o şəbrovi-giriftar,
Doğru demək ilə düzdi göftar.
Dutman dedi: sidqdən kəranə,
Dur sidqimə göstərim nişanə.
Görgil ani ta ki, cani-naşad,
Bu doğruluq ilə ola azad.
Şahid mənə bəs əlimdə namə,
Göndərmişlər məni hümamə.

İmdad dəmidür ol cəvanbəxt,
Salsın bu diyarə sayeyi-təxt.
Vacib ki, ola bu ğəmdə qəmxar,
Sər getdi ola bu qövmə sərdar.
Gər olmasa şəh bu subə azim,
Vərqayə durur bu əmr lazim.
Xalusi durur əsiri-düşmən,
Vacib ona bu əzadə şivən.
Bu qasidü namə həftümindür.
İrsal olunur, xəbər həmindür.
Çün naməni verdi ol giriftar,
Vərqa ona açdı çeşmi-xunbar.
Bildi nədür ol kitabə məzmun,
Hər nüktəsi bin niyazə məşhun
Yazmışdur ani vəzirü ləşkər,
Əhvali-cəfavü cövri-Əntər.
Ta rəf ola cövri-zülmü bidad,
Ol şahdən istəmişlər imdad.
Düşdi qəmə cismü canı anın,
Tez bəndini açdı ol cəvanın.
Dedi ona: – Ey bəla zəlili,
Vərqa mənəm, eyləgil dəlili.
Əmn olgilü kəsgil iztirabın.
Bu dün ara doğdu mahtabın.
Gər eyləsə kövkəbim zücaci,
Asan ola bu bəla əlaci.
Dur ayağə eyləmə zəbuni,
Olgil mənə qəl'ə rəhnümuni.
Qoyduqda qədəm o bürcə Bəhram,
Doldura şərabi-fəthidin cam.
Çün qasidə tale etdi yari,
Pünhan dutuban rəhi-hisari.
İqbal ona düzdü dəstgahi,
Qəl'ə dibinə yetürdü şahi.
Çağırdı rəfiqü aşinasın,
Tanıdılar eşidüb sədasın,
Dedi olara həqiqəti-hal,
Müjdə ki, sizə yetişdi iqbal.

Ol kim dilər idünüz vüsalın,
Göz açubəni görün cəmalın.
Ol kim sizə rahəti-rəvandur,
Ha gəldi bu gecə mihmandur.
Ol kim sizi yaxdı iştiyaqi,
Yetdi sizə rəf edüb fəraqi.
Səgritdi o qəl'ə kutvali,
Ərz eylədi Asəfə o hali.
Eşitdi muni çü ol sərəfraz,
Gəldi ki, duya həqiqəti-raz.
Ta kim görə oxunan nə xətdür,
Mə'nisi dürüst ya ğələtdür.
Zira ki, ol Asəfi-müəzzəm.
Çün bir-iki sal mundan əqdəm,
Düzmüşdü rəhi-hərimə məhmil,
Olduqda ona o feyz hasil.
Görmüş idi Vərqəvü Hümami,
Hasil ona olduğunda kami.
Çalub belə daməni-iradət,
Qılmışdı o şəhriyarə xidmət.
Əmr eylədi məş'əlü çirağı,
Yaxın görəlüm yavıq-irağı.
Mə'lum ola gör o müqtədadur,
Canlar qamusu ona fədadur.
Rövşən qıluban çirağı-didə,
Vərqayə göz açdı ol güzidə.
Baxgəc tanıdı ol ərcüməndi,
Can riştəsidin asub kəməndi.
Çağırdı ona ki, ey məhi-bədr,
Sal sayə bu bürcə arturub qədr.
Vərqa nəzər etgəc ol füvucə,
Meyl eylədi payeyi-ürucə.
Döndü can cismə, cism canə,
İsa kimi çıxdı asimanə.
Me'racə kəmənd olundu rəfrəf,
Müştaqləri qılub müşərrəf.
Asəf çü yetişdi ol vüsalə,
Baş ayağə qoydu, qıldı nalə.

Dedi ona: – Ey mənim pənahım,
Bu gümşüdəlikdə ruyi-rahım,
Gəldün, şad eylədün bu xeyli,
Canım ola gəlməgin tüfeyli.
Hala bizi qəmdin etdün azad,
Yarəb, olasan həmişə dilşad.
Yetdi bizə dərdü qəm firavan,
Eşitməgilən nə qıldı dövran!
Verdük yelə cümlə nəngü ari,
Kimsə nə bilür məali-kari?!
Düşmən əlimizdən aldı şahi,
Basqun yedi ləşkərü sipahi.
Ol gündə olub ədu əsiri,
Altmış iki padşah əmiri.
Bu cəm’ ilə mən girib həsarə,
Möhkəm qılubam bürucü barə.
Biz munda o şah əsiri-düşmən,
Bu şivədədür mədari-şivən,
Nə cəngi-əduyə tabımız var,
Nə əldə rəhi-səvabımız var.
Üç aydur olmuşam həsari,
Bu tərz ilə qılmışam mədari.
Qafil bizi ol hücumi-ə’da,
Saldı bu bəlayə qıl təmaşa,
Ey kaş o gün öleydi Asəf,
Bu günləri görmiyeydi Asəf.
Canın ilə olsa yaxşıdur can,
Can canansız yeg ola talan.
Əmma bizə gəlməgindən, ey şah,
Tale’ yar oldu, bəxt həmrah.
Ümmid ki, axir oldu nikbət,
Sayə bizə saldı şaxi-dövlət,
Bir-bir gəlib ani gördü ə’yan,
Hər biri dua qılub firavan,
Vərqa görüb onları girami,
Göstərdi lüzumi-ehtirami.
Ləb açdı ki, səhldür bu xari,

Gər yarım olursa ovni-bari,
Meydani-cidalə qılkəc ahəng,
Ə’dayə qılam fəzayi-can təng.
Əntər kimdür, nə zuri anın?
Rəf eyləyə xət hüzuri anın.
Yarın görünüz bu zurdəsti.
Ol qövmə necə verür şikəsti.
Qəm çəkmə, ey Asəfi-zəmanə,
Ol gövhəri tez çəkəm bu kanə.
Aləm külüngü xar əlindən,
Qurtaram o gənci mar əlindən.
Eşitdi çü ol kəlami ləşkər,
Oldu qəmu cəng içün dilavər.
Dedilər ona ki, nə qərarın,
Qıl cümləyədür qəbul rayın.
Qaim qəmu rahi-intizarə,
Səndən budur edəsən işarə.
Həqqa bu güruhə üzrdür ar,
Sər olmamaq eylədi bizi xar.
Səndən tələb eyləmək ədani,
Bizdən qılmaq nisari-cani.
Səndən meydanə qılmaq ahəng,
Bizdən yandurmaq atəşi-cəng.
Səndən qoymaq ayaq rikabə,
Bizdən durmaqdür ehtirabə.
Ol sahibi-rayü əqlü təmkin,
Qıldı olara həzar təhsin.
Salındı vəsadeyi-fərağət,
Vərqa üzərində buldu rahət.
Ta sübhədəkin vəzirü ləşkər,
Əsbabi-cidal edüb müqərrər,
Çaldurdılar anda kusi-şadi,
Ta kur ola dideyi-əadi.
Əntər çü eşitdi ol sədayi,
Bivəqt o sədayi-təblü nayi.
Aya – dedi – bu nəcük xəbərdür?
Ölmüş oddan bu nə şərərdür?

Yox anlara xud müinü yavər,
Sərdar əsirü xar ləşkər.
Hazır oluban dutun kəmini,
Ta sübhə dəkin bu sər-zəmini.
Nagah çevirüb qəfa həsarə,
Yüz döndərələr rəhi-fərarə.
Rəxnə urulub kəsildi həncar,
Çün mərkəzə dövri-xətti-pərgar.

## ƏVƏLKİ CƏNGİDÜR BU QÖVMİ-ƏNTƏRBİRLƏ VƏRQANIN

Ta göstərdi Sekəndəri-ruz,
Mir'ati-cəmali-aləm əfruz.
Baş qovzadı xur misal Vərqa,
Hər tük ona bir sinani-qövğa.
Cəng etməgə gördü ərzi-ləşkər,
Ariz saydı igirmi min ər.
Açdurdu rəvan həsar babın,
Çıxdı verə düşmənin cəvabın,
Səf bağlıyuban açıldı e'lam,
Pür oldu şərabi-tiğdin cam.
Məh şəqqə yetürdi aftabə,
Gərdun başına olub əsabə.
Gürdan üzə dutdu rahi-kinə,
Saçıldı şərarə nari-sinə.
Avazü nəfirü naleyi-kus,
Ol rəzmdə ərşi qıldı pabus.
Dövran görüb ani üzdü məhmil,
Qoydu yerə surunu Sirafil.
Düşmüş o ki, ol hüjəbri-meydan,
Bir əldə qılıc, bir əldə qalxan.
Yox vəhm ona kəsrəti-ədudan,
Pərvasi o qövmi-cəngcudən.
Meydanə girüb çü pili-sərməst,
Qədri uca, sayəsi zəbərdəst.

Sıçratdı səməndi-badpayi,
Seyr etdi dutub həva hümayi.
Yetdükdə bərabəri-əduyə,
Su verdi hüsami-göftguyə.
Çağırdı ki, ey şəriri-bidin,
Yaxşımı durur bu tərzü ayin.
Öz mülkünə qılmayub qənaət,
Verdin yelə xərməni-fərağət.
Əl yetmədi taleində kamə,
Hirsin saldı səni bu damə.
Müşkül görünür sənə xilasi
Asan əridür bu od risasi.
Oğlu mənəm ol Hümam şahın,
Gəldüm ki, pozam bu dəstgahın.
Adım Vərqa, özüm hicazi,
Birdür mənə şüğli-cəngü bazi.
Qovğa günü Rüstəmi-zəmanəm,
Həyca dəmi bərqə həminanəm
Düşmüş bu gün əxtərin vəbalə,
Qıl fikrini uyməgil məhalə.
Qalmaq əgər istəsən səlamət,
Döndər yüzünü yaşur əlamət.
Algil ələ rahi-nagüziri,
Qoy şahilə cümleyi-əmiri.
Dur cəhd qılub rəhi-fərarə
Şayəd çıxa zövrəqin kənarə.
Yoxsa yüzə aç dəri-nəbərdi,
Zahir ola xəlqə zuri-mərdi
Çün anladı ol əduyi-sərkəş,
Nə kanundən durur ol atəş.
Ol vaqiə saldı irticacə,
Uymiyə küyə durub əlacə.
Ta tir xitab qıldı pürtab,
Saçsın biri tez ol atəşə ab.
Çıxdı ona qarşu bir həzarə,
Səffak adı, özü guh parə,
Mərkəb kəmərində zin şükuhi,
San atlanmışdı kuh kuhi.

Aldı ələ nizə ol dilavər,
Vərqayə yetüb çü badi-sərsər,
Gəncur o şivədin xəbərdar,
Oldu ki, yetişdi gəncinə mar.
Döndərmədi püşt o həmlədin ru,
Xəm eylədi püştü dutdu pəhlu.
Çün hirzi-müşəyyəti-xudayi,
Rəf’ eylədi andan ol bəlayi.
Bər vermədi xəsmə çün nihali,
Ol nəxldin ötdü dəst xali.
Çapuk gerü döndü ol cəvanbəxt,
Çaldı ona tiğ bal edüb səxt.
Yetdükdə o bərqi-tizrəftar,
Ol peykəri qıldı xakə həmvar.
Tiği-əcəl ona saldı sayə,
Çəkdi ani guşeyi-fənayə.
Bu almağı seydi bazi-dövlət,
Oldu şəhə fali-fəthü nüsrət.
Səffakə o zərbdəsti-hayil,
Ə’dani sərasər etdi bəd dil.
Zira ki, o gündə xəsmi-pürfən,
Ovci-dər’ üzə eyləmişdi cövşən.
Ta tiğə olundu bir işarə,
Qıldı ani çün xiyar parə.
Ol rəmzi-nihani duydu Əntər,
Təklifə yetişdi kari-ləşkər.
Dökdü yerə badə, atdı cami,
Pəs qaxıdi ləşkərin təmami.
Bais nədurur bu irtiaşə,
Durmaq gerü, getməmək səvaşə.
Ad dutdu birini qıldı avaz,
Təşrif ilə eylədi sərəfraz.
Ordu miri, Dəvalə nami,
Tabe ona ləşkəri-təmami.
Yalquz neçə kər o kuhi-peykər,
Alub dejü pozmuş idi ləşkər.
Meydan ona xaneyi-ərusi,
Zahirdə firəngü əsli rusi.

Dil açdı ona o cəm'ə malik,
Key nari-məarikü məhalik.
Dur yandura gör bu xari-rahi,
Ta yol bula ləşkərü sipahi.
Təklifimi bilmə kəsri-şanın,
Gör şanını həm o mihmanın.
Qayim sənə püşti-e'tiqadım,
Səndin hasil olur muradım.
Durdu o Dəvaleyi-səbükray,
Cəng alətinə girüb sərapay
Ol dəst dirazü ömr kutah,
Meydani-cidalə gözlədi rah.
Qıldı özə şivə məkrü hiylə,
Vərqa ilə durdu qalü qiylə.
İstərdi ki, edə ani qafil,
Heyf edə o çapukə bu kahil.
Dedi ona: – ey hicazmilad,
Olmaz iki ömri-adəmizad.
Dur saxla əlində nəqdi-həsti.
Vermə özünə, bizə şikəsti.
Fikr eylə bu ləşkəri-giran səng.
Axir ki, sənə mədar edər təng.
De bizə nə heyf qıldı şahın,
Ta neyləyəsən sənü sipahın.
Verməz sənə sud bu təhəvvür,
Axir səni xar edər təkəbbür.
Var əldə bu gün ki, ixtiyarın,
Yegdür bu qərardin fərarın.
Verməz sənə sud o gündə şivən,
Zənciri-ğül ola tövqi-gərdən.
Xətm eyləmədin müzəxrəfati,
Vərqa tərəfinə sürdü ati.
Şəm olduğindən zəban sərasər,
Bir püfdə fənasidür müğərrər.
Gördü anı çün o bərq şəmşir,
Bu bəbrə kəmin dutubdur ol şir.
Göstərdi o xəsmə özni kahil,
Təprənməyübən o mərdi-aqil.

Pünhan gözədüb təriqi-fürsət,
Ta xəsmə ziyadə oldu cür'ət.
Qıldı ani püxtə rayi-xami,
Ol şahə çalam dedi hüsami.
Vərqa ona dutdu piş dəsti,
Ta bulmıya xəsmdin şikəsti.
Qıldı ani ta yetürdü asar,
Bir loqma nəhəngi-adəmi xar.
Ardınca yetişdi bir dilavər
Ol həm yerə qoydu dər'ü miğfər.
Əlqissə kimə yetişdi növbət,
İçirdü ona şərabi-həsrət.
Ta üsrədək ol hüjəbri-meydan,
Səksən iki kafir etdi bican.
Gün keçməgi oldu bir bahanə,
Kimsə dəxi gəlmədi miyanə,
Dutdu rəhi-qəl'ə ol dilavər,
Pabusə yetüb vəzirü ləşkər.
Qıldılar əda lüzumi-tə'zim.
Göstərdi qəmu rüsumi-təslim.
Rahət yetişüb dili-figarə,
Girdi qəmu ləşkəri hisarə.
Gecə düşdü büsati-pərgar,
Pəhlu yerə qoydu yarü əğyar.
Həm kimdə bu fikr taleyi-dun.
Yarın kimi edə zarü məğbun.

## BUDUR, VƏRQANIN İKİNCİ SƏVAŞİ

Çün kani-zəbərcəd açdı babın,
Göstərdi cəhanə lə'li-nabın.
Səf çəkdi durub yəlani-həyca,
Çün şiri-jiyan o səfdə Vərqa.
Ol səfhə açanda xətti-bariz,
Meydan dutub istədi mübariz.
Bir-bir o təriqi-ruzi-sabiq,
Duxsan beş igidə oldu faiq.

Ta Yunisi-ruzi mahiyi-şəb,
Ötdü o nəhəngi-fülsi-kövkəb.
Dinlənməgə fürsət oldu hasil,
Vərqa qayudub gözətdi mənzil.
Çün tipə qayıtdı ol dilavər,
Gördükdə ani vəzirü ləşkər.
Başına dönüb xəm etdilər qəd,
Çün qütbə Bənatinn'əş Fərqəd.
Təhsinlər edüb o növcəvanə,
Qəl'ə yana oldular rəvanə.
Ol gecəni eyş ilə nəharə,
Yetürdi qəmu girüb hisarə.

## ÜÇÜNCÜ CƏNGİDÜR OL QÖVMİ-BƏDXAH İLƏ VƏRQANIN

Əfsun oxudu sipəhri-dəvvar,
Ta tişrəyə saldı möhrəsin mar.
Əflak cəmi götürdü camın,
Qoydu yerə xudi-qırfamın.
Xali qılub özünü sürahi,
Doldurdu o camə ruhi-rahi.
Ordu Vərqa durub ayağə.
Ol sübhdə püşti-pa fərağə.
Əsbabını aldı düzdü ləşkər,
Dər' əgninə geydi, başa miğfər.
Ol Xosrovi-kişvəri-məhalik,
Tuğrayi-səhifeyi-məarik
Ta xəsm gəlincə dutdu meydan,
Sıçratdı səməndü qıldı cövlan.
Qarşu duruban ədu sipahi,
Dutdular o pəhləvanə rahi.
Hər kim gəlüb eylədi nəbərdi,
Göstərdi o yüzdə ruyi-zərdi.
Bu rəsmə durub rəhi-qətalə,
Ta irdi günəş varub zəvalə.

Baxdı görüb ol bəlanə Əntər,
Qorqutdu qəmunu ol dilavər.
Olmadı biri hərif o mərdə,
Qoymaz kimsə qədəm nəbərdə.
Çak eylədi sinə, yaxdı canın,
Gördü ölü munca pəhləvanın.
Yalquz o pələngi-şirzadə,
Qoymaz gəzə rubəh ol aradə.
Tərk eylədi şiveyi-ərəbni,
Qovqayi-hücumə açdı ləbni.
Göndərdi qılub şümari-ləşkər,
Ol ərseyi-rəzmgahə bin ər.
Ol nakəsər durub cidalə,
Öz kəsrətidin uyub məhalə,
Görmişlər idi nə macərasın,
Ta dəf' edələr anın bəlasın.
Dil bağladılar hücumi-amə,
Xürsənd o vəz'i-natəmamə.
Ol şir dil oldu çün xəbərdar,
Nə fikrdədür o qövmi-xunxar.
Hərçənd degil zəmani-mərdi,
Üsfur üqab həmnəbərdi.
Liykən üqəlayədür bu kirdar,
Görməz mur olsa düşməni xar.
Tapşurdi özünü kirdigarə,
Andan diləyüb ol işə çarə.
Mə'budinə eyləyüb təvəkkül,
Əglənməgə qılmadı təhəmmül.
Atdı yayü ox, buraxdı nizə,
Aldı ələ sarimi-sitizə.
Hər yanə olurdu həmləavər,
Bir-birinə qarışurdu ləşkər.
Gəh qəlbə urardı, gəh yəsarə,
Gəh meyminə yəsaçub şərarə,
Dəryayi-bəla nəhəngi Vərqa,
Dutdu yüzə tazə rəsmi-qovğa.
Versə qılıcı kimə səlami,
Qalmazdı səlamət əldə cami.

Tiği kimə salur olsa sayə,
Salur ani vayəsində vayə,
Şəmşirinə su verüb həlahil,
Bir kasə dolu şərabi-qatil.
Bəzmində kiminə sundu sağər.
Ol nəxli-həyati qıldı bibər,
Getdikcə müxalif eylədi zur,
Çün şirəyə izdihami-zənbur.
Kim hərbə çalar, kimisi şəmşir,
Kim nizə sunar, kimi atar tir.
Liykən o bəladə hisni-bari,
Olmuş qəmudən anın hisari.
Asəf bu xəbərdən oldu agah,
Bağlandı o mahə halədin rah.
Ol filə hücumi-poşşə bidad,
Qıldı verüb intiqamdən yad.
Çaldurdu nəfirü dögdi kusi,
Xəm eylədi taqi-abnusi
Tip yeridüb ol vəziri-nami,
Dutdu yüzə şivə cəngi-ami.
Beş min kişi namdarü qəttal,
Vərqa köməginə qıldı irsal.
Hər biri yeganeyi-zəmanə,
Yox minnət olarda başü canə.
Nə didədə tərsü dildə var bim,
Nə sinədə hərfi-sülhü təslim.
Əzm eylədi çün o seyli-xunriz,
Nə seyl ki, bərqi-atəşəngiz.
Salmaqda kimi kəmanə pəncə,
Şəmşirinə kim verür şikəncə.
Kim eylər əlində nizəbazi,
Kim şeşpərə bağlamış niyazi.
Kim həlqələmiş xəmi-kəməndi,
Kim xəncər olundu dəstbəndi.
Əntər çü ol işdən anladı raz,
On min kişi eylədi sərəfraz.
Şayəd qılub ol qəlilə yari,
On ola birinin e’tibari.

Çün bir-birə yetdi iki ləşkər,
Ləşkər demə iki badi-sərsər.
Gərm oldu aradə atəşi-cəng,
Can oldu bədən içində diltəng.
Əzbəs ki, döküldü lə'lü mərcan,
Yüz gizlədi mə'dəni-Bədəxşan,
Ox ötdü zirehdən eylə azad,
Çün həlqeyi-zülfi-yardən bad.
Toz bəs ki, çəkildi asimanə,
Ağırlıq ani salub ziyanə,
Əgdi belin ol təhəmmüli-bar,
Az qaldı ki, ola xakə həmvar.
Ol tozda günəş güm etdi rahi,
İtürdü sipəhr mehrü mahi.
Zəhri-əcəl, abi-nuki-nizə,
Çün nabeyi-ərğəmi-sitizə.
Su'bani-düsər buraxdı qari,
Baş-başə qoyub saçar şərari.
Dutdu gün üzün üqabi-tufan,
Çün əbri-siyah ruzi-baran.
Dökdü o yerə bəla təgərgin,
Sındurdi o bağ şaxü bərgin.
Qan bəhridə ol nəhəngi-bidad,
Çün qərqi-şəfəq hilali-novzad.
Xəncər yerə qan tökərdi hər yan,
Çün qəmzeyi-çeşmi-məsti-canan.
Baş üstidə gürz əjdəha sər,
Başlar uşadub pozardı peykər.
Təndə zireh oldu dami-pürxun,
Xunabi-cigər dağıtdı birun.
Çox sər kəsilüb yıxıldı sərdar,
Xud oldu o kidsə keyli-e'mar.
Ta şam ol iki gəlleyi-şir,
Hər biri-birə urardı şəmşir.
Çoxlar yedi zəxmi-dilxəraşi,
Baş istər ikən kəsildi başi.
Künd oldu qılıc, itəndi kinə,
Ol kinələr ilə doldu sinə.

Axirdə hümayi-fəthü iqbal,
Əhli-Yəmənə müzilleyi-bal.
Salduqda yetişdi çirə dəsti,
Zahir oldu ədu şikəsti.
Çün ləşkəri bəhr duydu hali,
Ayrılmağa yox ədü xəyali.
Getdikcə olur bəla ziyadə,
Yox durmağa məsləhət oradə.
Əhli-Yəmənə qoyub sitizi,
Dutdular üzə rəhi-gürizi.
Rahət döküb atdılar əlamət,
Ta tipə yetişdilər səlamət.
Çün gördü bu fəth eyləyüb cəhd,
Vərqayə yetişdi Asəfi-əhd.
Ol ərsədə qılmayub dirəngi,
Alub geri döndü ol pələngi.
Qonduqda üqab aşiyanə,
Durdu o müdəbbiri-zəmanə.
Şabaş ona qıldı yüz təbəq zər,
Saçdı qədəminə lə'lü gövhər.
Qıldı özün eyləyüb sərəfraz,
Min bürdi-yəmani payəndaz.
Ol sərvəri-mülki-izzü təmkin,
Qıldı ona səd həzar təhsin.
Məclis bəzənüb quruldu işrət,
Gətrüldü yemək, çəkildi şərbət,
Qılmani-cəmilə ol aradə,
Ta şah uya saldılar vəsadə.
Bunlar qəmu eyş içində şadan,
Ol Əntər qərqi-bəhri-xəsran.
Çün gördü o rəzmdə şikəsti,
Bildi, qıldı sitarə pəsti.
Çağırdı vəzir ilə vəkili,
Ol güm şüdə istəyüb dəlili.
Der heyranəm bu karü barə,
Vacib qılasız bu dərdə çarə.
Xani deyünüz o növcəvanlar?!
Pəhlü yerə qoydu pəhləvanlar.

Oldum yəmənilərə bu gün xar,
Yetdi mənə cövrü qövmə azar.
On min ər olupdurur şikəstə,
Məcruhü qətilü zarü xəstə.
Düşmən qəmu qayıdub səlamət,
Heç birinə yetmədi qəramət.
Mə'lumdur ol nəbərdi-mərdi,
Xalusidən ötrü var dərdi.
Ruyintən ola məgər bu oğlan,
Qılmaz ona kar tiği-bərran.
Qoymaq ani şanə narəvadur?
Gər qoymaz olam dəxi bəladur.
Qorxum bu durur ki, surəti-hal,
Ə'dayə verə kilidi-iqbal.
Zira bu yüzün uşandı sazi,
Meydanə girəndə ol hicazi.
Ol iki qəmə girehgüşalər,
Əvvəl ona qıldılar dualər.
Pəs söylədilər ki, ey cəhandar,
Artuğ qəmə olmagil giriftar.
Döndərmə bu səhl işə məcazi,
Asan görünür munun ə'laci.
İstər o cəvan Səlim şahi,
Fe'li bu sözə verür küvahi.
Yarın o qılanda darügiri,
Biz şahilə cümleyi-əmiri.
Hazır edəlüm o rəzmgahə,
E'lam edəlüm qəmu sipahə.
Məslub olur imdi şahi anın,
Lazım gələ üzrxahi anın.
Səbr eyləyə bilməz ol cəvanmərd.
Kim dayısına yetişə bu dərd.
Çün kim o sözü eşitdi Əntər,
Təhsin çılub eylədi müqərrər.
Ta kim ola düşməni xəbərdar,
Meydani-cidalə nəsb ola dar.
Bu xidməti ta düzüncə ə'van,
Baş qovzadı bülbüli-səhərxan.

## BU, DUTMAQ ƏNTƏRİ DÖRDÜNCİ RƏZMİ-PƏHLƏVANDÜR

Verdi dögübən şükufəsin zud,
Narinci-tər ol nihali-məqsud.
Vərqa durub eylədi nəmazın,
Atlandı geyüb silahü sazın.
Açdurdi durub dəri-həsari,
İqbal rəfiqü bəxt yari.
Başına qülüv qılub sipahi,
Əncüm tək alub arayə mahi.
Çün yetdi məhəllikarzarə,
Ol darlara qılub nəzarə,
Ahəngini gördü, duydu sazi
Gizlü dedi Asəfə bu razi.
Ol fikrdən oldular müşəvvəş,
Nagah çəkə zəbanə atəş.
Yandura o həmlə cismü cani,
Göydürə zəmin ilə zəmani.
Nə sud qılur dəxi təhəvvür,
Yox faidə kim yeyə təhəssür.
Bu rayə qərar ol iki yar,
Verdi ki, əgər bulunsa asar,
Ol vaqiədin durub təmami,
Yekdil qılalar hücumi-ami.
Şayəd ola dəf' şərri-ə'da,
Rövşən ola dideyi-əhibba.
Vərqa yetib etdi zül himari,
Ta bəkliyə mənfəzi-həsari.
Həyca günü ol yəli-tənumənd,
Mərrixə kəmənd edər gəlubənd.
Şiri-fələkə açanda bazu,
Olmazdı onunla həmtərazu.
On min igid özü aldı ol şah,
Hər birisi bir bəlayi-nagah.
Müştaqi-əcəl, həyatdin sir.
Dutmuş qəmu mərgə rahi-şəbgir.

Tapşurdi vəzirə altı min ər,
Ta kim ola püştbani-ləşkər.
Bu işdə bular vəzirü Əntər.
Dövründə qoşun-qoşun dilavər.
Altmış iki mirü şah həmrah,
Meydani-cidalə yetdi bədxah.
Ta kim asa bunlari o darə,
Şayəd gələ xəsm zinharə.
Əntər özü dutdu bir kərani,
Ta çoxunun ola pasibani.
Çün seydinə yavuğ oldu ol şir,
qalxan yüzə çəkdi, qapdı şəmşir.
Göz bermədi, gözldəi vəziri;
Şayəd ki, ələ sala əsiri.
Yetdükdə sipahə ol sipəhbəd,
Qıldı ol aradə cəddi-bihəd.
Çün tənləri qıldı anda bisər,
Çox sərlərdin buraxdı əfsər.
Yetdi kimə zərbəti-şəmusi,
Düşdü yerə qıldı paybusi,
Gəh gürz çalardı, gah şəmşir,
Gəh nizə urardı, gah atub tir.
Hər fərqə açanda tiği sayə,
Salurdu dili-zəminə vayə.
Çün bərq edüb ol şərarə rizi.
Yox çalmağü yıxmağın təmizi.
Hər guşədə ol pələngi-kinə,
Tapşurdi leş o qədər zəminə,
Gər qabizi-ruh aça kitabın,
Aciz qala itürə hesabın.
Görməkdə o zuri-bazuyi-şah,
Söylərdi zəmanə barəkallah.
Gürdani-Yəmən durub cidalə,
Ol gündə əl açdılar qətalə.
Bir-birə qarışdı iki ləşkər,
Başlar kəsilüb yıxıldı peykər.
Avazeyi-al muni, ver ani,
Kar eylədi guşi-asimani.

Çalındı dəvalə, təbli-bazə,
Ol düşdü libasi-ehtirazə.
İki tərəfin dühul sədasi,
Geydürdi gögə libasi-yasi.
Yanduqda ol atəşi-sitizə,
Meyl eylədi afiyət gürizə.
Can eylədi cismə sərgirani,
Verdi yelə ömri rayigani.
Saçıldı zəminə ol qədər xun,
Hər guşədə zahir oldu Ceyhun.
Ol aradə əsbi-mərdi-cəngi,
Qan ləccəsinin olub nəhəngi.
Muyinə sər anda eyləyüb gəşt,
Gələ-gələ çü qənğəzi-dəşt.
Qan içində tən məsabeyi-hut.
Sənduqeyi-sinə mərgə tabut.
Düşmən çü gördü ol hücumi,
Bildi nədür il işin lüzumi.
Arayə olub Səlim şahi,
Çün halə hisar edüb o mahi.
Cəhd eylədi ləşkərivü Vərqa,
Şayəd açıla güli-təmənna.
Bər vermədi nəxli-xahişi-dil,
Açılmədi sə’yə babi-müşkil.
Çəkdilər əgərçi çox şikəncə,
Əl qoymadı yetə mar gəncə.
Liykən o gün ol əmirlərdən,
Düşmən içidə əsirlərdən,
Düşdü ələ yarusu ziyadə,
Ol guşişi-ərseyi-bəladə.
Çün illəti-qayeyi-sitizə,
Göstərmədi rüx o tündxizə.
Qət’ etdi qəmudən iltifati,
Əntər tərəfinə sürdü ati.
Beş min igit eyləyüb qəfadar,
Qafil durmuş o xəsmi-xunxar.
Tip içidə eyləyüb təmaşa,
Nagah ona yetişdi Vərqa.

Bir həmlədə dağıdub güruhin,
Verdi yelə xərməni-şükuhin.
Çün bərgi-çinar o badi-sərsər,
Ol məcməi qıldı xakə həmsər.
Ta xəsm olunca anda agah,
Bağlandı ona əlacdən rah.
Naçar dutub rəhi-sitizə,
Qalxan başa çəkdi, qapdı nizə.
Bir həmlədə on səkkiz dilavər,
Saldı yerə sıçradub təkavər.
Bu rəsmə məsaf edərdi ol dəd,
Ta kim ona yetdi bu süpəhbəd.
Oldu yeriyüb o şiri-bazu,
Ol ərsədə bəbrə həmtərazu.
On zərbət ona yetürdü düşmən,
Dəgşürmədi yer o kuhi-ahən.
Bu urdu əmud, o dutdu qalxan,
Ol pütkzənü bu oldu sindan.
Vərqayə o tünbadi-sövlət,
Göz açmağa verməz oldu möhlət,
Axir Vərqa bulub muradi,
Xürd oldu rəvan əmudi-adi.
Ol gəbr durub çəkincə şəmşir,
Seyd etməgə düşdü fürsəti-şir.
Əl urdu rəvan açub kəməndi,
Atdı ona sıçradub səməndi,
Tale, gəlüb etdi dəstgiri,
Saldı şəri-damə ol şəriri.
Dutdu o üqab pərrü balın.
Qurtulmağa verมədi məcalın.
Çün eylədi bu əziz anı xar,
Düşdü yerə lailac o murdar.
Əl bəndə salub, gəlu kəməndə,
Gəcru fələk ani qıldı bəndə.
Əntər olgəc əsiri-Vərqa,
Qoydu yenə tazə rəsmi-qovğa.

Duydu qəmu ləşkərü sipahi,
Dutuldu o Kişü Bəhr şahi.
Yekdil qəmu düzdülər nəbərdə,
Ta eyləyələr dəva o dərdə.
Əhli-Yəmənin hücumi-ami,
Püxtə araya alub o xami.
Axşamə dəkin çalışdı düşmən,
Məğlub ola şayəd ol təhəmtən.
Qanlar tökülüb kəsildi çox sər,
Olmadı ol arizu müyəssər.
Başü leş ilə bəzəndi meydan,
Meydan demə kani-lə’lü mərcan.
Ta bəzmi buraxdı Xosrovi-ruz,
Saldı suya məş’əli -cahansuz.
Dinləmək içün qəfa məsafə,
Döndərdü qılıc qoyub qilafə.
Hər cəm’ dutub rəhi-mənazil,
Asayişə fürsət oldu hasil.
Vərqa quçi ilə xürrəmi şad,
Eyş ilə rəfiqü qəmdin azad.
Sərdari-ədu olub əsiri,
Almış dəxi qırx iki əmiri.
Ol gecə müxalifin sipahi,
Urub yerə miğfərü külahi,
Bir növ ilə durdular fəğanə
Yetişdi o nalə asimanə.
Verüb yelə nəqdi-e’tibari,
Bilməzlər idi məali-kari.
Hər birisi batdı min xəyalə,
Ta fikr edələr durub məalə,
Zira əgər olmaz olsa sərdar,
Zaye olur anda cümlə naçar.
Durmağlarıda cəhat düşmən,
Qaçmaqlarıda həzar rəhzən,
Hər kimsə nədür salur xəyalə,
Düzür anı rişteyi-məqalə.

## BU, SÜLH ETMƏGİDÜR ŞAHİLƏ OL QÖVMİ-PƏRİŞANIN

Hər söz dedilər vəziri-Əntər,
Rədd eylədi cümləni sərasər.
Dedi: – Gətirün Səlim şahi,
Olur çü bu kişvərin pənahi.
Ol sərvərə eyləmək mədarə,
Əlbəttə, qılar bu dərdə çarə.
Bu söz qəmunun olub pəsəndi,
Şəhdən götürüb o qıflbəndi.
Filhal yetürdilər hüzurə,
Ol sərvəri çəkdilər sürurə.
Ol şahə vəzirü cümlə ləşkər,
Üzr istədilər durub sərasər.
Dedilər ona ki, ey cəhandar,
Dövlət sənə qıldı, bizləri xar.
Bəxt eylədi Əntəri əsirin,
Biz cümlə bu gün sənin fəqirin.
Çün yenlə səni götürdü dövran,
Şükranəsinə gəl eylə ehsan.
Başdan yerə qoy həvayi-inat,
Ol yavuza yaxşı qıl mükafat.
Andan sənə gərçi yetdi nöqsan,
Yüz səncə ona yetişdi xüsran.
Biz cümlə səninlə eylərüz əhd,
Ta can ola əhdə eylərüz cəhd.
Qılgil arada bu sülhi qayim,
Ta rəf ola vəz'i-namülayim.
Qılsan belə hər güruh əsirin,
Dildarlıq eyləsin fəqirin.
Bu sülh edə gər girehgüşayi,
Sərdarımıza yetə rəhayi,
Bizdən sənə yetməyə qəramət,
Əldən qoyalum səni səlamət.
Şahi alub olalum rəvanə,
Ovd eyləyəlüm gələn məkanə.

Bu şərt ilə ta ki, ömrümüz var,
Birdən-birə yetməyə bir azar.
Açılmaya gər bu üqdi-müşkil,
Zaye'olasan sənə nə hasil?
Gər oldu isə bu söz qəbulun,
Uca çıqub əxtəri-üqulun.
Bu qövldə bizdən al vəsiqə,
Tapşurgilən ani bir rəfiqə.
Bizdən də bir ixtiyar, ey şah,
Vacib ola anın ilə həmrah.
Tə'kid bu sülhə qıl zəbani,
Salgil yola tez o tərcümani.
Göndər anı ləşkəri-həsarə,
Mərhəm qoyuban dili-figarə.
Şəh qıldı qəbul ol ehtizari,
Bu nəhc ilə eylədi qərari.
Yazıldı bu növ sülhnamə,
Yetişdi möhür xasü amə.
Xətm eylədi çünki xamə imla,
Şəh həm o misalə çəkdi tüğra.

## BUDUR, VƏRQA ALUB XALUSİNİ OL ƏNTƏRİ VERMƏK

Keçdi gecə, sübh oldu tale'
Dərban açdı dəri-məsafe'
Vərqa kimi çıxdı xur nəbərdə,
Min səncəqi saldı ol nəvərdə
Vəqti-səhər ol yəli-hicazi,
Durdu qıluban əda nəmazi.
Cəm' eylədi ləşkəri-giransəng,
Meydani-qətalə qıldı ahəng.
Geymiş tənə ətləsi-firəngi,
Düşmüş ona ol çü şiri-cəngi.
Yanar od tək çəküb zəbanə,
Yandurmaq içün dilər bəhanə.

Gəzməkdə hənuz qeyrəti-xur,
Düzməkdə cinahü qəlbi-ləşkər.
Ol kağəzi-Xosrovi-nikufal,
Vərqa tərəfinə qıldı irsal,
Qasid çü yetişdi paybusə,
Ərz eylədi hal o pak tusə.
Vərqayə verüb vəsiqeyi-şah,
Ol razdən ani qıldı agah.
Məzmuni-xitabə yetdi Vərqa,
Ləb açdı cavabə kim təana.
Ol sülh içün eylədi müqərrər,
Kim iki tərəfdə dura ləşkər
Xali oluna fəzayi-meydan,
Çün səhni-sərayi-dərdməndan.
Kimsə dəxi girmiyə arayə,
Razi oluban o macərayə.
Hər kimsə əlindəki əsirin,
Versin, alsın bədəl əmirin.
Rüxsətdür ol iki şəhriyarə,
Bu ərsədə ol gələ bu darə.
Gər qeyr qədəm qoya miyanə,
Başın qoya cayi-tərcümanə,
Hər kimsə nifaq edərsə peyda
Hazır mənu ol cidalü qovğa.
Bu tərz münadi qıldı avaz,
Zahir qəmuyə olundu ol paz.
Batin-zahir olub müvafiq,
Fe'lə gəldi o əhdi-sabiq.
Öz şahını hər kim aldı döndi.
Ol şivədə ləşkəri sevindi.
Çün mənzilə yetdi ol güzidə,
Vərqa ilə rövşən etdi didə.
Bağrına çü can basub o yari,
Qəmxarının oldu qəmgüsari.
Ol neyyəri-bürci-ovci-iqbal,
Üzr istəyü qıldı pürsişi-hal.
Min növ ilə eylədi dualər,
Verdi ona və'deyi-ətalər.

Dedi ona: – Ey mənim pənahım!
Halın nədür, ey ümidgahım?
De necəsi eylədün bu cəngi,
Nə lə'b ilə dutdun ol firəngi?
Gəlməkdə sənin kim idi yarın?
Şərh eylə bu əsli-karü barın.
Nə cövr səni bu rahə saldı?
Nə dərd səni bu ahə saldı?
Ey mən olayım tüfeyli-rahın,
Hər nayibədə xuda pənahın.
Yetdi sənə anda de nə külfət?
Dutdun bu diyarə ruyi-ülfət?
Noldu sənə tərki-yar qıldun,
Tənha səfər ixtiyar qıldun.
Ey atəvü anənin qərari,
Sənsiz nədür anlərin mədari?!
Guya ata-anə getmiş əldən,
Bu mülkə düşüb sən ol xələldən.
Yaxud səni qarət etdi düşmən,
Qıldun duruban cəlayi-məskən.
Ya qət etmiş əmü məhəbbət,
Andan yetmiş sənə küdurət.
Ya yarını verməmiş əmuzən?!
Qovğa dutmuş o xiş düşmən.
Yox-yox qələtəm, bil ey yeganə,
Təqdir düzüpdurur bəhanə.
Ta kim səni iltə bu diyarə,
Səndin buluna bu dərdə çarə.
Səndin əgər olmaseydi iqbal.
Bu mülkü ədu qılardı pamal.
Səndin əgər olmaseydi təşvir,
Məhbus idi ömr ilə məni pir.
Hala dəxi, ey gözüm çirağı,
Qəm çəkmə dur eyləgil fərağı.
Bu mülkü bu xaniman sənindür,
Nə-nə, qələtəm ki, can sənindür.
Oldunsa nə arzuya həmsər,
Dur, fe'lə götür bu malü ləşkər.

Çağırdı pəs Asəfi-zəmani,
Dilculiq ilə götürdü ani.
Şad eylədi sağəri-kəlami,
Ə'yanini ləşkərin təmami.
Açdı olara rüxi-bəşaşət,
Hər birinə verdi istimalət.
Ləşkər qəmu şahə göstərüb səf,
Pabusinə oldular müşərrəf.
Asudə bu yüzdə şahü ləşkər,
Öz qövminə çün yetişdi Əntər.
Tərk eylədi şiveyi-qərari,
Yıxdı ani dərdi-dilfigari.
Qeyrət muna der olurmu qail?
Olmuya ona murad hasil.
Olmaz o bunun çü zirdəsti,
Bir kişi ona verə şikəsti.
Ta bu işə qılmayım təlafi,
Tərk eyləmənəm durub məsafi.
Bu sözə durub qılan nəsihət,
Ol xəsm dilər mənə fəzihət.
Dil açdı qəmu ki, ey cəhandar,
Xar ola səni kim istəyə xar.
Sən şahü pənahisən bu xeylin,
Bu xeyl qəmu sənin tüfeylin.
Bir fikr edə gör ki, bu cəvani,
Rəf' eyləyəlüm aradən ani.
Gər dursa məsafə, eyləsə cəng,
Olmaz o cəvanə kimsə həmsəng.
Gər olmasa ol şücai-meydan,
Şahi-Yəmənin işidür asan.
Hər babdə fikr olundu büsyar,
Bu rayə düzüldü axiri-kar.
Gecə durub əksəri-sipahi,
Nəqb edələr ol nəbərdgahi.
Olduqda dəlük-dəlük o meydan,
Çün sineyi-mübtəlayi-hicran.
Xaşak ilə örtülüb nəzərdən,
Pünhan ola dideyi-həzərdən.

Yarın görə çünki ol dilavər,
Dutmuş bu nəbərdgahi ləşkər.
Əlbəttə, o əhdü bu xilafə,
Səbr eyləməyüb gəlür məsafə.
Dəf'inə verür bu çahlar nəf,
Ol Rüstəmi bir şəğal edər dəf.
Çün geydi cəhan libasi-matəm,
Bəzmidə itirdü camini Cəm.
Talib ona şəhneyi-sitarə,
Açdı yerə dideyi-nəzarə.
Xəsmə açulub dəri-muradi.
Fe'lə gəldi qərari-dadi.

## BU, ƏNTƏR ƏHDİNİ SINDURMAÜ VƏRQANİ DUTMAQDÜR

Pərgari-zəmanə dutdu dövran,
Saldı ələ möhrünü Süleyman.
Qoyduqda qədəm bu bargahə,
Divi-şəbi saldı qə'ri çahə.
Baş qovzadı yerdən ol firəngi,
Saz etdi yenə silahi-cəngi.
Dər' əgninə geydi, başə miğfər,
Açdurdu ələm, yeritdi ləşkər.
Bir dəmdə qoşun-qoşun sipahi,
Pür qıldı fəzayi-cənggahi.
Səf bağladı çaldurub nəqarə,
Göz dikdi təriqi-intizarə.
Müzdur o qasidi-nigahə,
Bijən necəsi düşər o çahə.
Şah ol gecə qıldı istirahə,
Xürsənd ədu qılan silahə.
Əksər bu idi anın gümani,
Gecə qayıdur əduyi-cani.
Açduqda dəri-dəfinə xazin,
Təkbir oxudu durub müəzzin.

Şah aldı vüzu qılub ibadət,
Fe'lə gətirüb lüzumi-taət.
Mənzil açulub düzüldü məhfil,
Məcls qurulub bəzəndi mənzil.
Kam istədi Xosrov arzudən,
Qafil o ədavəti-ədudən.
Gəldilərü qıldılar xəbərdar,
Ərz eylədilər ki, ey cəhandar,
Amadə olub ədu nifaqə,
Xətt çəkmiş ol ayeyi-vifaqə.
Mə'lum olunur ki, ol münafiq,
Almış ələ nəqsi-əhdi-sabiq.
Ol düşməni-din-əduyi-dünya,
Dutmuş yenə tazə rəsmi-qovğa.
Şah anladı çün o macərani,
Düşmən ona eyləyən ədani.
Dərvazə açub çıxardı ləşkər,
Tip bağladı düşmənə bərabər.
Əvvəldə o şiri-həngi-qeyrət,
İlhah ilə buldu cəngə rüxsət.
Sıçratdı səməndi-badrəftar,
Aldı ələ tiği-bərqkirdar.
Ol Rüstəmi-əzmü Bəhməni-rəzm,
Bir nəhcilə cəngə eylədi əzm.
Kim gördü ani gətürmədi tab,
Nə tab ki, zöhrə eylədi ab.
Ol fərdi-cidalə xətti-bariz,
Meydan dutub istədi mübariz.
Tə'nə oxunu qoyub kəmanə,
Min tə'n ilə atdı ol miyanə.
Çağırdı ki, əduyi-bidin,
Olsun sənə səd həzar nifrin.
Kafir xani, dün qılan qərarın,
Ol iqrarın, bu e'tibarın?!
Yox gizlü ki, ruzi-cəngü qovğa,
Gördün necədür cidali-Vərqa?!
Ögmək kişi özni narəvadur?!

Ötmüş sözü söyləmək xətadur!
Qoy çakərü ləşkəri kəranə,
Durgil bas özün qədəm miyanə.
Həmrəzm olalı bu gün mənü sən,
Açsın bizə didə dustü düşmən,
Hər kimsəyə tale’ etsə yari,
Bu biri ola anın şikari.
Heç kim ona çıxmadı nəbərdə,
Ta çəkdilər ani ol nəvərdə.
Vərqa sıçratdı rəxşi-sövlət.
Cənd etməgə əldə tiği qeyrət.
Nagah təpüldü payi-rəhvar,
Ol çahə ki, qılmış idi əğyar.
Girdabi bəlayə düşdü zəbzəb,
Batdı quyuya o mahi-Nəxşəb.
Atdan yerə düşdügündə Vərqa.
Aldı araya hücumi-ə’da.
Yüz yerdən ona atub kəməndi,
Bənd eylədilər o dilnəjəndi.
Şəh tip yeridüb qopardı məşhər,
Açdurdu ələm buyurdu ləşkər.
Şayəd ala əldin ol əsiri,
Üftadənin ola dəstgiri.
Bu şivədə çak qıldı sinə,
Saldurdu zəlazəl ol zəminə.
Gürdani-Yəmən olub səbükxiz,
Dağıtdı şərarə atəşi-tiz.
Yetdi o zəminə əbri-təşvir,
Baran ilə bərqi tirü şəmşir.
Can verməgə hər biri fədayi,
Ta kim alalar o dilrübayi.
Avazi-nəfir edüb fəğanlər,
Bazigər aradə pəhləvanlər.
Məvvac olub ol yəmi-sitizə.
Kim çaldı qılıc, kim urdu nizə,
Xun ləccəsi içidə təkavər,
Su atı kimi olub şinavər,

Şəmşir qılanda busə xüdi,
Can cismindən qılar dürudi,
Çün ol iki qıldı aşinalıq,
Bu rəşkdin eylədi cüdalıq.
Gördükdə tələttüfi-ətafə,
Düşdü zireh anda piçi-nafə.
Dər' oldu bədəndə xunə kəfgir,
Əzbəs anı dəldi misqəbi-tir.
Ol aradə badi-tiğ sındı,
Min-min yerə dökdü xur yandı.
Oldu o üqabi-xoş xüramın,
Tən cə'bəsi atılan sihamın.
Hərçənd ki, əsdi badi-qovğa,
Yetişmədi şahə buyi-Vərqa.
Nə göz gördü anın cəmalın,
Nə can buldu anın vüsalın.
Ta şamgəh ol hücumi-düşmən,
Açdurmadılar muradə rövzən.
Dəryayə düşəndə dürri-şəhvar,
Asan ələ salmaq ani düşvar.
Çün əjdəri-şəb saçub şərarə.
Yandurdu çirağini sitarə.
Göstərmədi nəxli-arzu bər,
Məhrum qayıtdı şahü ləşkər
Düşmən ələ salmış arzusin,
Doldurmuş o badədin səbusin.
Qafil ki, sipəhri-şö'bədəbaz,
Mümkün qıla özgə bazi ağaz.

## BU, ŞƏBROV HİYLƏSİ, VƏRQA XİLASİ, QƏTLİ-ƏNTƏRDÜR

Şah ol gecə girmədi hisarə,
Ordu ilə qondu bir kənarə.
Xatir məhzun o mübtəladən,
Vərqayə o gün olan cəfadən.

Xərc olmağı nəqdi-e’tibari,
Rəf’ eylədi rahətü qərari.
Keçdi gecədən bir-iki saət,
Yüz vermədi fikrdən fərağət.
Axırda xəyalə saldı xosrov,
Gər qoysa qədəm bu rahə şəbrov.
Şayəd ki, ola girehgüşayi.
Vərqayi-həzin bula rəhayi.
Şəbrov dediyi o kamkarın,
Sər əyyarı idi ol diyarın
Əyyar demə bəlayi-dövran,
Əmr ilə səfər qılub firavan.
Hər nayibeyi-qəmü bəladə,
Həmsəng idi əmrə bilziyadə.
Ol müdxilə ru verəndə müşkil.
Andan açar idi üqdeyi-dil.
Az kimsə o rahə eylədi dov,
Kim olmadı süftə guşi-şəbrov.
Bir-iki gün idi kim səfərdən,
Gəlmişdi o seyri-bəhrü bərdən.
Qafil idi şəh düşən bəladən,
Şərməndə idi o macəradən.
Çağırdı pəs ona söylədi dərd,
Təşrifilə qıldı cümlədin fərd.
Dedi ona: ey əyar pişə,
Bu dövlətə yarsən həmişə.
Çün sə’yinə yoxdurur nəhayət,
Ol sə’yi dur eyləgil riayət.
İmdadın ilə çox iztirarım,
Rəf oldu düzüldü karü barım.
İnsaf ola gər bu narəvadur,
Həqqa ki, mürüvvətə xətadur.
Vərqa ola düşmənin əsiri.
Boynunda o qüli-nagüziri.
Mən pəhn edübən bisati-rahət,
Asudə olub qılam fəpağət.
Gördün məni ol cəvani-novzad,
Nə dənglü bəladən etdi azad.

Yaxşımıdur etməmək təlafi,
Salmaq yüzə pərdeyi-məafi.
Təqsirinə üzrdür pənahın,
Əfv eylədi maməzanı şahın.
Qoygil bu gecə qədəm miyanə,
Bənd olma bu yalda başü canə.
Ola sənə tale edə yari,
Varub bulasan o dilfigari,
Gər qurtarasan anı bəladən,
Ərbab olasan bu gün ətadən.
Yarlığ yazulub verildi ən'am,
Yetdi ona ol nəviddən kam.
Əl qoydu gözə, yer öpdü şəbrov,
Qıldı anı ol əta səbükrov.
Keyvan kimi düzdü dəstgahi,
Geydi tənə kisvəti-sipahi.
Əyyarlığa nədür zərurət,
Ol və'z ilə durdu düzdü surət.
Pünhani bəla dək ol dilavər,
Dutdu yüzə rahi-qövmi Əntər.
İşrət gecəsi tək oldu kutah,
Ta göz açasan məsafəti-rah.
Orduyi-əduyə girdi ol tiz,
Çün bəriqeyi-əcəl bəlariz.
Pünhan-pünhan çü badi-şəbgir,
Çadır-çadır gəzərdi ol şir.
İqbali-şəh eyləyüb dəlili,
Göstərdi təbibə ol əlili.
Bir fövcə yetişdi oldu agah
Ol halə içində bağludur mah.
Açmışlar o mahə bu şümarə,
Ayineyi-didə çün sitarə.
Girmək ol arayə əmri-müşkil,
Fürsət ötər eyləmək təğafil.
Hər hiyləyə oldu danişi yar,
Bulmadı o şüğlə çalişi, bar.
Bilməzdi o dərdə rahi-dərman,
Heyran-heyran gəzərdi hər yan.

Cuyan-cuyan, əlaci-kari,
Ta mətbəxə düşdü rəhgüzari.
Gördü təbbax ətək miyanə,
Çalmış düzə tö’meyi-şəbanə.
Fikr ilə əlacə buldu fürsət,
Təbbax sifət düzəltdi kisvət.
Yetirdü özün ona nəhani,
Anın dili ilə həmzəbani,
Qıldı ona açuban hekayət,
Əvvəl öz ağasidən şikayət.
Dedi ona: ey mənimlə həmkiş.
Ağa cevrindənəm cigərriş
Oldu bu gecə sənə gürizim,
Rəhm eyləgil ey mənim əzizim
Yoxdur mənə ömr ilə fərağət,
Ol şüğlə əlavədür bu afət.
Bəd xülq durur biğayət ol mərd
Ən’amı qəmu cəfa durur, dərd.
Düşnamü səqət məvacibimdür,
Hər gün şəllaq vacibimdür.
Gər yaxşıvü gər yəman bişər aş,
Padaş mənə ağac durur, daş.
Yox zayiqəsi o meypərəstin,
Dutsun anı ahi zirdəstin.
Usciyə dək oddədur mədarım,
Çün dik siyah ruzigarım.
Nazir zəbti məni qoyub ac,
Etmiş təbün tiyanə möhtac.
Alur dügidən hesabi-danə,
Hər danəsi cövrə bir bəhanə.
Bu arədə bikəsü fəqirəm,
Acizlikdən ona əsirəm.
Yoxdur mənə bir müinü qəmxar,
Heç kimsə mənim tək olmasın zar.
Bu rəsmə qılub fəğanü zari,
Yaş dökdü çü arizi-bəhari.
Təbbaxın o şəxsə yandı canı
Aldı yanına o mihmanı.

Bir-birinə açdılar hekayət,
Hər kim öz ağasidən şikayət.
Şəbrov ani çünki qıldı ğafil
Aldandı bu alimə o cahil.
Pünhan o tə'amə döndərüb ru.
Qatdı ona bişüur daru.
Meyl eylədi hər kim ol qəzayə,
Saldı onu heyzeyi-bəlayə.
Ol ərsədə zurdəsti-tədbir,
Çün çəngi-əcəl olub gülugir.
Əlqissə o xeyli-bəndxanə,
Yaxdılar oda mətai-lanə.
Çün şəm' çəküb zəbanə şəbrov,
Vərqa tərəfinə saldı pərtov.
Gördü ki, o mübtəlayi-əğlal,
Zindani-qəfəs içində çün Zal.
Təprənməgə yoxdurur məcali,
Əğlal ilə bağlu pərü bali.
Səgritdi o cür'əti-səməndin,
Sındurdi tilismü sökdü bəndin.
Çəkdisə bir az məşəqqətü rənc,
Gənci ələ saldı ol göhərsənc.
Olduqda xilas bənddin şir,
Ol məc'məə sundu cam şəmşir.
Razi muna olmayub dilavər,
Dutdu rəhi-bargahi-Əntər.
Tiz ol aradan keçirdü sayə,
Pa qoydu səbük hərəmsərayə.
Ölmüş qəmu gördü pasibanlar,
Gündüzdə cəfaçəkən cəvanlar.
Ol müdbiri həm şərabi-idbar,
Şur arturub eyləmiş nigunsar.
Ləb təşnə yetişdi bustanə,
Ol takdən üzdü hindivanə.
Baş tapmada eyb yox o bəbrə,
Əksər olur qəza hüjəbrə
Məclis pozulub sınub sürahi,
Uşandı səbu, döküldü rahi.

Verdi yelə ömri şahü şahid.
Ahəstə pəs ol iki mücahid
Çıxdılar o vərteyi-bəladən,
Cəhd onlardan, zəfər xudadən.
Həmduşduq eyləyüb nəsimə,
Ta təb'i yetirdilər Səlimə.
Şəbrov çü yetişdi bargahə
Ol fərqi buraxdı payi-şahə.
Vərqa ələ düşdügü səlamət,
Həm düşmənə yetdügü qəramət.
Qıldı yenə növcəvan o piri,
Sürx eylədi guneyi-zəriri
Vərqa yer öpüb Səlim şahə,
Məğrur əlindəki güvahə.
Dedi ona: ey dün içrə mahım,
Vey sayeyi-dövlətin pənahım.
Gər zahir olursa mərgi-Əntər.
Bir fikr özünə qılar o ləşkər.
Yegdur qıla hal mövci-Ceyhun,
Seylab duta fəzayi-hamun.
Şəbgir edə ləşkəri-əduyə,
Düşmən dura ta ki, cüstü cuyə,
O ləşkəri bu sərü o sərdar,
Yox olmağı lazım eylər əfkar.
Qılduqda sitarə sər büləndi,
Bu söz şəhin oldu dil pəsəndi.
Durdu əyağə o bəhri-mövvac,
Dutdu yüzə rahi-qətlü tarac.
Ta göz açasan o seyli-hamun,
Orduyi-əduyə urdu şəbxun.
Baş qavzamağa kim oldu xürsənd,
Verdi yelə sər hübab manənd.
Bir cəm' görüb o darügiri,
Dutub rəhi-mənzili-əmiri.
Gəldilərü oldular xəbərdar,
Bisər yatur ol aradə sərdar.
Etdi onların kəlafə başi,
Sərsiz necə tən qılur səvaşi?!

Çox oldu ol azdin müşəvvəş,
Min tudə səfinə bəs bir atəş.
Çox tənləri qıldı bərqi-şəmşir,
Çün cami-əcəl həyatdən sir.
Xəncər durub etdi dəf'i-sovda,
Çox sərləri qıldı nayibi-pa.
Ol ərsədə qan çü abi-ərmən,
Mahi tək içində nə'şi-düşmən.
Bağlandı ədu əlü ayaği,
Yuzineyi-çeşm axıtdı yaği.
Künd eylədi tiği-xəsmi-idbar,
Ursa nəmədə ox eyləməz kar.
Uzatsa biri əlin kəməndə,
Atmaqda özün salurdu bəndə.
Urmaq diləyən birinə xəncər,
Xəncər özünə urardı əksər.
Bu səhl durur dönəndə dövlət,
Yetir təni-filə murdən lət.
Ruzi kimə oldu xani-hirman,
Palud ola gəlbətini-dəndan.
İqbal kimə açursa pəhlu,
Zəhr ola məzaqə nuşdaru.
Gər yüz verə bağbanə idbar,
Bostanidə toxm gül verə xar.
Hasil kimə nəkbət oldu puşiş,
Nəf' eyləməz ona dəxi kuşiş.
Əhli-Yəmənin cəvanü piri,
Alub ələ şiveyi-dəliri.
Qayim qıldı tənabi-nüsrət,
Ol rəzmdə sayibani-dövlət.

## BU, DÜŞMƏN BASULUB, VƏRQAHİCAZƏ OVD QILMAQDÜR

Rəf eylədi ta ki, bürqeyin hur,
Xəffaşlar oldu cümləsi kur.
Baş qavzadi çün nəhəngi-qülzüm,
Mahi sifəti ədu olub güm.

Doğduqda Səlimin aftabi,
Kəm oldu sitarənin hesabi.
Ol şö'leyi-nar dəf' edüb dud,
Göstərdi muradi verdi məqsud.
Əlqissə, ol atəşi-bəladən,
On min kişi sıçradı aradən.
Dutdular üzə rəhi-fərari,
Səyyaddən nəçük şikari!
Oldular o yerdə dəşt peyma
Tale kimə ta qıla müdara.
Talanə düzüldü tar, qanun,
Ədna kişi malə oldu Qarun.
Şah etdügü qarətin hesabi,
Üç min fərd oldu iktisabi.
Şəhrə qayudub şəhi-müzəffər,
Mənsur anınla cümlə ləşkər.
Qəm oldu nəhan, göründü işrət,
Yüsr oldu əyan, güm oldu üsrət.
Vərqayə ol aftabi-mənsəb,
Bir işrətgah edüb mürəttəb.
Ta oldu vəsadə bu köhən fərş,
Anın kimi xanə görməmiş ərş.
Gündüz gecə ol hümayi-sayə,
Saldı Vərqayə zilli-vayə.
Duydu ona neyləmiş zəmanə,
Nə oxlara eyləmiş nişanə.
Dildarlıq eylədi firavan,
Dərdinə verüb ümidi-dərman
Der: qəm yemə, ey gözüm çirağı,
Yıxmış səni gərçi zülm ayağı.
Hasil bizədür bu gün fərağət,
Bir neçə zaman qıl istirahət.
Meyl eylədügündə ol diyarə,
Min-min bəxti çəkəm qətarə.
Bar eyləyim ol qədər zərü sim,
Kim düşə zəminə lərzədin bim.
Malım, mülküm sənin xəracın,
Qılgil qəmu sərfi-ehtiyacın.

Bilmə bu sözümdə rib zinhar,
Səndin özgə dəxi kimim var?
Bitməkdə o şüğli-dilkəbabın,
Vardur görürəm çox iztirabın?
Bu şivədə mən’ narəvadur?
Həqqa sənə mən’ həm xətadur.
Ovd eyləgilən bir ol diyarə,
Ol qovmi buraxma intizarə.
Çün damına düşdü ol təzərvin.
Qəd çəkdi riyaz içində sərvin.
Durgil bu əna olub rəvanə,
Varis ola gör dudmanə.
Gər kisədə, qalsa nəqdi-həsti,
Edəm ani sərfi-həqpərəsti.
Sən varisi-mülksən nəbirə,
Qoy başına tac otur sərirə.
Ey bülbüli-bustani-mülkət,
Ta əldə durur bəhari-fürsət,
Eyş eyləgilən girüb bu bağə,
Qoy pa bu vəsadeyi-fərağə.
Altı aya dək bu rəsmi-şahın,
Xurşidi sipəhri bargahın,
Qövli, qəmu hərfi-dilnəvazi,
Fe’li qəmu şüğli-karsazi.
Əsbab düzüb o mah çöhrə,
Qədr ilə anı yetürdü mehrə.
Həmrah ona qıldı ol qədər mal,
İncitdi zəmini həllü tərhal.
Yükləndi büxati durdu hovli,
Fərsəx-fərsəx qətari-tuli.
Beş min igid eylədi müqərrər,
Ol qeysəri-şəhrü Xosrovi-bər.
Ta kim qoşalar səda o sazə,
Ol qazini iltələr hicazə.
Şəh çıxdı anınla iki mənzil,
Qayıtdı vidaə bağlayub dil.
Bu nəhcilə düşdü rahə Vərqa,
Bilməz ki, nə oldu hali-Gülşa,

Salmış ələ bu vüsal içün gənc,
Çəkməkdə bu bir fəraqdin rənc,
Bu istər ola anı qərini,
Zülmilə ol özgə həmnişini.
Bu zövqilə dutdu rahi-lanə,
Qeyr eylədi ani şəm'i-xanə.
Bülbül çəkməkdə gül əzabın,
Əğyar istər gülün gülabın.
Bu sandı ki, firqət oldu axir,
Ol tazə fəraqə düşdü zahir.

## BU, MÖHSÜN ŞAHİ-ŞAMİ VARMAQÜ GÜLŞANI ALMAQDÜR

Saqi, məni yıxdı ehtiyacım,
Qəm eylədi münqəlib məzacım.
Yox səbr dəxi bu inqilabə,
Möhtacəm əlindəki şərabə.
Necə verə bu qübari-surət,
Ayineyi-xatirə küdurət.
Vergil mənə badeyi-zücaci,
Oldur bu küdurətin əlaci.
Vermə anı qeyrə, ey təbibim,
Ol badə durur mənim nəsibim,
Getdim əgər iki gün nəzərdən,
Gizləndim o şahidi-bəsərdən.
Açmə yüzə rahi-bivəfalıq,
Səhl ola bir-iki gün cüdalıq.
Ol rəncbəri-riyazi-əxbar,
Bu növ' ilə qıldı qürsi-əşcar.
Kim var idi Şam ilində[1] bir şah,
Dad ona cəlisü ədl həmrah.
Möhsün adı ol xücəstə namın,
Sahib ehsani mülki-Şamın.

[1] Elində

Anın kimi çəkməmiş miyanə,
Bir nəqş müsəvviri-zəmanə.
Kim ədlinə sürsə rəxşi-təmsil,
Kəsri qala ünsdə dü səd mil.
Gər cudi ələm açarsa pərçəm,
Müdxil ola andə nami Hatəm.
Aləm qəmu helminin rəhini,
Adəm qəmu ədlinin əmini.
İnsafi yetəndə ittisafə,
Şəmşir bəyan girər qilafə.
Zati qəmu nəqsdin müərra.
Nət'i qəmu eybdin mübərra.
Hər nə dilər arzu müyəssər,
Liykən verməz şükufəsi bər.
Sövdayi-məza vəcində hali,
Ol suddən idi dəst xali.
Əsdafə tökərdi qətrə neysan
Lö'lə verməzdi dişrə ol kan.
Ol mə'nəvi mə'dəni-mürüvvət,
Ol mümkünü məxzəni-fütüvvət,
Olmuşdu o qüssə paybəndi,
Olmazdı o şivə dilpəsəndi.
Hər kanın eşitsə ismü rəsmin,
Gəncin aluban pozar tilismin,
Düşməz ələ liyknəqdi-xatir,
Olmazdı güli-murad zahir.
Bir gün durub ol şəhi-cəvanbəxt,
Gülzari-nişatə göndərüb təxt.
Açdurdu riyazi-eyş babın,
Çağırdı o şəhr şeyxşabın.
Hər qövmdən ol büländ payə,
Bir cəm'ə yetirdü zilli-vayə.
Mənzil-mənzil gəzərdi ol mah,
Hər qövm ilə söhbət eyləyüb şah,
Ol dövrdə yetdi payi-pərgar,
Bir mənzilə kanda[1] idi tüccar.

[1] Ki-anda; ki, orada

Ol söhbətə şah qıldı rəğbət,
Gərm eylədi anlar ilə söhbət.
Əsnayi-mühavirətdə əshab,
Bir tayifi açdı gəncdin bab.
Qılduqda dua şəhi-cəhanə,
Gülşa sözünü salub miyanə,
Bir tərz ilə rəngi-ruyi-tə’rif,
Verdi şəhə saydı nəqdi-tovsif.
Düşdü şəhə şövqi-qayibanə,
Yandurdu oda mətai-lanə.
Şəh dedi ona ki, ey cəvanmərd,
Mə’lum olunur ki, səndə var dərd.
Durduqca sözün təmam əsərdür,
Xurşidə bu nuri-rahbərdür.
Döndü mənə hal bu xəbərdən,
Düşdü dilə suz ol şərərdən.
Ol kim qərəzin bəyandəndür,
Söylə görəyim nə kandəndür?
Gər layiq ola bü qədrü şanə,
Tiri-tələbə qılam nişanə.
Xacə dedi: olmasın məlalın,
Düxti durur ol məlik hilalın.
Qərdaşı yerinə imdi şəhdür,
Ol qövmara sahibi-küləhdür.
Əhyayi-hicaz rami anın,
Bəllüdür o yerdə nami anın.
Əmma ki, ol afəti-zəmanə,
Qoyduqda əvəl qədəm cəhanə.
Bazari-cəhan salub nəzadə,
Bənd olmuş o qeydi-namzadə.
Liykən arada oxunmamış əqd,
İstər bular ol nigah içün nəqd.
Damadə yetüb bəsi xəsarət,
Əsbabilə mali oldu qarət.
Vərqa adı ol məlik xisalın,
Qərdaşunun oğludur Hilalın.
Guya degil atə-anə razi,

Mənzur olara kəlami-mazi,
Talib olu ki, bular dilər mal,
Yoxdur ona malü eylər ehmal.
Boş sağəri badeyi-əməldən,
Avarə olubdur ol xələldən.
Yox varü yoxundan ittilaim,
Al, ya alma budur mətaim.
Eşitdi qəmu şəhi-niku fal,
Ol taciri-taifidən əhval.
Meyl eylədi özü ol diyarə,
Bildi ki, bitər onunla çarə.
Ol mətləbi saxlayub nihani,
Ta olmuya ona kəsri-şani.
Yüz dutdu təriqeyi-güzafə,
Der Kə'bəyə gedirəm təvafə.
Bəs Məkkə saru yeritdi məhmil,
Əsbab götürdü, kəsdi mənzil.
Götürdü özilə ol qədər mal,
Həsrində zəbani-əql olub lal.
Olduqda müşərrəf ol təvafə,
Pa qoydu təriqi-insirafə.
Çün bərri-mə'yin oldu mə'bər,
Oldu bələd ol təriqə rəhbər.
Hər kimə ki, ol qılar güzari,
Yetər ona ömrünün mədari.
Hər qövmə ki, ol olurdu mehman,
Verirdü o cəm'ə hasili-kan.
Gördü hər mərz mərzibanın,
Ehsanilə bağladı zəbanın.
Çün duydu anı səvakini-bər,
Oldu ona cümlə töhfə avər,
Bilfərz ona kim gətürsə bir nan.
Padaş görür cəhani-ehsan.
Ehsani-şəhi-xücəstə ayin,
Qoymadı o bərr içində miskin.
Bir həmdəmi kim qılurdu məhrəm,
Təqribilə ol şəhi-mükərrəm,

Əhvalını istəşüb Hilalın,
Açar sözün ol pəri xisalın.
Cümlə dedilər ona ki, ey şah.
Yox bu arada ədili-ol mah.
Həqqa ki, degil bəşər o huri.
Qüdsi kimi yox anın qüsuri.
Vəsfində zəbani-əql-ə’cəm,
Bu şivə ona durur müsəlləm.
Ol xosrovi-kişvəri-səxavət
Hər gün bir ağac kəsüb məsafət
Ta yetdi büneyni-Şeybə rahi,
Qarşuladı pəs Hilal o mahi.
Qılduqda əda rüsumi-təslim,
Fe’lə yetişüb lüzumi-tə’zim.
Dedi ona, ey bülənd sayə,
Sal sayeyi-lütf bu hümayə.
Təşrif ilə qıl bizi müşərrəf,
Lütfin ilə olalum müləttəf
Bu şərt ilə eyləyüb iqamət
Bir neçə gün edəsən fərağət.
Şükranəsinə ol iqtifatın,
Padaşına eyləyən səbatın.
Nə mal, durub nisar edəm can,
Layiq o şəbaşədür bu mehman.
Qılduqda Hilal lütfi-vafir,
Dil açdı cəvabə ol müsafir.
Pəs söylədi, ey güzini-əşraf,
Bənd etdi məni bu dami-əltaf.
Kəsdi yolu ləcceyi-məhəbbət,
Yıxdı məni badeyi-məvəddət.
Saldı bizə sayə çün hümayın.
Fərman-fərmanü ray-rayın.
Səd şükr xuda, bu biəzaət,
Kəsb eylədi sə’yidən səadət.
Yolçu vara gər təriqi-duri,
Yol kəsmədədür anın hüzuri.
Əglənməgə çünki var neylin,
Yaxşı olmaz xilafi-meylin.

Həqqa mənə dəxi bu şərəfdür,
Ömr olmasa yarsız tələfdür.
Yüz şükr ki, hasil oldu fürsət,
Yetişdi bizə bu feyzi-xidmət.
Döndərdi o hillə irtihali,
Bədr eylədi yenglədin hilali.
Ol sərvərə saldı sayə Cəmşid.
Çün təhti-şüai-mahü xurşid.
Bir həftə o mərz mərzibani,
Mehmaninə qıldı mizbani.
Bin lütf ilə göstərür cahandar,
Hər saəti şahə tazə rüxsar.
Şəh Möhsün o neyyəri-cəhantab.
Açdı duruban zəxirədin bab.
İl[1] adəmini yıqub sərasər,
Bəxş eylədi zər, dağıtdı gövhər
Nikü bədə qoymayub təmizi,
Xurşid tək etdi feyzi-bizi
Ehsan anın ilə düzdü şanın,
Adın eşidən verirdü canın.
Firdovs misal olundu pünhan,
Ol qövm arasında rəşki-hirman.
Növbətzəni-Şam hər səhərgah,
Bir töhfə qılardı xasseyi-şah.
Durardı düzüb təbəq-təbəq zər,
Mərcanü əqiqü lə'lü gövhər.
Sandıq-sandıq mürəssə alat,
Yük-yük belə məhmilü səqərlat.
Baş-baş sayub ol niku şəmayil,
Eylərdi cəm'i cinsə şamil.
Üzr istəyü göndərir Hilalə,
Heyran qalmış Hilal o halə.
Ol sahibi-təxti-istitaət,
Bu pürsişə qılmayub qənaət,
Ol töhfələrə qoyanda bünyad,
Banu Qəməri dəxi qılur yad.

[1] El

Ta ram ola görsə bu xəraci,
Əhli-hərəmin dəxi məzaci,
Əzbəs ki, saçıldı danəvü dam,
Səyyadə qılub vəhşi olub ram.
Çün şahə bu şivə oldu zahir,
Seyd etdi mücaviri müsafir.
Filhal çağırdı bir ləbibi,
Ta ol mərəzin ola təbibi.
Bir söz bilici cəhan həkimi,
Hər məşğələdə anın nədimi.
Şər şüğlə o filsofi-kamil,
Ta döndərə yüz olurdu hasil.
Bir kargüzari bir füsunsaz,
Bir raz ənbazü nüktə pərvaz,
Göftarə gəlüb qılanda təqrir,
Təqriri edərdi daşə tə'sir,
Ən'am ilə eyləyüb bərümənd,
Götürdü o gənci-xanədin bənd.
Şərh eylədi ona cümlə halın,
Başındakı arzu xəyalın.
Dedi ona: durgil, ey süxənsənc,
Bu babdə çək məşəqqüt rənc.
Məndin getgil Hilal şahə,
Ərz eylə dua o mehrü mahə.
Söylə ona, ey şəhi-hicazi!
Sən Kə'bəyə bağladım nəmazi.
Ta ömr ola bu qəbilədin dil,
Döndərmənəm, ey niku şəmayil.
Gərm oldu aradə aşinalıq,
Müşkül görünür dəxi cüdalıq.
Ol xosrovdən budur ümidim,
Qət etmiyə rişteyi-nəvidim.
Çün ilkdə lütf qıldı ağaz,
Axırda həm eyləyə sərəfraz.
Qəvvaslıq eyləyüb bu mehman,
Sən bəhrdən istər oldu mərcan.
Üzmə gəl əlimni damənindən,
Cövhər bizə ver o mə'dənindən.

Qıl nəxli-ümidimi bərumənd,
Ol qönçəni bu nihalə peyvənd.
Çün nəsli ümiddən təhi cam,
Ola ki, verə bu arzu kam,
Dola o sürahidin əyağım,
Ol nuri görüb yana çirağım,
Meylim bu, o şəbcirağİ-nami,
Neylim bu, o gövhəri girami,
Eyləyə şəbi-ümidimi ruz,
Bilsübhi-ümidi ruzi-novruz.
Zahir ola mahdən sitarə,
Lö'lö düzə əqdi-ruyi-karə.
Ey qibleyi-dideyi-iradət,
Şahənşahi-məsnədi-səadət.
Bu şivəni şanə ar bilmə,
Mehmanını xarü zar bilmə.
Bəllü bu xəlasədə əyarım,
Bir-birinə yüz var e'tibarım.
Hər nə'tdəyəm şəhiri-afaq,
Həm bəzmə vəhidü rəzməyəm taq.
Bu gəlməkü qılmağımda xidmət,
Hər bisərü payə qılma nisbət.
Sikkə zireh urdu nəqşi-namım
Şahid muna xətti-nəqdi şamım.
Əhbabi-mühibbətim füsuni.
Ə'dayi-ədavətim cünuni.
Vermiş ona qürrətü büləndi,
Qılmış munu dərdə müstəməndi.
Bu əmrə durur necə zəruri,
Olmazsa biri bular qüsuri,
Birisi igitligü biri mal,
Birisi kəmaldur biri hal.
Biri həmqədrü biridür din,
Lazım ikiyə bir olmaq ayin.
Yüz şükr bu cümlədin hüzurəm,
Var-yox bu zərurdin qüsurəm.
Ol yarə ki, çeşmi-intizarın,
Var idi anın ilə qərarın.

Ol qılduğu və’də oldu axir,
Nəbudü nə budu oldu zahir.
Avarə olubdur ol təhi dəst,
İdbari büləndü rütbəsi pəst.
Ol kim ona idi ruyi-rahi,
Anın də pozuldu dəstgahi.
Əntər gəlüb etdi zurdəsti,
Verdi Yəmən əhlinə şikəsti.
Ol kişvəri qıldı qətlü qarət.
Yetirdü o sərvərə xəsarət.
Bazar yanub pozuldu ayin,
Məhbus durur şəhü səlatin.
Vərqa andasa[1] oldu zaye,
Gər bilməsə anda döndü tale,
Dərdinə əgər buleydi çarə,
On gəz gəlmişdi bu diyarə.
Yoxdur ona gəlməgi xəyali,
Gər gəlsə, de qani mülkü mali?!
Ol sərvərdin var iltimasım
Bu şüğlidə yüzmiyə əsasım,
Görsən məni ansan ol əzizin,
Bu igidin eyləsən təmizin,
Qansısına meyl edürsə peyda,
Çəksin durub ol misalə tuğra.
Dəxi de o banuyi-zəmanə,
Bu xeyr işə qılmasın bəhanə.
Vərqa hərçənd canə candur,
Vacib sənə qədri-mihmandur.
Vərqayə əgər yetər qərabət,
Yox ona bu miknətü bu halət.
Vərqanın əgərçi var nazi,
Yoxdur ona xud bu şüğlü sazi.
Gər yüz rəd eyləsən səvalım,
Qayıtmağa yoxdur ehtimalım.
Hərcayi degilmən, ey səmən buy,

[1] Anda isə

Ta bitməyə kar döndərəm ruy,
Eylər qəmu mülkü mali şabaş,
Ömrüm olalı bu başü bu daş.
Bu nəhcilə qıldı dürfəşani,
Bəs saldı təriqə tərcümani.
Düşdü yola mö'bədi-süxənsənc,
Kan etmiş ani zəxireyi-gənc.
Ərbabi-mətai-qilü qalə,
Bir bari-cəvabəvü səvalə.
Bal açdı fəzayi-pişgahə,
Pərvanə yetişdi şəm'i cahə.
Ol babdə sahiri-süxənsaz,
Bir növ ilə oldu nüktəpərvaz.
Xəm qıldı qədi-Hilali heyrət
Bulmaduğidin cəvabə fürsət,
Durdu gedübən hərəmsərayə,
Ta vaqiəni deyə ol ayə.
Banuyi-hərəm çü oldu agah,
Kim onlardin qız istər ol şah.
Xəndan-xəndan dedi Hilalə,
Bu fikrdə batma gəl xəyalə.
Gör rəddü qəbul qansıdur sud,
Dut ol ikidin təriqi-behbud.
Dedi ona: ey mənim ənisim,
Hər guşeyi-razdə cəlisim.
Kim istəsə gəncü mali-aləm,
Ol babdə bu durur müsəlləm.
Növbətzənidür təmam Şamın.
Sərxeyli durur o xasü amın.
Var bizə qərabətində çox sud,
Var feyzi-vücudi gənci-məqsud.
Vermək ona qız degil ziyanım,
Birinə – yüz arta qədrü şanım.
Bu şüğlə əgərçi ramdur dil,
Vərqa sözüdür aradə müşkil.
Gər muna verəm ol aftabi,
Vərqa gəlsə nədür cəvabi?!

Mundan əgər edə yüz kəranə,
Qorxum bu ki, gərdişi-zəmanə,
Vərqa xeyirinə olmuya yar,
Avarə anı qılə o qəddar.
Ol gündə bizə yetə qəramət,
Nə sud qılur dəxi nədamət?!
Əldən çıxacaq bu rəncsiz gənc,
Bu dadə nədarəd ola şeşü pənc.
Belə deyilür ki, Əntəri-gəbr,
Ol şahi-Səlimə eyləmiş cəbr,
Gər sihhəti olsa bu kəlamın,
Qalmamış ola meyi – o camın?
Vərqa nə yüz ilə bu diyarə,
İstəyə gəlüb bu dərdə çarə?!
Mundan bir növ o novcəvani,
Saldun yola yandı cismü cani.
İnsaf əgər olursa mənzur,
Bizdən o figar olundu rəncur.
Etdük anın ilə bivəfayi,
Qılduq ona bu qəmu cəfayi.
Əfsus ki, yar çıqdı əldən,
Şərməndeəm imdi ol əməldən.
Kədbanu çü gördü kədxudasın,
Vərqa qəmidin olan cəfasın.
Göz yaşını dağıdub o pürfən,
Öz küştəsi içün etdi şivən.
Bir rəng ilə qıldı muyə ağaz,
Od saldı dili-hilalə ol saz.
Pəs göz açuban dedi Hilalə,
Qoyma şərəfin düşə vəbalə.
Yox faidə çəkməgin nədamət,
Vəpqa ölmüş, sən ol səlamət.
Bir neçə zəmandur, ey vəfadar,
Bu vaqiədin mənəm xəbərdar.
Bu şivədə səbri-payi-mərdi,
Səndin pünhan edüb bu dərdi,
Yox faidə qılmağgumdan izhar,
Düşmən sözünə ola xəbərdar.

Gər bu sözün olməsə vüqui,
Vəqtində qılardı ol rücui.
Bu gəlməməgi qılur dəlalət,
Kim doğru durur ona bu halət.
İmdi sənə həm budur səzavar,
Pünhan edəsən bu rəmzi, ey yar.
Döndərmə bu qüssədin məzaci,
Yox oldu və nəng əlaci.
Ölməkdə nə eylədün Hümamə?!
Sən qıldun anı bu nik namə,
Məşhur bu göftilə şünudə,
Min yazidə olsa yeg bir evdə,
Övrət ərə söz demək xətadur,
Sən aqilə pənd narəvadur?
Qəmdin özü bihüzur qılma,
Bu surü süruru şur qılma.
Ola ki, xilaf ola bu göftar,
Qayıda əgər səlamət ol yar,
Bu qüssədin olma gəl hərasan,
Dilcuyliqi anındur asan.
Çün və’dəsinə yetişdi qayət,
Mə’qul degil qıla şikayət.
Qıl dövlətini bu rahə rəhbər,
Fövt olmuya ta güzari-əxtər.
Gər zil ələ versə leylətül-qədr.
Fövt etməgi ani əqlədür ğədr.
Bir başə qona hümayi-dövlət,
Uçurmağıdur nişani-nəkbət.
Vəsvas o sədrə qıldı xənnas,
Bir nəhc ilə düzdü söz o nəsnas.
Döndərdi rəvan dili-Hilali,
Ol nəqddin etdi dəsti-xali.
İş püxtə olub o xam rayə,
Döndərdi cəvab o canfədayə.
Der söylə ona ki, ey yeganə,
Rövşən oldu çirağı-xanə.

Lütfün durub oldu çün dəhənbənd,
Aldı bizdən rizayi-peyvənd.
Döndərdi müfərrəhin məzacım,
Yox verməməgimdə həm əlacım.
Əmma andan bu iltimasım,
Var tə’neyi-xəlqdin hərasım.
Ol dür çü bir özgə dürcədür bənd,
Ömrü ilə bilgil, ey xirədmənd.
Çıqduqda o dürcdin bu danə,
Tə’nə oxuna olam nişanə.
Gər zahir olursa bu əlamət,
Nikü bəd edə məni məlamət.
Gəl görmə rəva mənə zəbuni,
Bir növ’ apar o mahruni,
Ol şivədin olməsin xəbərdar,
Bu dairə içrə hiç dəyyar.
Çün qasidə oldu bu işarə,
Açıldı ona dəri-bəşarə.
Qayıtdı rəvan o müjdə avər,
Dedi şahə qissəni sərasər.
Tə’kidi-bəliği-həzrəti-şah,
Az kimsəni andan etdi agah.
Əsdi çü nəsimi-vəsli-dildar,
Pəs durdu şəhi-xücəstə kirdar.
Əsbabi-nikahə saldı sayə,
Ol ilə[1] qəmu yetürdü vayə.
Göndərdi Hilalə mali-büsyar,
Rəsm içün o şahi-nikkirdar.
Ol ləcceyi-malə verdi çün dil,
Kəşti qiyası itürdü sahil.
Pünhan-pünhan o karsazi,
Oldu düzülüb qəmu cəhazi.
Əqd oldu yazıldı mehrnamə,
Kabini kəsildi Mülki-Şamə.
Əmma xəbəri yox ol nigarın,
Bu əqddin ol dili-figarın.

---
[1] Elə

Ata-ana çün o dilnəjəndi,
Qılduqda nikahi-paybəndi,
Həngameyi-və’də oldu axir,
Vəqt oldu qıla səfər müsafir,
Durmuşdu təriqi-intizarə,
Ta bürcə gələ o mahparə.

## BU, GÜLŞAYİ-HƏZİNİN ANASİLƏ MACƏRASİDÜR

Çün sağəri-badeyi-vüsalın,
Yə’ni anası o məh xisalın,
Pünhan qəmu düzdü dəstgahi,
Ol gecə ki, edər idi rahi.
Yıqdurdi cəhazi bir zəminə,
Ərz etdi qəmu o nazəninə.
Şayəd ki, malə ola mayil,
Özün bəzəyüb düzə şəmayil.
Ol vaqiədin qılub xəbərdar,
Dedi ona: dəxi çəkmə azar.
Hərçənd ola səndə sərgiranlıq,
Lazım mənədür bu mehribanlıq.
Şadiyi zahir qəm oldu axir,
Təqdiri-xudayə olma kafir.
Dur vergil özünə ziynətü zib,
Sən yarə bu şivə eybdür eyb.
Çəkmə dəxi qüssəvi məlali,
Al ayinə düzgilən cəmali.
Bu surətə qılma tirə mir’at,
Bəlkəm durub eyləgil mübahat.
Bilgil muni, ey rəvani-madər,
Dövlət oldu sənə müyəssər.
Nahidə müqarin oldu ol mah,
Yə’ni sənə həmsər oldu bu şah.
Yetdükdə bu bürcə aftabi,
Qıldı səni Şam mahtabi.

Çün yandı bu nurdən çirağın,
Ol camilə tazə qıl dəmağın.
Ol kim sənə qoymuş idi əngüşt,
Olmadı durub səninlə həmpüşt.
Tərk eylədi getdi bu diyari,
Yığ xatirü çəkmə intizari.
Bir kişi ki, istəməz vüsalın,
Sən dəxi kəs andan ittisalın.
Mundan gedəli bəsi zəmandur,
Məchul işi sud ya ziyandur.
Vərqayə əgər biteydi məqsud,
Bu canibə qayudurdu ol zud.
Ya bitmədi varduğunda kami,
Yaxud aradən güm oldu nami.
Ya bir gözəlin görüb cəmalın,
Aldandı ona verüb xəyalın.
Həqqa ki, dəlildür xəyalə,
Əglənməgi bu üç ehtimalə.
Həm qılduğu və’də oldu axir,
Göstərmədi məhmil ol müsafir.
Əhli-Yəmənə yetən bəlani,
Əntər olara qılan cəfani.
Şərh etdi qəmu o mah ruyə,
Rəh bağladı anda göftguyə.
Gülşa ki, xəbərdən oldu agah,
Kim neyləmiş ona bəxti-gümrah.
Düşdü tənü cani iztirabə,
Aciz qaldı durub cəvabə.
Bəs eylədi firqəti bəhanə,
Durdu o vəsilədin fəğanə.
Dedi anaya: Nədür bu tədbir?
Məndin nişə oldu xatirin sir?
Yenglə məni dilfigar qıldun,
Qürbətdə zəlilü xar qıldun.
Bu mülkdə yeg mənə gədalıq,
Yox Şam ilində padşalıq.
Tənha düşdüm mən ol diyarə,
Möhtac oldum ənisü yarə.

Gər dərdi-dilə olam giriftar,
De kimə qılam o dərdi izhar.
Başımda mənim yox ər həvasi,
Canə qəmu dərddür dəvasi.
Cayizmi durur bu, ey müsəlman?
Heç kimsəyə aşkarü pünhan,
Bir vəqtdə edələr müqərrər,
Bir övrətə sahib iki şövhər?!
Bir seydə quran bu iki dami,
Qanda aparur o nəngü nami?
Mal oldu sənin bu gün vəbalın.
Beytülmala qala bu malın!
Oldun mənü yar səddi-rahi,
Dutsun səni bu ikinin ahi!
Axir ki, bu fikri-xanəzadın,
Verdi duruban sənin muradın.
Avarə ani qılub cəhanə,
Atdun məni dəxi bir kəranə.
Biz xud verdük riza qəzayə,
Sən həm yetəcəksən ol cəzayə!
Bu sözdə idi hənuz o məhcur,
Nakamlıq etdi ani rəncur.
Döndərdi əqiqi kəhrübayə,
Söz fürsəti qalmadı ol ayə.
Zəhrə bədəl oldu nuşi anın,
Düşdü yerə getdi huşi anın.
Keçdi neçə saət ol hümayə,
Ta saldı ona şüur sayə.

## BUDUR, GÜLŞAYİ-NAKAMIN VƏSİYYƏT QILDUĞU SƏRVƏ

Çün gəldi özünə ol vəfadar,
Bildi yoxdur əlaci-bimar.
Möhkəm dutuşubdur ol şərərdən,
Qurtulmağı yox durur zərərdən.

İbram ona yetirür qəramət,
Fəryadə nəticədür məlamət,
Yox əldə inani-ixtiyari,
Etmiyə qəbul olan qərari,
Hərçənd ki, yox idi rizasi,
Lal eylədi şiveyi-həyasi.
Tapşurdu özin verüb cəfayə,
Ol ürzdə irzini xudayə.
Fikr eylədi ol qəm aşinasi,
Gər xaneyi-dərd kədxudasi.
Gəldükdə bu rəmzə ola qafil,
Olmuya rəhi-əlacə acil.
Novmid olub eyləyə cüdalıq,
Nisbət mənə ola bivəfalıq.
Görməz dəxi göz anın cəmalın,
Bulmaz dəxi can anın vüsalın.
Hərçənd məhal ola ümidi,
Kəsməz andan könül nəvidi.
İstərdi birini ol cigərxar,
Ol dərddin eyləyə xəbərdar.
Saxliyə bu nəngü arın anın,
Ərz eyləyə görsə yarın anın.
Həmtaşlar içrə mundan əqdəm,
Qılmışdı birin özünə həmdəm.
Sərv aldı o sərvi-bustanın,
Həmrazı idi bu dilsitanın.
Agah idi cümleyi-cəfadən,
Cangah idi ol çəkən bəladən.
Ol həmqəmdən degildi xali,
Bağlu idi birinə xəyali.
Bilmişdi nə suzi-atəşi-eşq,
Zahiri-batini müşəvvəşi-eşq.
Təqribi-vida ilə o sərvi,
Bu kəbkin ənisi ol təzərvi.
Çağırdı ona o macərani,
Dedi qəmu nolduğu cəfani.
Pəs söylədi, ey qəmimdə qəmxar,
Bu dərdimi eyləməkdən izhar.

Oldur qərəzim ki, gözlə yari,
Qəmxarına eylə qəmgüsari,
Fürsət mənə yox yığub xəyalım,
Vərqayə yazam nə oldu halım?
Gər görsən ani yetür dualər,
Məndən ona ərz qıl sənalər.
Pəs söylə ki, ey mənim rəvanım,
Vey qibleyi-ruhü cismü canım.
Bu şivə degildi ixtiyari,
Döndərməmiş əm olan qərari.
Yox gövhərə ixtiyari-bazar,
Əmma ki, təsərrüfindədür kar.
Sağınmagil, ey büti-şəkər ləb,
Əlmasə təsərrüf edə məsqəb.
Olmamış o zur zirdəsiti
Gər olsa qəbul edər şikəsti.
Bu şüğlidə məndən ol nigarə,
Bir faidə yox məgər nəzarə?
Gər nuri-çirağə olsa qane
Bu istəkdən ona nə mane?!
Həm mən qalamü həm ol səlamət,
Heç birə yetişməyə nədamət,
Məğrur ola gər o şanü cahə,
Olmiyə qənaəti nigahə,
Alam ələ tünd qəmzə tiğin,
Tökəm yerə xuni-bidiriğin.
Gər əl uzadam deyə vüsalə
Yaxam ani atəşi-cəmalə.
İşvəm oxu kim dilər bəhanə,
Anı ona eylərəm nişanə.
Ta ola ona dəlük-dəlük tən
Can mürğin uçmağınə rövzən.
Şanın buraxa görəndə şanım,
Güm ola gər istəsə nişanım,
Cahın caha qılam həvalə,
Ol guşədə döndərəm hilalə.
Zülfüm kimə eyləsə kəməndi,
Necə açar ol kişi bu bəndi?!

Sunam ona vəqti-kamrani,
Bir növ şərabi-həmzəbani.
Yox ola şüuri, çarəsindən,
Bəlkəm xəbəri nəzarəsindən.
Bir növ’ ona füsun edəm saz,
Həmraz sənə ola, nə ənbaz!
Eylə alayım ələ rizasın,
Xuni-dilin eyləyə qəzasın.
Yadun dəvirəm, pozub məzacın,
Bir ahilə cümlə təxtü tacın.
Gəl ver güli, çəkmə gəl qəm, ey yar,
Yetməz gülzarə dəsti-əğyar.
Məhsulunu ver girüb bu bağə,
Bu meyvə degil nəsib o zağə.
Görsəm qalmaz əlimdə mayə,
Asan düşmək rəhi-fənayə.
Sənsiz mənəm, ey nikü şəmayil,
Qucmaz qədimi məgər həmayil?!
Məhrəm mənə sayeyi-qədimdür,
Həmxabə türabi-mərqədimdür.
Çoxlar istər əgər vüsalım,
Leyk ayinədür görən cəmalım.
Zülfüm əgər etsə meyli-bazi,
Söylər duruban səbayə razi,
Açmaz ləbimi məgər kitabım,
Dutmaz əlimi məgər xəzabım?!
Fikr etmə səni unutdu xatir,
Gəl gör məni lafım ola zahir.
Əğyar qurursa dami-hiylə,
Zinhar uyma o qalü qilə.
Bu dövrdə əxtəri-zəvalım,
Saldı məni Şamə bozdu halım.
Qılduqda vəsiyyət ol cigərxar,
Bəs Sərvə dedi ki, ey vəfadar,
Al bu üzügü dəxi nişanə,
Ta rəf’ ola şiveyi-bəhanə.
Var qazılı bu niginə adım.

Ol ad salur zəmirə yadım.
Vərqa gəlir olsa bu diyarə,
Anub məni düşsə ahü zarə,
Ver gəl muni dərdü dil bəyan et,
Əsrari-nihanımı əyan et.
Gər gəlməsə, anmasa, o dilxah,
Ol gün mənü hicrü naləvü ah.
Əmr ilə çəküb bu dərdü suzi,
Səbr eyləyəlüm bu idi ruzi.
Pəs içdi durub vida' camın,
Bu şe'r xətm edüb kəlamın.

QƏZƏL

Hiç kim, ya rəb mənim tək didə pürxun olmasın,
Duzəqi-ümmid sınmış, qərqi-Ceyhun olmasın.
Rütbeyi-idbar ali, payeyi-iqbal pəst,
Şərtəsi kəm, taleyi dun, bəxti varun olmasın.
Xərməni-sə'yin yığub, silabə vermişlər kimi,
Hasili-ömri ziyanü mayə məğbun olmasın.
Bu siyəh bəxti-əzəl getdükcə oldu müstəmənd
Kimsənin əhvalı əvvəldən digərgun olmasın.
Kim tə'ami xuni-dil olsa, şərabi dərdü qəm,
Nigər içün, naseha, ol necə məhzun olmasın.
Görsən ər bu bağara, ey Sərv, o gül rüxsarımı
Söyləgil kim bağban keydinə məftun olmasın.
Çün Məsihi, guşeyi-qəmdə bəla ərbabıyam,
Mülkəti-Cəm, təxti-Dara, gənci-Qarun olmasın.

## BU, MÖHSÜN ŞAHƏ VERMƏGDÜR O GÜLŞAYİ-NİKU NAMİ

Çün anəsi gəldi ol nigari,
Gördü ki, qılar fəğanü zari.
Qıldı ona yenlədin nəsihət,
Bəlk eylədi zəmnidə fəzihət,

Der: yoxdur oğul-qız ixtiyari,
Atə-anə səndədür məhari.
Gəl bozma bu işdə öz rəvacın.
Yox qeyrə qəbuldən əlacın.
Gör şanını ərz saxlə zinhar,
Qədr arturü düz bu qəddə ru kar.
Qədri-qəməri yetür kəmalə,
Qəd əgməgi nəqsdür hilalə.
Al ayinə, düz özün bu əsbab,
Çəkməkdədür intizari-əhbab,
Gülşa dedi: ey əduyi-canım,
Peyvəstə müəzzibi-rəvanım.
Qoygil bu məni siyah bəxti,
Nəylə çəkəyim müdam rəxti,
Yox qazəyə meyli-cüstü cuyim,
Yaşım düzə gəldi rəngi-ruyim.
Çəkməz dəxi didə sürmədin bar,
Ta görmüyə gözdə meyldin xar.
Kur olsa yeg o çeşmi-zaği,
Gülsüz dəxi görmüyə bu baği.
Düzmən yüzə əqdi-xali-neyli,
Pəs rəngi-kəbud, zərbi-seyli.
Qaş vəsməyə necə qılsın ahəng,
Şəmşiri-məsafə eybdür rəng.
Meyl etməz üzüm səfid abə,
Zira ki, nəmək gərək kəbabə
Pəs əldə degilmi xuni-yarə,
Dil verəm anı qoyub nigarə.
Lö'lö yüzə düzməgin xəyali,
Yox daneyi-əşk, bəs ləali?!
Salman dəxi mən zücacə sayə
Vermək nə rəva rəqibə vayə?
Ayinəyə yeg verəm şikəsti,
Yıxdı məni küfri-xudpərəsti.
Ərz etmə libasi-sürxü zərdi,
Vermə özünə, mənə bu dərdi.

Bəs zərdiyi-guneyi-zərirəm,
Sürxiyi-sirişki-nagüzirəm,
Qoy qaliyeyi-siyah ruyi,
Doldurma ol abdan səbuyi.
Bəsdür mənə qarəyüzlük adi,
Bu matəmdə nədür bu şadi?!
Bir sər ki, kəsilməgə səzavar,
Olsa dəxi ətri neylər, ey yar?
Açman ona zülfi-piçü pürpiç,
Duydum ki, məali-kardur hiç.
Açman dəxi zülfü saçdin tar,
Dağılmaya ta ki, ləşkəri-mar.
Hər tarına bağlu can firavan.
Bəs qılmağı anları pərişan.
Yox bəndə həvayi-fərqbəndi,
Bu pəstligimdə sərbüləndi.
Bel bağlıyub açmanam həmayil,
Zinət belə düzmənəm şəmayil.
Anlar muni əhli-dərd naçar,
Bu cümlə əbəsdür olmasa yar.
Hər zinətə anə qoydu əngüşt,
Döndərdi o bir bəhanədin püşt.
Olsa biri fərqi-hüsn baci,
Məşşatəyə olmaz ehtiyaci.
Şahid kimi qılsa zibü zinət,
Dilbər kimdür duyar təbiət.
Zinətsiz o fitneyi-zəmanə,
Od saldı zəminü asimanə.
Aldı dili-çərxdən fərağı,
Var hala həm cigərdə dağı.
Baxduqdə yüzünə çərxi-ə’zəm,
Pabusinə qıldı qamətin xəm.
Kim qıldı nəzər o məhliqayə,
Həmsayəligi itürdi sayə.
Durub o gecə Hilali-naçar,
Ta duyməyə ani yarü əğyar.

Bəxtilərə bağlayub kəcavə,
Ol nəqdi-vəfanı verdi lavə.
Gül getdi, bozuldu bağı-işrət,
Bülbüllərə qaldı dağı-həsrət.
Zülmət qalub etdi abi-hevan,
Yusif gedübən yıxıldı Kən'an.

## YETİŞMƏK ŞAMƏ, ŞAHƏ VERMƏMƏK TƏMKİNİ-GÜLŞADUR

Çün şahə yetişdi gənci-məqsud,
Mənzur olunub kəlami-mə'hud.
Qıldı olar ilə xeyrbadi,
Ordu köçülüb boşandı vadi.
Əmma ki, müqərrər eylədi şah,
Hər gün gedilə bir-iki gün rah.
Ol Xosrovi-təxt, məliki-azərm,
Qılmışdı əgərçi şövq anı gərm,
Tə'cil etməzdi arzuyə,
Ləb açmaz idi o göftguyə.
İstərdi yetəndə təxti-Şamə,
Asayiş ilə irişə kamə.
Yox ikisinin dəxi bu şani,
Yolda görə ol muni, bu ani.
Əlbəttə, o eyşi edə kutah,
Azari-səfər, məşəqqəti-rah.
Əmma şəh unutmayub nigarın,
Pürsiş qılub istəşürdi yarın.
Dilcuyluq eyləyüb firavan,
Bin lütf ilə göstərürdi ehsan.
Düzmüşdü nigarə ələti-eyş,
Yox yerə vəleyk haləti-eyş,
Gəlməzdi gözünə eyşü işrət,
Ol işrətdin dutardı nifrət.
Getmişdi əldən ixtiyari,
Bilməz ki, nolur məali-kari.

Qəm almış anın qərarü səbrin,
Göstərmiş ona təmam cəbrin.
Saət-saət xəyali-Vərqa,
Biçarəyə arturdu sövda.
Gəh bixud olub gedər özündən,
Gəh yox xəbəridin sözündən.
Gahi gün ötər ki, ləb kəlamə,
Açmaz, əl uzatmaz ol tə'amə.
Əksər gecələrdə ol giriftar,
Ta sübhə dəkin qalurdu bidar.
Giryə ona verməz idi möhlət,
Ta kim aça birə çeşmi-ülfət.
Tutiləri ol hərəmsəranın,
Gül ruyləri o bustanın,
Vaqif qəmu oldular o halə,
Gün-gündən o məh dönər hilalə,
Ərz eylədilər ki, ey cəhandar,
Xatuni-hərəmsəradur əfkar.
Bu nəhc ilə gər ötərsə hali,
Tez ola o kamilin zəvali.
Ol fitneyi-cismü canə afət,
Almaz qulağə hədisi-rafət.
Şəh verdi cəvab o macəradən,
Ayrılmış atadənü anadən.
Əldən getmiş diyarü yari,
Var anlar içün bu iztirari,
Bir neçə gün ötcək o məhru,
Axir ki, dutar bu cəm ilə xu.
Qət' olmağı ol büləndü pəsti,
Göstərdi təriqi-təngdəsti.
Çün Şamə yetişdi mövkəbi-şah,
İqbal rəfiqü bəxt həmrah,
Bir həftə bəzəndi şəhrü bazar,
Rahət yığılub dağıldı azar.
Axır olduqda rəsmi-ayin,
Alındı səfa, verildi təhsin.
Rəf oldu qəmu məşəqqəti-rah,
Şah elədi meyli-vəsli-Gülşah.

Bəs qıldı o sayəsi səadət,
Zic açdurub ixtiyari-saət,
Fərxəndə zəman, şərəflü həngam,
Durdu ala ta ki, vəsldin kam.
Düşdü o hərəmsərayə fəryad,
Xali ola həclə gəldi damad.
Amadə olun, yetişdi mehman,
Xızr istəyü gəldi-abi-heyvan.
Bülbül diləmiş girə bu bağə,
Pərvanə dilər yetə çirağə.
Əlmas külüng edib nəqqab,
Gəldi ki, aça bu mə’dənə bab.
Çün qeyrdən oldu həclə sadə,
Salındı o eyş içün vəsadə.
Bu kəbkə o şövqün ehtizazi,
Pərvazə götürdi şahbazi.
Ümiddinə bağladı xəyalın,
Göz seydinə tikdi, açdı balın.
Rəf oldu çü zərdeyi-bəhanə,
Yetürdi özünü aşiyanə.
Ta kim yetə kəbkə çəngəli-baz.
Səyyadına üzr qıldı ağaz.
Key xosrovi-məsnədi-ədalət.
Vey qibleyi-kişvəri-səadət.
Xurşidi-ədalətin cəhangir,
Gər adil isən nədür bu tədbir?!
Ədlini bilən degil hərasan,
Möhsün olanın işidür ehsan.
Məşhur bu səndə çoxdur insaf,
İnsafmıdır bu, urma gəl laf.
Bilmən sənədür nə kiş pünhan,
Zahir dersən mənəm müsəlman.
Eh sahibi-təxtü taci-təmkin,
İslamdə de bumudur ayin?!
Bir baliğü aqilin səlahi,
Olmayə səhih, ola nikahi.
Həqqa degiləm bu əmrə qayil,
Məndən olmaz murad hasil.

Gər şər'ə durur bu yolda rahın,
Vacib puzasan bu dəstgahın.
Tüğyan edə gər qüruri-şahi,
Dutmaq diləsən bir özgə rahi.
Hərçənd əsir olam bu damə,
Qoymən yetə nəqs nəngü namə.
Bu damdə gərçi xarü zarəm,
Bil muni ki, necəsi şikarəm.
Eylər səni ya özümni zaye
Bu ikisidin birə nə mane?
İrzini qoyarmı gedə badə?
Şir olmazmı hüjəbri-madə?!
Salma mənə dideyi-həqarət,
Danalərə eybdür cəhalət.
Gər Rüstəm ilə qılam nəbərdi
Yerə qoya püşti-dəsti-mərdi.
Sözün mənədür əlimdəki tir,
Ayineyi-sur, ruyi-şəmşir.
Qəmzə, yə'ni əlimdə xəncər,
İşəvü kirişmə gürzü şeşpər.
Bu şivəyə qılduqum qənaət,
Namusudur eyləmək himayət.
Aldum əlimə kitabü qur'an,
Ta rövşən edəm çirağı-iman.
Gəl sovdurmə mənim çırağım,
Bəsdür məni yandurur bu dağım!
Rövşən qılayum nədür kinayə,
Nə qəm məni saldı ahü vayə?
Müşkül durur, ey şəhi-mələkxu,
Pünhan qıla kimsə müşkdən bu.
Həq sözdə durur təmam rövnəq,
Həqq dutsun ani ki, dutmiyə həq.
Ömrüm olalı birinə bəndəm,
Dərdi ilə zarü dilnəjəndəm.
Tənha nə mənəm o dərdə xursənd,
Ol həm məni-dilfigarədür bənd.
Vərqa adı, sağ ola, səlamət,
Bu nəqd anın durur əmanət.

Bu meyldən ol kəsərmi nyeli?
Canım ola meylinin tüfeyli!
Əvvəldə ona verildi iqrar,
İqrarə nəçük rəvadür inkar?
Can istəməz andan özgə yari,
Əvvəlki qərar durur qərari.
Ol səhni-muradi-xoş xürami,
Gülşadən eşitdi bu kəlami,
Bildi ki, nədür ona həqiqət,
İbramə nəticədür fəzihət.
Ol sərvərə oldu səddi-əs’af,
Arzu həvəsində ədlü insaf.
Tale olub əxtəri-əfafi,
Göstərdi təriqi-ehticafi.
Baran töküb əbri-ehtirazi,
Sovdurdu ol atəşi-məcazi.
Dutdu tərəfi-mürüvvətə rah,
İnsaf durur bu, barəkallah.
Ol babdə munca çökdügü rənc,
Ol rahdə munca dökdügü gənc,
Həm olmadığı muradi hasil,
Həm vermədigi nigar ona dil,
Qılmadı ani şikəstə xatir,
Qəm olmadi çöhrəsində zahir.
Həqqa onadur bu iş müsəlləm,
Oldur bu sifati-qüdsə məhrəm.
Bu şivədə kimsə qılmasın laf,
Az kimsədə var bu ədlü insaf.
Gülşayə dedi ki, ey vəfadar,
Billah bizə dəxi zülmdür ar.
Çün kim mənə rövşən oldu halın,
Bir qeyrinə bağludur xəyalın.
Mən həm degiləm bu zülmə razi,
Tərk eylə təriqi-e’tirazi.
Gər olsa idi əvəldin agah,
Xatir qılmazdı meyli-Gülşah.
De necə yeyərdi duysa halın,
Nahəq Möhsün bir özgə malın!

Mənzur rizayi-həqdür, ey can,
Yox istədigim bir işdür asan.
Hər babdə bağlasam səbilin,
Da mane olurmu qalü qilin?!
Düşvar degil səninlə xari,
Müşkül görünür cəvabi-bari.
Vardur bu çəməndə dəxi gülzar,
Hər gülzar içrə qönçələr var.
Bu bülbülə qansının xəyali,
Düşsə mümkün durur vüsali.
Bais nə degül bu nəngü namə,
Kim düşə həlaldin həramə.
Öz nəfsinə sən bu gün çü malik,
Verdim, ələ rişteyi-məsalik.
Qayıtmağına var ixtiyarın,
Get çəkgilən intizari-yarın.
Bu qülləyə gər qona hümayın,
Yox məndə dəxi xilafi-rayın,
Bu meyldən olmə gəl mükəddər,
Sən xahərü mən sənə bəradər.
Sən saxla durub təriqi-yari,
Məndin sənə şüğli-pərdədari.
Şərtim bu ki, gər gəlürsə Vərqa,
Açub yüzünə dəri-təmənna.
Mərhəm qoyuban dili-figarə,
Tapşurəyim anda yari yarə.
Olsun mənim oğlum ol cəvanbəxt,
Çün mülki-bəqayə göndərəm rəxt.
Varis olsun bu təxtü tacə,
Sahib olsun bütün xəracə
Gülşa çü bu rəsm eşitdi iqrar,
Bir güldən ona açıldı gülzar.
Bildi ki, o, mə’dəni-mürüvvət,
Açmışdur üzə dəri-fütüvvət.
Heyvan özü həm o karü barə,
Zeyğəm rəhm etməgi şikarə.
Düşdükdə qəzal kami-şirə,
Qurtulmağı əqli qıldı xirə.

Pəs açdı zəban o dilnəvazə,
O tari-duanı düzdü sazə.
Dedi ona: ey xücəstə fərcam,
Bənd etdi məni bu danəvü dam.
Lütfün mənə oldu dami-xürsənd,
İnsafına qıldı ömr ilə bənd.
Çün bağladı mə'dələt tənabın,
Əlin-ayağın bu dil kəbabın.
Xatun məni bilmə bu aradə,
Bir cariyəyəm hərəmsəradə.
Qıldun bu zəlilə sən əzizi,
Ömrüm olalı qılam kənizi.
Səndən necə dil duta kəranə,
Sənsən mənə imdi atə-anə.
Gər yetişə bu diyarə yarım,
İqraruna bağlu intizarım.
Gər yetmiyə xatirim muradə,
Güm ola murad o müddəadə.
Tale mənə qılmasa himayət,
Kimdən qılayım dəxi şikayət.
Gör aradə tanrının rizasın,
Algil ələ ədl müqtəzasın.
Gözdən salma məni-qəribi,
Bu biçarənin dur ol təbibi.
Döndərmənəm üz dəxi hicazə,
Vəqtində məgər duram nəmazə.
Yegdür mənə munda ölmək, ey yar
Eşitmiyəm anda tə'ni-əğyar.
Bu guşədə hicr bir bəladur,
Yüz qəm mənə anda aşinadur.
Düşdü dili-şahə rəhmdən suz,
Kar eylədi tiri-ahi-dilduz.
Dildarlıq eyləyüb ol ayə.
Lütf ilə ona buraxdı sayə.
Dedi ona: – Dəxi olma qəmnak,
Bənd etdi məni məhəbbəti-pak.
Sən saxla bu sədri-ehtirami,
Mən ömr ilə eyləyim qulami.

Bir mənzil anınçün etdi tərtib,
Verdi özü ona zinətü zib.
İnsanə qəmu anda şəfqəti-şah.
Amadə yanında cümlə əsbab,
Oldu o nigar eyşə ərbab.
Gün-gün artub təfəqqüdati,
Gərm oldu tənuri-iltifati.
Ol gülruxi qıldı məhrəmi-raz,
Bu razdə oldu ona dəmsaz.
Hər gün gəlüb istəşürdi halın,
Yox bir qərəz ər görür cəmalın.
Əmma ki, ol iki dilfüsürdə,
Asdılar o macərayə pərdə.
Duymadı o sirri hiç həmdəm,
Olmadı rəqib o razə məhrəm.
Bu nəhcilə ol məhi-həsari,
Xurşidinin oldu pərdədari.
Şayəd ola ona taleyi yar,
Bir nəqş zühur edə bu pərgar.

## BƏYAN EYLƏR BU, VƏRQA SƏRGÜZƏŞTİN ÖVD QILMAQDA

Saqi, məni aldı iştiyağım,
Yıxdı qəmi-şiddəti-fəraqım.
Bəsdür mənə nəngi-dəstziri,
Bir camilə qıl qəni fəqiri.
Ta cəm'idə sayılam şümarə,
Həm rəng verəm bu ruyi-karə.
Yox gərçi ümid taleyimdən,
Qurtarə düçar olan qəmimdən.
Gər qılmasa birnə bəxt yari,
Gül ola əlində xari-xari.
Gülzari-kəlam dilnəjəndi,
Bu tərz ilə qıldı nəxlbəndi.
Vərqa ələ saldı vəsl içün gənc,
Ol babdə çəkdi qayəti-rənc.

Ümmidi-vüsalə bağlayub dil,
İlqar ilə qət' edüb mənazil.
Göründü çü səthi-bərri-Bətha,
Bir neçə gün anda durdu Vərqa.
Əsbab töküb o pak tiynət,
Ol məcməə verdi zibü zinət.
Döndərdi o ləşkəri təmami,
Xalusinə ərz edüb səlami,
Göndərdi Hilalə müjdəgani,
Aç doğdu Süheyli ruyi-kani.
Göstərmiş ona murad rüxsar,
Gəldi budur olgilən xəbərdar.
Yetişdi bu mülkə ol təhəmtən
Açmış rüxi-xəlqə feyzi-rövzən.
Bazarinə düzdü bu rəvaci,
Kim bəxşişidür Yəmən xəraci.
Xətm ona səxavətü şücaət,
Kəsb eyləmiş ol gəlüb bəzaət.
Gər olmasa idi ol sipəhdar,
Təxti-Yəmən idi xakə həmvar.
Eşitdi büneyni-Şeybə əksər,
Bu bişəyə girdi ol qəzənfər.
El-el ona çıxdı pişvazə,
Bir-bir durub ol rəhi-niyazə.
Ol badiyə əhlini təmami,
Qıldı kərəmi anın qulami.
Bu müjdə yetişdi çün Hilalə,
Müstəğrəqi-bəhri-infialə.
Şərməndə olub o xiş düşmən.
Durdu öz-özünə qıldı şivən.
Gəldi evə eşidüb o sazi,
Banu Qəmərə dedi bu razi:
Vərqa gəldi nədür cavabın?
Qət oldu suyu bu asiyabın.
Dür görməsə gəlsə kan içində,
Rüsva oluruz cəhan içində.
Ey kaş əcəl aleydi cani,
Ta görmüyə didə ol cavani.

Pəs verdi rəvan cəvab o möhtal,
Bu qüssəvü qəmdən olma bədhal.
Salma özünü durub cəfayə,
Fikr asandur bu macərayə.
Biganə degil bu razə məhrəm,
Məhrəm görməz rəva bizə qəm.
Hər kim ki, bu qüssədəndür agah,
Qıl gil olara sifariş, ey şah.
Yüz döndərübən ol aşinadən,
Ləb açmıyalar bu müddəadən,
Bu gülşəni-dəhr, tari-gülxən.
Olduqda ola bu şay şivən,
Durub qılalum fəğanü fəryad.
Əfsus ki, çərx qıldı bidad.
Sərsər yeli əsdi, yıxdı sərvi,
Bazi-əcəl aldı ol təzərvi.
Bu gülbindin açılmadı vərd,
Yə’ni Gülşayi-nazpərvərd.
Əzbəs ki, var idi iştiyaqi,
Vərqa anın ola həmvisaqi.
Eşitdi çü gəldügin rəvani,
Müjdə o hədisə verdi cani.
Çün amm edə yığılub xüruşi,
Bir tabuti-ədim puşi.
Tərtib edüb iltəlüm məzarə,
Ta cümləyə olsun aşkarə.
Vərqa bu yerə salanda sayə,
Agah ola çü bu macərayə.
Axir səbrə dönər məzaci,
Səbr eyləmiyə nədür əlaci?!
Bu şüğli əgər düzə xəyalın,
Olmaz dəxi andan infialın.
Tədric ilə gər duyulsa əsrar,
Derüz ona kim sən etdün iqrar.
Vəqt etdüvü və’də oldu axir.
Bunlar bizə rüxsət etdi zahir.
Çün diməgə səndən eylədük şərm,
Bas oldu həyavü azərm.

Etdük bu vəsiləni bəhanə,
Durduq bu bəhanədin fəğanə.
Gəl imdi sən, ey çirağі-didə,
Bu vəsvəsədin ol aramidə.
Qoysan kimə bu həşəmdə əngüşt,
Varı olalum səninlə həmpüşt.
Düzüb qılalum o sərvi həmdəm,
Ta göz açasan vüsalə məhrəm.
Çün xaneyi-məkr dilürbasi,
Razi ona oldu kədxudasi.
Fikr etdü ki, keydə verdi əncam,
Pünhani o gürgə qurdu bir dam.
Bir həftə keçüb o hayü hudən,
Pür oldu cəhan o göftügudən.
Tale olub aftabi-Vərqa,
Əsbabına təng oldu səhra.
Qarşuladı pəs Hilal o mahi,
Düzmüşdü qərayə dəstgahi.
İstəşdi: nədür bu hal, Vərqa,
Dedi: sənə sədqə oldu Gülşa.
Ta adın eşitdi ol bəlakəş,
Can xərməninə buraxdı atəş.
Dil hasilin eylə yaxdı ol yar,
Tən amili olmadı xəbərdar.
Göydürdü bizi əgərçi bu dağ,
Sən bizim içün səlamət ol sağ.
Vərqayə bu şərbəti-həlahil,
Qət etdi tühalü doğradı dil.
Zur eylədi zə’f o nazəninə,
Çün bərgi-xəzan salub zəminə.
Ol xurşidin kəm oldu nuri,
Nə nuri, qaldı nə şüuri.
Gördükdə Hilal o dil xərabi,
Öz bürcünə çəkdi aftabi.
Hər gah özünə gəlür o cansuz,
Yadə düşər ol məhi-diləfruz.
İstər ki, xəbər duya sözündən,
Adın dutuban gedər özündən.

Bu rəsmə çü mürği-nimbismil,
Üç gün, üç gecə yatdı bidil.
Saldı ələ çün dilifigarın,
Dutdu rəhi-mərqədi-nigarın.
Durduqda o sadəlövhü dilpür,
Cahil muna kim sədəfdə yox dür.
Oldu ona qiblə guri-xali,
Çün xaneyi-Kə'bənin misali.
Saldı çü məzarə pərtov ol nur,
Qopdu başına cəhan-cəhan şur.
Vərqayə ol ismi-bimüsəmma,
Gördükdə müzaəf etdi sövda.
Düşdü yerə getdi əqlü huşi,
Sangil ki, qəfəsdən uçdu quşi.
Olduqda süruşi-huş həmduş,
Ol püşteyi-xakə açdı ağuş.
Can kimi ani qucaqlayub təng,
Çün nəqşi-rüxi-səhifeyi-səng.
Axıtdı gözündən ol qədər xun,
Ta qıldı səfinə qərqi-Ceyhun.
Lə'l eylədi səngi-sərməzari,
Əflakə yetürdi ahü zari.
Canani müxatəb etdi ol zar,
Dərd ilə dedi ki, ey vəfadar!
De lazimeyi-vəfamıdur bu?!
Yaxud sitəmü cəfamıdır bu?!
Qoydun məni bu diyari-qəmdə,
Məğluli-səlasili-sitəmdə.
Saldun ələ mayeyi-fərağət,
Ol nəqdi-bəqadin istitaət.
Rəncidə idün məgər sən, ey yar,
Ta gəlməgim eylədi xəbərdar.
Çəkdün duruban cəmalə pərdə,
Saldun məni səd həzar dərdə.
Təqsirimə qıldum e'tirafı,
Göstər yüzünü, qılam təlafi.
Yetmən sənə olmuyuncə rüxsət,
Rüxsət verə gör ötürmə fürsət.

Azürdə səni edəndə əxbar,
Görməkdə yəqin ki, artar azar.
Məndin sənə yox əgər girani,
Bismillah işarə eylə ani.
Ol mənzilə eylə göndərim bar,
Ruhum dəxi olmasın xəbərdar.
Ey xak, mənəm sən, asimanım.
Yox demə, xüsufdur nişanım.
Dağıtdı durub fələk xəzinə,
Olduqda sənə budur dəfinə.
Torpaqdə cümlə bir degil kan,
Bil, xeyli əzizdür bu mehman.
Ey kaş ki, xak oleydi cismim,
Döneydi durub məzarə ismim.
Şayəd görüb ol pəri xisali,
Düşüb ələ daməni-vüsali.
Açeydim ona ləhəd kimi bal.
Çulqaya idim ezar timsal.
Ta qoymuya mar o zülfə əngüşt,
Ta olmiyə mur o xalə həmpüşt.
Həqqa ki, mənə bu şivədür nəng,
Gər qılmıyəm ol fəzayə ahəng,
Yox-vardə qeyri-yarü dəyyar.
Məsdud onadur təriqi-əğyar.
Bir ay keçdi bu rəsm ol ayə,
Nə xürü nə xabə saldı sayə.
Cananına gəh açardı razın,
Bu şe’r ilə gəh düzərdi sazın.

## QƏZƏL

Hiç kim, yarəb, mənə nisbət digərgun olmasın,
Dil pərişan, sinə büryan, didə pürxun olmasın.
Dəhri-pirin hiyləsindən hiç kafir mən kimi,
Paybəndi-rişteyi-səd məkrü əfsun olmasın.
İstəmən dirlik əgər bilfərz olursa yarsız,
Höqqeyi-dildə vəfadən qeyri mə’cun olmasın.
Cilveyi-qəddi nihali-bağ-ara ər olmasa,

Sayeyi-şümşadü najü sərvü mövzun olmasın.
Böylə qanuni-müxalif gər ola üşşaq ara,
Görəyim ol ləhzə qan olsun, bu qanun olmasın.
Çün cəfavü cövr çəkmək lazımıdur aşiqin?
Səhlidür qoy mən çəkim canana məhzun olmasın.
Dərdi-hicri fariğ etmiş cümlə qəmdin can evin,
Bu Məsihi necəsi ol dərdə məmnun olmasın.

## BUDUR, VƏRQAYƏ OL KEYDİ-QƏMƏRDƏN SƏRVİN ƏXBARİ

Əfqan edüb ol sitəm rəsidə,
Heç ruy ilə olmaz aramidə.
Saymışdı səhih ol düruği,
Əksiltdi düruğ ona füruği.
Hərçənd Hilal edər təmənna,
Tərk eyləməz ol ədani Vərqa.
Gündən-günə artdı zə'fi-hali,
Az qaldı ki, xüşk ola nihali.
Xali olmaz rəqibdən hal,
Ta sərv ona söyləyeydi əhval.
Bir gecə yuxuya vardı əğyar,
Fürsət bulub ol büti-vəfadar.
Vərqaya yetişdi ol pərivəş,
Çığırdı ona ki, ey bəlakəş.
Ta necə bir uyasan düruğə,
Aldanma bu şəm'i-bifüruğə.
Ey sadə zəmirü pak kirdar
Necə verəsən özünə azar.
Bəs sineyi-gərmü ahi-sərdin,
Gəl məndə durur dəvayi-dərdin
Dur yoluni kəsmə aşinadən,
Ta qurtulasan düşən bəladən.
Vərqa görüb ol mələk misali,
Öz-özünə qıldı bu xəyali.
İstər məgər ol pəri şəmayil,
Vərqani özünə edə mayil.

Ləb açdı ki, ey özünə məğrur,
Fərsəx-fəpsəx bu dərddin dur.
Göstərmə yüzün, itür xəyalın,
Bir özgəyə ərz qıl cəmalın.
Haşa bu xəyali-şum haşa,
Hər bisərü pa olurmu Gülşa?!
Getgil gerü, məndin üz ümidi,
Bir özgədin istə bu kilidi.
Vərqa olmaz səninlə həmdəm,
Yox məzrəinə bu əbridin nəm.
İçmək dilər idim əldə camım,
Sındı dəxi badədür həramım.
Ol püstə dəhan ləb etdi xəndan,
Dedi ona: – Ey əsiri-hicran,
Yüz heyf sənin kimi cəvanə,
Rəncur edə hiyləvü fəsanə.
Ay oldu bu surəti-misali,
Yə'ni düzülən bu qəbri-xali.
Qarətzadə eylədi həvasın,
Yıxdı bürcün, pozub əsasın.
Aşiq olana budurmu şivə?!
Bir söz anı sala məkrü rivə.
Dut gil üzə şiveyi-hüjəbri
Al tişeyi-şövqi, sök bu qəbri!
Görgil nə durur bu kanə məzmun,
Qılma özünü əbəs digərgun.
Gər anda bulunsa lə'li-nabın,
Görmək yüzünü olur səvabın.
Gər qəbr görünsə sinə xali,
Yığ başına dağılan xəyali.
Bəs ol yuxudan göz açdı Vərqa,
Sərvə dedi: – Ey büti-dilara,
Gəl söylə məcazə bir həqiqət.
Mən gümrəhə göstərüb təriqət,
Bu qılmağidən məni xəbərdar
Mə'lum olunur ki, bir xəbər var?!
Çün Sərvə yetişdi ol sənubər,
Sərv ona qəziyyəni sərasər.

Şərh etdi qəmu nəfirü qətmir,
Ol nüktəyə düzdü şərhü təfsir.
Verdi özünü dəxi nişanə,
Tə'cil ilə dutdu rahi-xanə.
Ta kimsənə olmasın xəbərdar,
Ol arada çəkməsin bir azar.
Çün sağəri-mey töküldü camə,
Bu yetdi o nafədin məşamə.
Cəngal işə saldı gürgi-nəbbaş,
Gəh torpaq atub, gəhi söküb daş,
Gördü pozduqda ol misali,
Qəbr içidə bir səriri-xali.
Bildi sözü doğrudur o yarın,
Hər nə dedügi bu qəmgüsarın.
Pəs qıldı Hilalə tə'nə bünyad:
– Key şəhneyi-şəhri-zülmü bidad!
Məndin sizə oldu de nə təqsir?
Ol necə əməl, bu necə tədbir?!
Yox şərm bu şiveyi-dəğəldən,
Üzrün bətər durur əməldən.
Netdim sizə söyləyin məni-zar,
Hər dəm verəsiz bir özgə azar.
Məndin dönmüş əgər xəyalın,
Ol güm şüdəyə nədür bu falın?
Layiq bu degil duram cidalə,
Məqtul qılam olanda nalə.
Açam yüzümə dəri-ədavət,
Lazım yetürəm sənə xəsarət.
Pa qoysam əgər təriqi-rəzmə,
Dil versəm əgər durub bu əzmə
Düşmən əgər olsa kuh dər kuh
Bir həmləmə dözmiyə ol ənbuh.
Dözmək mənə səhldür cəfayə,
Qılmaq səni mübtəla bəlayə.
Liykən andən nədür mənə sud?
Verməz bu dirəxt bari-məqsud?!
Getdim səni tapşurub bu rahə,
Ol xəncəri-səbrü tiri-ahə.

Hərçənd Hilal edərdi puziş,
Artardı o şəm’i-dərdə suziş.
Əsbani durub qıldı təfsil,
Ol mali birinə qıldı təhvil,
Qıldı ani ol güruhə sərdar,
Dedi ona: – Səd həzar zinhar.
Ərzə yazdum Səlim şahə,
Göndər muni tez o şəm’i-cahə.
Hər nə ki, sənə olur işarə,
Yetür yerə durma intizarə.
Ey mö’təməd irsən ol cənabə,
Olduqda müqarin aftabə,
Pabusinə dur yetür niyazım.
Bir-bir ona ərzə eylə razım.
Düzdü mənə balü pər bu meylim,
İstər Şama doğa Süheylim.
Gər versə əcəl həyatə möhlət.
Qayıtməgimə olursa fürsət,
Qılmaz dəxi mən əmudə təqsir.
Qoymaz qala intizar ol pir.
Unutmayınız məni duadən,
Ta feyz bulam o müddəadən.
Vərqa çü bu söznü qıldı rövşən,
Ol məcməə düşdü tazə şivən.
Yığıldı məxadimü cəvari,
Düzüldü fəğan, quruldu zari.
Dedilər ona ki, ey sipəhdar,
Lütfün bizə olmuş idi qəmxar.
Biz cümlə bu vadidə qəribuz,
Bir bimarüz ki, bitəbibüz.
Götürsə hümay sayeyi-bal,
Bu bəndələrə nə olur əhval?
Yoxdur bu güruhə yarü yavər,
Biz cümləmüzüz qulamü çakər.
Vərqa oları yığub sərasər,
Mərsumlərin qılub müqərrər,
Düzdü oların qəmu zərurin,
Əsbabi-nişat ilə hüzurin.

## BU, VƏRQA GETMƏGİDÜR ŞAMƏVÜ ZƏNGİLƏRİN CƏNGİ

Yalquz yola düşdü ol cəhantab,
Şayəd içə nəhri-Şamdən ab.
Mənzil-mənzil kəsüb təriqi,
Qəm həmrəhivü ələm rəfiqi,
Qət' oldu gedüb məsafəti-dur,
Ta dari-şəfayə yetdi rəncur.
Öz-özünə var idi xəyali,
Aya ki, nolur anın məali.
Ya rəb, necəsi bula nigarın?!
Yaxud necə görə ruyi-yarın?!
Nagah o dəşt dəştibani,
Qarşusidə gördü bir cəvani.
Əsbabi-cidalinə mükəmməl,
Məzmuni qitalədür müəvvəl.
Vərqayə dedi ki, ey cəvanmərd,
Dil gərmliginlə olmə rusərd.
İnsanə əzizdür həyati,
Gəl əql ilə saxlə ol sifati.
Qoysan yerə at ilə silahın,
Şayəd açıla dəri-fəlahın.
Bu rəhm ki, məndədür nihani,
Yoldaşlərimdə yox nişani.
Biz qırx igidüz qəmu firəngi,
Hər birimiz ərslani-cəngi.
Varisi-müsəlləmi-zəmanə,
Gəlməmiş olar kimi cəhanə.
Sərdarımızın adı Pələngər,
Altı aydur o kuh peykər,
Bu mə'bərin oldu səddi-rahi,
Aciz ona mülk padşahi.
Göndərdi sipahü düzdü ləşkər,
Məğlub ona olmadı Pələngər.
Əglənməgə vardur iztirarım,
Çəkməkdə olardur intizarım.

İnsaf ver, uyma qalü qilə,
Bir pəşşə nədür bu munca filə?!
Hərçənd özünə var e’tiqadın,
Bitməz bu aradə ol muradın.
Ta gözdən axılmıyıncə yaşın,
Ver malını, qurtar imdi başın.
Vərqa dedi: – Ey cəvani-qabil,
Bu sözü deyərmi hiç aqil?!
Özilə bu sazi gəzdürən can,
Hər istəyənə verərmi asan?!
Baş yoldaşıdur mənə bu malım,
Yox özgiyə verməgə xəyalım,
Bu bir kişidə nə ola əsbab?
Kim qırx igit ola andan ərbab?
Qırx igidə xud degil səzavar,
Salmaq birinə inani-rəhvar.
Yalquz kimsə nə bilsin əhval?
Sayə kimə salur anda iqbal.
Dur saxla təriqi-ehtiyatın,
Tökülmiyə badeyi-nişatın.
Aciz bilmə bu həqpərəsti!
Hər sən kimidən yeyə şikəsti.
Göstərmədi düşmənə zəduni,
Əfsanəsinə düzüb füsuni.
Çün anladı ol əduyi-bidin,
Kim rəhrövədür bir özgə ayin.
Qayətdə bülənddür həvasi,
Bu sözlərin olmaz aşinasi.
Qeyrət dəxi ona vermədi bar,
Öz cəm’ini eyləyə xəbərdar.
Yad eyləyüb ol mənatü lati,
Mizrab ələ aldı sürdü ati.
Vərqayə həvalə qıldı minqar,
Xarayə yetişdi navəki-xar.
Kar etmədi nizə dər’i-yarə
Ta zurdən oldu parə-parə.
Vərqayə yetişdi çünki növbət.

Çaldı qılıc ol hüjəbr sövlət.
Yüz qılmadı tirə rəngü budən,
Yetişdivü ötdü ol ədudən.
Çün zərbəti-tiği-bərq tə'sir,
Ol nəxldən üzdü bali-təşvir.
Duyduqda çü xəsm noldu halın,
Əl urdu rəvan götürdü balın.
Çaldı ani ruyi-pəhləvanə,
Bir zərb ilə danladı zəmanə.
Vərqa yüzə dutmaseydi qalxan,
Müşkül olur idi kari-asan.
Getdi gerü ər tökülmədi cam,
Ati ilə özü on iki gam.
Çox çalışdı o gürdi-yekdəst,
Vərqa ani axir eylədi pəst.
Dözmədi o zərbi-sə'bnakə,
Canın verüb öznü saldı xakə.
Əglənməgidin o bibəzaət,
Gəldi xəbər almağa bir afət.
Gördü yatur ol rəfiq cani,
Vermiş yelə bərgi-zindəgani.
Durmuş başi üzrə can bəlasi,
Bir kəştiyi-mərg naxudasi.
Ol şəxs təəccüb eylədi bənd,
Zira dəmi-cəng ol tənumənd,
Min kişi anınla dutsa qovğa.
Varını qılırdı bisərü pa.
Qalib ona olmağı şücaət,
Əglənməgidin götürdü taqət.
İstərdi o zağ ala hümayi,
Sıçratdı səməndi-badpayi.
Bənd eyləyüb ox zehi-kəmanə,
Vərqani ona qılub nişanə,
Atdı ona bir xədəngi-dilduz.
Rədd eylədi ani bu cigərsuz.
Açdı bu dəxi kəmanə bazu,
Lazım ola xəsmə həmtərazu.

Bir ox ona atdı kim mücərrəd,
Çün tiri-qəza olunmayıb rəd,
Yetdükdə o sinədin səfayə,
Düşdü keçüb on qədəm qəfayə,
Pəhlu yerə qoydu çün o zəngi.
Gəldi ardıncə bir firəngi.
Vərqayə yetüb o kuh parə,
Əjdər kimi dağudub şərarə,
Gözü anın iki tasi-pürxun.
Xun seyli içrə qərq Ceyhun.
Baş günbəzü tən çü püşteyi-kuh,
Ağzı ona babi-ğari-ənduh.
Bənzər qolu şaxeyi-çinarə,
Hər barmaq o şaxdə xiyarə.
Yox özgə silahə iltifati,
Gürz alub əlinə sürdü ati.
Ta gəbr gəlüb yetincə bəbrə,
Yeddi ox urdu bəbr gəbrə.
Hər ox ona urdu zəxmi-kari,
Liykən yıxa bilmədi çinari
Yetişdi çü sərvə badi-sərsər,
Qov qavzadi çaldı gürz, şeşpər.
Qalxan başa çəkdi şiri-heca,
Döndərmədi yüz, dəgişmədi ca.
Üç gürz ona çaldı ol tənumənd,
Gər kuhə dəgə üzərdi peyvənd.
Zir etmədi xəsmi zurdəsti,
Görünmədi balü sər şikəsti.
Əmma ki, anın dili-nəjəndi,
Sandı ki, söküldü bəndi-bəndi.
Xurşidi ol əbr qıldı tirə,
Oldu ona dərdlər zəxirə.
Ayırmadı atdan ani ol lət,
Sıçratdı ötüb səməndi-qeyrət,
Ta xəsm dönəm dedi qəfayə,
Fürsət Vərqayə saldı sayə.
Şəmşir o pəhluyi-gürazə,
Çalub rüxi-tiğə verdi qazə.

Bir zərbədə badi-tiği-Vərqa,
Sökdü zirehü dağıtdı əhşa.
Yetdükdə əduyə ol təğabün,
Düşdü yerə çün minari-bibün.
Bu rəsmilə on iki dilavər,
Gəldi yerə qoydu fərqü miğfər.
Axir ki, Pələngər oldu agah,
Yetmiş olara bəlayi-nagah.
Hər kim ki, ona durur cidalə,
Bədr isə əgər dönər hilalə.
Əmr eylədi atlanın sərasər,
Ta kim verəlüm o nəxldin bər.
Düşdü ükə pəs o divi-şəbrəng,
Vərqa tərəfinə qıldı ahəng.
Vərqayə yetişdilər təmami,
Hər bir istər dökə o cami.
Ol gülbünü dövrə çulqadı xar,
Təng edüb ona təriqi-həncar.
Vərqa olara qılub nəzarə.
Yol yox özünü sala kənarə,
Axir muna düşdü rayi-mərdi,
Sərdarə aça dəri-nəbərdi.
Düşmən pozula alursa ani,
Gər almasa yadə verə cani.
Heç ülfəti yox bu cismü canə,
Sağın ki, göz açmamış cəhanə.
Gərm eyləyüb atəşi-muradi,
Təprətdi o rəxşi-divzadi.
Çağırdı ki, ey dutan rəhi-kin,
Mərd olana de bumudur ayin?
Qırx ər qıla bir kişiylə cəngi
İnsafmıdur bu, ey firəngi?!
Əmma kimə yar olursa bari,
Dutmaz ətəgini xari-xari.
Pa qoydu təriqi-arzuyə,
Ta göz açasan yetüb əduyə.
Saldı ona sayə bərqi-tiği.

Yağdurdu bəla əduyə miği.
Qalxan başa çəkdi ol siyəh dil,
Şayəd ötə ol bəlayi-acil.
Söküldü sipər, bölündü xudi,
Saçıldı şərər, dağıldı dudi.
Fəvvarə sifət rəvan olub xun,
Oldu o nəhəng qərqi-Ceyhun.
Yıxmadı onu o zərbi-şəmşir,
Bəlkartdı[1] səvaşə kineyi-şir.
Şəmşir ələ aldı pəs Pələngər,
Durdu saluban rikabə ləngər.
Bir zərb yetürdi pəhləvanə,
Sökdü zireh, oldu xun rəvanə.
Çün pəşşə ki, sanca pili-məsti,
Ol zərbədən olmadı şikəsti.
Əlqissə, pələng ilə Pələngər,
Qopardılar ol aradə məhşər.
Bir-birinə urdu zəxmi-kari,
Axir Vərqayə ovni-yari,
Yetüb muna verdi fəthi-cəngi,
Rəhvari-əduy əpayi-ləngi.
Çün axsadı payi-əsbi-düşmən,
Buldu rəhi-fürsət ol təhəmtən.
Çaldı ona tiği-abidari,
Bir bad ilə yaxdı ol çinari.
Çün gördü ol hali qövmi-xunxar,
Kim sındı ələm, yıxıldı sərdar.
Durub qəmu rahi-intiqamə,
Meyl eylədilər hücumi-amə.
Kim durdu irağ ələ alub tir,
Kim gəldi yavığ əlində şəmşir,
Kim nizəyə oldu karfərma,
Kim gürzdən oldu balfərsa.
Ol ərseyi-cəng müstəhami,
Çün anladı bu hücumi-ami.

---

[1] *Bəlkartdı* – bəlkə artdı

Yetürdi səməndə taziyanə,
Ta almuya ol bəla miyanə.
Döndərdi inan təriqi-Şamə,
Bir-bir o sibai çəkdi damə.
Zəngilərə eylə oldu rövşən,
Kim qaçdı olardan ol təhəmtən,
Cür'ət olara olub ziyadət
Kahillərə arturub cəladət.
Ol cəm'i-şəğal bilməyüb hal,
Dutdilər o şiri-şərzə dünbal.
Hər kim ki, ona yetürdi ati,
Verdi yelə xərməni-həyati.
Bu hiylə ilə o mərdi-cəngi,
Öldürdü igirmi beş firəngi.
Baqi görübən bu rəstəxizi,
Dutdulər üzə rəhi-gürizi.
Çün Vərqadən pozuldu ol keyl,
Vərqa ol malə qılmayub meyl.
Aldı əlinə təriqi-mə'hud,
Gündüz-gecə yol yeridi çün dud.
Yetmişdi ona otuz cərahət,
Getmişdi fərağət ilə rahət.
Yari ona yetişüb xudadən,
Qurtuldu o düşdügi bəladən.
Tədric ilə bəs ki, axdı qani,
Artdı ona zə'fü natəvani.
Zin içidə ol şəhiri-afaq,
Oturməgə oldu taqəti taq.
Baliş ona oldu qaşi-zini,
At aldı gedər o nazənini.
Kəsmişdi gedüb o bad təmsil,
Bir gün, bir gecə rah otuz mil.
Uçmaq o həvayi-iztirabə,
Süst eylədi balü pər üqabə.
Asayiş içün dilərdi mənzil,
İstərdi fərağət edə hasil.
Möhtaci-əliq ikən o rəhvar,
Göründü gözünə bir ələfzar.

Meyl eylədi gördü çün əliqi,
Döndərdi o getdügi təriqi.
Baş əgdi əliqə eylədi meyl,
Üstündə xəbir olub o sərxeyl,
Göz açdı görüb o mərğzari,
Səfhə-səfhə güli-bəhari.
Cibü bəğəli dolu zəmiran.
Salmış yerə sayə yasəmini,
Pürsəbzə rübaidin zəmini.
Almış əlinə piyalə lalə,
Qılmiş anı pürşərab jalə.
İçmişdür o badədin şəqaiq,
Etmiş ani rəngi-qeyrə faiq.
Aləm-aləm, cəhan-cəhan gül,
Hər gülbünüdə həzar bülbül.
Teyhuvü dürac ilə qumari,
Dutmuş qəmu ruyi-səbzəzari.
Ol rövzədə var həzar kariz,
Hər karizdin abi-ləbriz.
Ətrafidə sərv sərvə həmsər,
Həmsayə çinarədür sənubər.
Ol səbzəyə kimsə qoymamış pay.
Ol sayədə kimsə dutmamış cay.
Qoruqu idi şəhi-cəhanın,
İşrətgəhi adili-zəmanın.
Vərqa özü saldı xakə çün ruh,
Dil xəstəvü xarü zari-məcruh.
Düşdü yerə çün o bərgi-suri,
Getdi yelə xərməni-şüuri.
Yatdı o qəriqi-lücceyi-xun,
Əhvalı xarab, özü digərgun.
Keçdi bir gecə-gün ol ayə,
Salmadı ona şüur sayə.
Atı anı qıldı pasibani,
Saxlardı sibailərdin ani.
Lütfi-həq ona olub nigəhdar,
Ol qəmluyə gör kim oldu qəmxar!

## BU, MÖHSÜN ŞAHIN OL MƏCRUHƏDÜR LÜTFİ-FİRAVANİ

Saqi, məni yıxdı fəqrü faqə,
Sun bixudə badeyi-ifaqə.
Ver sınmışa mumiyayi-lütfün,
Sal qəlbə o kimyayi-lütfün.
Hərçənd ki, xarü xaksarəm,
Məcruhi şikəstəvü nizarəm.
Qıldım gözə sürmə xaki-rahın,
Dutdum yüzə rahi-bargahın.
Gəl görmə rəva bu cüstü cudən,
Məhrum ola azim arzudən.
Ey sədrnişini-bəzmi-ismət,
Ehsan dəmidür ötürmə fürsət.
Ta sınmıya sağəri-məzacım.
Gəl üstümə eyləgil əlacım.
Nəql eylədi tutisi bu bağın,
Yandurdi fitiləsin çırağın.
Kim bir gün o xosrovi-zəmanə,
Yə'ni Möhsün şəhi-yeganə,
Meyl eylədi seydü seyri-səhra,
Oldu o həvadə dəşti-peyma.
Yetürdi anı məşiyyət Allah,
Vərqayi-həzinə döndərüb rah.
Ol rövzəyə çünki saldı sayə,
Düşdü nəzəri o binəvayə.
Gördü yatur anda ol cəvani,
Yox bəllü anın ki, var cani.
Ağüştə vücudi xakü xunə,
Nə tabi-tənü abi gunə.
Liykən şə'ni verür şəhadət,
Kim vardur o rəhrövə nəcabət.
At ilə donu verür gəvahi,
Ol məcruhə nişani-şahi.
Rəhm etdi ona dili-əkabir,
Düşdü anın üstə tikdi çadir.

Ol bixudə verdi nuşdaru,
Ta yetdi ona şüurdən bu.
İçirdi pəs ona mumiyayi,
Ta evə gətürdi kədxudayi.
Tə’sir qılub dəvavü timar,
Tədric  ilə didə açdı bimar.
Gördü o şəhi-bülənd payə,
Xur tək salmış bu mahə sayə.
Ta göz açdı tanıdı ani,
Kimdür o qərib mizbani.
Baş qovzadi, açdı ləb duayə,
Dürr düzdü təbəqçeyi-sənayə.
Bir nəhc ilə ol rüsumi-təslim,
Bir növ ilə ol ədayi-tə’zim,
Qıldı ki, o kani-lütfü ehsan,
Ləb pürsişə açdı oldu giryan.
Dedi ona: – Ey güli-səbahət,
Vey bülbüli-rövzeyi-fəsahət,
Kimsən, yetişür kimə nijadın?
Adın nəvü qandadur biladın?
De qanda gedirdin, ey qəmərtaş?
Qani degilən rəfiqü yoldaş?
Oldun degilən kimə həvalə,
Kim saldı səni degil bu halə?
Ya necəsi düşdügün bəladən,
Qurtuldunü çıxdun ol aradən?
Kim oldu sənə bələd bu rahə,
Kim yetürdi ba caygahə?
Vərqa durub açdı dil cəvabə,
Ta söyləyə raz o dil kəbabə.
Dutdu yüzə rahi-ehtiyati,
Ta sınmıya sağəri-nişati.
Der sənə düruğ narəvadur?
Şəhrim adı “Sirri mər rəbadur[1].
Sə’d oldu ləqəb məni həzinə
Yetürdü sənin kimi əminə.

[1] Samirənin başqa adıdır.

Sövdagərəmü işim ticarət,
Yetdi mənə qayəti-xəsarət.
Xəlq içidə bəllü idi halım,
Beş yüz yükə yetişirdi malım.
Meyl eylədi dil həvayi-Şami,
Yük bağladı rahə, qoydu kami.
Ta sərhədi-Şamə yetdi rahım,
Nəkbət oldu əduyi-cahım.
Dutmuş yolu qırx igit hərami,
Hər biri anın ol işdə nami.
Açdılar üzə dəri-nəbərdi,
Zahir qəmu qıldı zuri-mərdi.
Mən yalquzdən hücumi-ə'da,
Axir durub aldılər təvana.
Məcruhəyə oldu mal qarət,
Halım verür ol işə şəhadət.
Kişi özidən demək xətadur,
Andan məni qurtaran xudadur.
Bildim muni, çıxdım ol aradən,
Qurtulmağımı o macəradən.
Yox dəxi xəbər nə oldu halım,
Mən mundavü qanda getdi malım?
Şəh ona der: – Ey sitəm rəsidə,
Ol qüssəvü qəmdin arəmidə.
Yanında duran sənin həkimin,
Şahənşəhidür bu sərzəminin.
Müjdə sənə tale etdi yari,
Yetürdi sənə bu qəmgüsari.
Ta ola dəvasidin fərağın,
Səhhət bula zəxmi-dərdü dağın.
Qoyduqda qədəm dəri-şəfayə,
Dəndərdükda qəfa cəfayə,
Yenlə sənə mayəvü bəzaət,
Verim durub eyləgil ticarət.
Gər meyli-hümayın, ey yeganə,
Sayə salsa bu üstixanə,
Əglənməgə olsa xatirin ram,
Hər nə diləsən qılam sərəncam.

Cərrah gəlüb o yarələrni,
Tikdi bağladı parələrni.
Çün şəh ona verdi istimalət,
Bir neçə gün eylədi iqamət.
Ta görə məalın ol əlilin,
Həm səhhətini o qalü qilin.
Zira ki, şəhi-cəha mükərrər,
Göndərmişdi o cəm'ə ləşkər.
Ta dəf' edələr o səddi-rahi,
Olmuşdu səfinələr təbahi.
Beş yüz kişi eylədi rəvanə,
Hər birisi Rüstəmi-zəmanə.
Ta anlıyalar həqiqəti-kar
Ol xosrovi edələr xəbərdar.
İlğar ilə yol kəsüb o ləşkər.
Zəngiləri gördülər sərasər,
Yatur qamusi qətilü məcruh,
Var bir-ikidə bəqiyeyi-ruh.
İstəşdilər ol ikidən əhval.
Dedilər ola həqiqəti-hal.
Filhal o qövmi-bərgüzidə,
Qayıtdı gerü çü nuri-didə.
Ol sərvəri qıldılar xəbərdar,
Şah anladı doğrudur o köftar.
Birinə yüz artdı e'tiqadi,
Buyurdu yığın büsati-şadi.
Bir təxti-rəvanə ol həzini,
Məcruhi şikəstəvü qəmini,
Saldılarü oldular səbükxiz,
Ta şəhrə anı yetürdülər tiz.
Xurşid çü doğdu bargahə,
Bir bürc mürəttəb etdi mahə.
Olsa nə mərizin ehtiyaci,
Hər nə diləsə anın məzaci,
Cənnət kimi cümləsi mühəyya.
Asudədil anda yatdı Vərqa.
Hazir yanidə həkimi-haziq,
Ta kim düzə şərbəti-müvafiq.

## BU, OL MƏCRUHƏ HƏR GÜN YARDƏNDÜR ŞƏRBƏTİ-RAHƏT

Şəh fariğ olub o müddəadən,
Gətdi evə büq'eyi-şəfadən.
Əvvəl dilədi görə ol ayi,
Yə'ni o fəraqə mübtəlayi.
Ol mahə müqabil oldu xurşid.
Doldu o mey ilə cami-Cəmşid.
Çün qıldı anınla didə rövşən,
Verdi qədəmilə zibi-məskən.
Ləb açdıvü qıldı mehribani,
Hər babdə pürsiş etdi ani.
Der olmiyə inciyə rəvanın,
Sanma ki, usandı mizbanın.
Bir həftədür, ey könül həbibi,
Bir məcruhun olub təbibi.
Yetürdim ani bu sərzəminə,
Ha gəldümü tapşurub əminə,
Həqqa dilü canını təbibin,
Dağ eylədi dərdi ol qəribin.
Sövdasidə sudi olmuş afət,
Qalmış ona mayeyi-cərahət.
Mərdanələgin o novcəvanın,
Lö'lösünü cümləsi o kanın.
Çəkdi qəmu rişteyi-məqalə,
Bir-bir dedi ol pəri xisalə.
Gülşa eşidüb gəlüb fəğanə,
Divaniyə dəng olub bəhanə.
Yarını anub qılardı nalə,
Gül yaprağınə dögərdi jalə,
Durub öz-özüylə göftguyə,
Söylərdi muni qılardı muyə.
Aya nola ol qərib hali,
Kim yaxdı məni anın xəyali.
Tən sağ ola, ya vücudi xəstə,
Can bəstəvü ya xud şikəstə?!

Min rahət ilə budur mənə hal,
Ola nə o dilfigarə əhval.
Sərsəbz ola sərvi-cuybari,
Məcruh ola ya təni-figari.
Gər baş yerə qoysa sərvi-anın,
Vər damə düşə təzərvi anın.
Kim edə kənar o fərqə baliş?
Qurtarmağına kim edə caliş?
Dil versə tə'am ilə şərabə,
Meyl eyləsə arzu gülabə,
Kim bişürə aşi-dilpəsəndi?
Kim şərbət edə gülabü qəndi?
Tale mənə qılsa idi yari,
Ol gündə bulardım ol figari.
Bəstər qıluban həriri-canım,
Baliş ona zanuyi-rəvanım.
Qurtarmaq içün verüb rəhai,
Edeydi əlim girehgüşai.
Dil edə idim anın kəbabi,
Yaşim suyidin verüb gülabi,
Şərbət verübən ona ləbimdən.
Buleydi şəfa bu məşrəbimdən.
Gər ona fəvagih olsa mətləb.
Verə idim ona sibi-qəbğəb.
Məndə ola munca nazü ne'mət,
Yarım yeyə nani-xüşki-həsrət.
İnsaf degil ki, bu zəxirə,
Yetürməyə vayə ol fəqirə.
Ərbab ola, mən o qalə möhtac,
Ol acü bu ne'mət ola tarac.
Bu rəsm ilə ol qəm aşinasi,
Düzdü yenə tazə rəsmi-yasi.
Ol şah səriri-sədri-ehsan,
Dilcuyluq eylədi firavan.
Ta verdi ona sürури-sinə,
Dəf' eylədi zəngi-abginə.
Gülşa görüb ol təfəqqüdati,
Açdı yüzə babi-iltifati.

Yığdı başa dağılan xəyalın,
Ləb pürsişə açdı, sordu halın.
Gərm oldu çü aftab söhbət,
Gülşa araya gətürdi şərbət.
Şəh camdən oldu çaşnigir,
Nagah o zəxm xürdə nəxcir.
Ol xatiri-şahə oldu mənzur,
Saldı dilü canə atəşi-şur.
Mən' eylədi şirəni rütəbdən.
Üzr istədi pəs o nuşləbdən.
Der: – Xatirimə yetişdi, ey ruh,
Ol bikəsü müstəməndü məcruh.
Şayəd ki, ona bu dənglü şərbət,
Verilmiyə, yaxa ani həsrət.
Qorxum bu ki, kəsrəti-şəvağil
Andan məni nagəh edə qafil.
Gəl göndərəlüm munu o zarə,
Mərhəm qoyalum dili-figarə.
Qürbət ələmi əcəb ələmdür?!
Təxsis o müsafiri-ədəmdür.
Yox hiç səvabi-axirət var,
Ol gündə ümidi-məğfərət var.
Məzrə çü fənadür ol bəqayə,
Xoş ol ki, sala zəminə mayə.
Hərçənd ki, mən günahkarəm,
İnsafimdən ümmidvarəm.
Ola ki, mənim bu ədlü dadım,
İtürmiyə ruzi-dad adım.
Gül rəhmini gördü bağbanın,
Dil nərmligin şəhi-cəhanın.
Ləb açdı ki, ey xücəstə kirdar,
Mən acizədür bu iş səzavar.
Meylin kimi qılsa həmlə hamil,
Qılgil məni həm səvabə daxil.
Hər gün gəlübən o binəvadən.
Şərbət ala bu hərəmsəradən.
Sənə yetişə fərağəti-dil,
Həm mənə ola səvab hasil.

Şəh razi olub o karü barə,
Rüxsət verdi o dilfigarə.
Pəs bir zəğənin o bustanın,
Yə'ni qulunu hərəmsəranın,
Qılduqda bu şüql namzadi,
Aldı ələ töhfeyi-muradi.
Vərqayə verüb şərabi-məqsud,
Əhvalını sordu qıldı bədrud
Hər gün bu idi anın mədari,
Şərbət aparub görərdi yari.
Ta sərvi gəlüb anın xüramə,
Yüz qoydu cərahət iltiamə.
Qul bir günü ol mərizi nalan,
Pünhan gördü ki, eylər əfğan,
Ləb açdı ona ki, ey bəlakəş,
Bu vəz'idin olmagil müşəvvəş.
Qılmış sənə taleyin büləndi,
Vermiş sənə izzü ərcüməndi.
Az kimsə içün olur müyəssər,
Bu kim olmuş sənə müqərrər.
Həqqa ki, o banuyi-hicazi,
Hər qibləyə bağlamaz nəmazi.
Heç kimsəyə qılmaz iltifati,
Almaz gözünə bu kainati.
Öl qönçeyi-Buqəbisü bütha.
Açılmadı bu həvadə qət'a
İsmət ona qıldı pasibani
Həsrət yeyə qaldı bağbani.
Açılmamış ol xəzinə babi,
Alınmamış ol gülün gülabi.
Yox aradə rəsmi-şovhərü zən,
Bu şivədə bikrdür o mə'dən.
Leyk arturmuş şəh ehtiramın,
Gəh-gah gəlüb verür səlamın.
Bir-birə o mizbanü mehman,
Zahir qılur iltifatü ehsan.
Pünhan var aralarında bir raz,
Yox salis o pərdəyə həmavaz.

Əksər nəfəsi rəfiqi-ahə,
Hər ahi-qərin duayi-şahə.
Hər gün ki, o huri-pak xilqət,
Düzər özünə şərabi-şərbət.
Bir bəxş səninçün eylər irsal,
Bais muna yox məgər ki, iqbal?
Əksər o şəhi-xücəstə fərcam,
Bir yerdə ola ki, ayrulur cam.
Hər nə dilər olsa şəxs meylin,
Şəh qılmış ani sənin tüfeylin.
Bir dəxi bu ey düri-cəhantab,
Amadə yanında cümlə əsbab.
Gər olsa birinə bu riayət,
Şükr eyləsə yaxşi ya şikayət.
Bu nüktəni çün eşitdi ol yar,
Bildi ki, nədür nigarə kirdar.
Duydu şəh ona yetən cəfadən,
Vaqif durur əsli müddəadən.
Ol meyvəyə səbri bağbanın.
Tünd eylədi cür'ətin cəvabın.
Dedi ona: – Ey həzar dəstan,
Ol rövzeyi-ehtiramə reyhan.
Sağınma əbəs durur fəğanım,
Xiclətzədə qıldı mizbanım.
Yox mal bu xidmətə bərabər,
Verəm verüb ol şükufədin bər.
Gər eyləsəm iddia təlafi,
De kimsə alurmu xüşk lafi.
Saldı məni dərdə binəvalıq,
Xar eylədi şiveyi-gədalıq.
Ehsan ki, bərabərində ehsan,
Göstərməsə kişi olmaz insan.
Zahir ki, şəhi-xücəstə kirdar,
Eylər mənə dəxi lütfi-büsyar.
Həqqa ki, qəbulə dilnijəndəm,
Həm rəddindən məlalməndəm.
Güm oldu bu qəlb kimiyasi,
Kim ola bu dərdimin dəvasi.

Bir düşməni yox bu xanədanın,
Baş verəmü başın alam anın.
Yıxdı məni şükri-həqgüzari,
Ömrüm olalı bu şərmsari.
Ey kaş ki, ruzi-cəngü mərdi,
Aleydi biri bu əhli-dərdi
Artmazdı bu gün mənə xəcalət,
Yetməzdi birinə həm xəsarət.
Düzdükdə bu subə dəstgahım,
Düşmüşdü büneyni-Şeybə rahım.
Bir neçə gün eyləyüb iqamət,
Ol büq'ədə sağ olub səlamət,
Atasi hilal bu pərinin,
Ol xur kimi nəqsidin bərinin
Gördükdə bu yüzdə aşinalıq,
Rəf' eylədi pərdeyi-cüdalıq.
Ülfət aralıqda oldu bünyad,
Ol sahibi-əqlü maliki-dad.
Ta kim bizi eyləyə bərumənd,
Göndərmişidi təhayifi-çənd.
Yazmışdı anası dəxi namə,
Bu neyyəri-ovci-mülki-Şamə.
Talanə dü getdi cümlə malım,
Zahir qəmuyə nə oldu halım.
Ol gün mənə yetdi bu xəsarət,
Getdi ol aradə həm əmanət.
Xiclətzədeəm bu macəradən,
Qayıtsam əgər o xədxudadən,
Yazsam durub öz-özilə namə,
Göndərsəm ol aftabi-Şamə,
Ya bir neçə söz deyüb zəbani,
Ol gülrüxə göndərim nihani.
Bu şivə degil nəmək həlali,
Nöqsan ola ismətim kəmali.
Ol göndəriləndən, ey yeganə,
Qalmış bu üzük həmin nişanə.
Şahiddür əlimdə kim məni-zar,
Bu də'vi içində sidqəyəm yar.

Hərçənd həqir ola əmanət,
Verməməgidür anın xəyanət.
Bu tərz o aqili-zəmanə,
Qurdu ona damü tökdü danə.
Qıldı ani çün o bəhri-zaxir,
Kan kimi zəxireyi-cəvahir.
Qayutduqda hərəmsərayə,
Gün olmuş idi müqarin ayə.
Şah baxdı görüb o tərcümani,
Lütf ilə yanına aldı ani.
İstəşdi pəs ol qərib halın,
Ta anlaya kim nədür xəyalın.
Xacə oxuyub zəxrə babın,
Mövlasinə açubən kitabın.
Eşitdigünü nəqirü qətmir,
Bir-bir ol aradə qıldı təqrir.

## DUYULMAQDÜR BU, VƏRQA, ŞƏH YETÜRMƏKDÜR ANI YARƏ

Gülşa ki, eşitdi ol məqali,
Təğyir ona oldu vəz'i-hali.
Şah der ona: – Söyləgil həqiqət,
Döndərmə bu rahdən təriqət.
Təğyirinə qıldı rəngü ruyin,
Qalmadı əvəlki abi-cuyin.
Gülşa dedi: ey qədimdə qəmxar,
Doğru deməgimdən özgə nəm var?!
Ol gün ki, yox idi aşinayi
Sidqim qıldı girehgüşayi.
Hala ki, şəfəqqətin açub kax,
Qılmış məni həzrətində küstax.
Vəchi budur olmağım müşəvvəş.
Şövq urdu mətayi-canə atəş.
Ta açdı ağız bu dudi-nili,
Oldu mənə atəşin dəlili.

Həqqa ki, bu sərvü zaği-bustan,
Der ki, açılıb güli-gülistan.
Hasil bu hədisi tərcümanın,
Məhzi sözüdür o novcəvanın.
Belə anlar məni-giriftar,
Vərqanındur yəqin bu göftar.
Zira ki, o filsufi-miknət,
Göftari durur təmam hikmət.
Gizlidür anın sözündə məzmun,
Hər fəqrə sözü kitabi-qanun.
Şəh der ona: – Ey nihali-heyrət,
Vey qönçeyi-şaxsari-həsrət!
Söylə nədür ol məlik nişani?
Ta tanıya kişi görsə ani.
Dedi ona: – Ey şəhi-fələktəxt!
İqbal ola yarü yavərin bəxt!
Məşhur durur anın cəmali,
Müstəsnidürür o qədri-ali,
Qəddindən əlif dönüb hilalə.
Rəşki-qaşi xəm verüb hilalə.
Ol arizidən açanda pərdə,
Salmış güli-surini nəvərdə.
Nərgis çü gözündən anladı raz,
Qaldı baxa didəvü dəhən baz.
Ta ağzidən aldı qönçə məzmun,
Şəməndə aça dəhani-pürxun.
Ta qəbğəbinə yetişdi rahi,
Sib eylədi rəng ruyi-kahi.
Üç danə sepənd olub sepəndi,
Vermişdür olarə ərcüməndi.
Ta bağlana çeşmi-bəd xəyalə,
Salmışdur ol atəşi cəmalə.
Dutmuş hərə biri bir məqami,
Bulmuş ol aradə ehtirami.
Pişanisidə biri dutub xu,
Çün mərkəzi-xakə qütri-hindu.
Dutmuş ol ikisi cay üzündə,
Şəqqülqəmər olmuş ay üzündə.

Şəh hər nə ki, dedi mihmani,
Bildi o qəribdə var ani.
Qılmadı səbüklik al giran qədr,
Tez olmadı zirdəsti-ol sədr.
Çağırdı rəvan o tərcümani,
Key susəni-baği-kamrani.
Dur getgilən ol figarə məndin,
Ərz eylə səlam o yarə məndin.
Degil ona, ey yetən qəramət,
Qılmış nə bəqiyyeyi-əmanət.
Yetür yerinə ol ərməğani,
Qıl bizə hesab olan ziyani.
Yox səndə bu yüzdə hiç təqsir,
Zahir qəmuyə nə qıldı təqdir?!
Həqqa ki, əbəsdür infialın,
Yığ başına dağılan xəyalın.
Ehsan sanıram məgər mən, ey yar,
Kim bey'ü şərabi ola düşvar.
Yox bizdə təvəqqiyi-təlafi,
Gəl vermə məzacə inhirafi.
Ta hal nə qıldı mizbanın,
Şərməndəsi olasan sən anın?!
Bizdən sənə yetmədi bir ehsan,
Kim ola təbiətin hərasan.
Şəh sözü yetürməmiş təmamə,
Kim getdivü gəldi ol hümamə.
Ağzında hənuz qilü qali,
Xurşidə yetürdi ol hilali.
Şah ol üzügə qılub təmaşa,
Gördü ona nəqş nami-Gülşa.
Gülşayə dedi: – Bu ərməğani,
Al ki, ana göndərüpdür ani.
Gülşa çü ona nəzarə qıldı,
Can rəxtini parə-parə qıldı.
Yıxıldı vida edüb şüurə,
Bir mərtəbəsin yetürdi nurə.
Əhli-hərəm etdilər müdava,
Ta oldu şüur yari-Gülşa.

Çün gəldi özünə ol məhi-bədr,
Dedi ona: – Ey şəhi-mələk qədr.
Həqqa bu igit həmən cəvandur,
Kim dərdimə dərdi-tov’ əmandur.
Məqsuddur ol cəvan nə qasid?
Bu aradadür mətayi-kasid.
Yoxdur mənim əldə iqtidarım,
Ta eyləyə nolsa ixtiyarım.
Mən acizədür sənin fəqirin,
Nə nə, qələtəm sənin əsirin.
Bu babdə vardur ixtiyarın,
Qalmışdur əgər olan qərarın.
Göstər yenə şiveyi-mürüvvət,
Ehsanü tələttüfü fütüvvət.
Gər olsa qərar məhzi-göftar,
Olmasa o qişrə məğzi-kirdar.
Kim qadirdür ki, edə izhar.
Ol iqrarə nədür bu inkar?!
Qeyrət odu saldı şahi cuşə,
Əvvəldə rəfiq edüb xüruşə.
Der: – Səhl ola çəkdigim xəsarət,
Əmma kola rəxti-irz-qarət.
Kim övrətini verə cüdayə?!
Lə’n edə cəhan o kədxudayə!
Təxsis mənim bir özgə adım,
Var cümlə mülukə izdiyadım.
Nagəh mənə xiffət ola hasil,
Yeg döndərəm ol qərardən dil.
Zur eylədi amili-şəriət
Dedi ona: – Ey dutan təriqət,
Şər’ Allaha di bumudur ayin?!
Gör nə buyurur əlindəki din?!
Dəm urmə dəxi mürüvvətidən,
Ehsan dəmi ol ftfüvvətidən,
Bir övrətin olsa əqdi batil,
Saxlamağından sənə nə hasil?!
Acın ola qarşusunda ne’mət,
Yeməməgidür kəmali-həsrət.

Bu dünyaya saxlamaq əzabi,
Baqidür ol axirət iqabi.
Kim zülm ilə bir fəqir malın,
Alıb başa arturub vəbalın?!
Əmma ona eyləyüb təvəqqüf,
Versən ki, vəbaldür təsərrüf.
Kimdə ola əqlidin nəsibə.
Uyarmı munun kimi firibə?
Ol amili-əmrü nəhyi-qur'an,
Dedi ona: – Ey güzini-dövran,
Bir kişiyə kim xuda olur yar,
Bağlanur ona zəbani-inkar.
Yol göstərdi şəhə süruşi,
Hər babdə huşi-eybpuşi.
Dil açdı şəhi-xücəstə kirdar,
Gülşayə dedi ki, ey diləfgar.
Yox tanrı içün xilaf özümdə,
Təğyir qərar olan sözümdə.
Mən məhzi-mürüvvətü vəfayəm,
Eyni-kərəmü rüxi-ətayəm.
Bu əmri-məhalə salma xatir,
Olmaz məndin xilaf zahir.
Getdim ki, görəm o növcəvani,
Kimdür qılayım müşəxxəs ani.
Mətlubindür əgər o məcruh,
Mətlubimdür o mayeyi-ruh.
Çün yetürə ol sənə qərabət,
Rəf' ola bəhaneyi-məhabət.
İltəm anı bu hərəmsərayə,
Kim xas olub durur sən ayə.
Ol bülbülü yetürəm bu bağə,
Pərvanəni tapşuram çırağə,
Muni deyüb ol cəhani-vayə,
Vərqa tərəfinə saldı sayə.
Çün gördü o sərvi-bustani,
Var bir-bir eşitdügi nişani.
Bildi ki, degil məgər ki, Vərqa,

Ol şiri-ərini-ruzi-heyca.
Dedi ona: – Ey cəhani-təmkini,
Üşşaqə degil bumudur ayin?!
Yar ilə duta təriqi-əğyar,
Bir ola yanında qeyr ilə yar?
Pünhan raz eyləmək rəvadur,
Əmma ki, həbibdən xətadur.
Lazım deyə yar dərdi yarə
Şayəd ki, bula o dərdə çarə
Vərqa dedi: – Ey hümayi-sayə,
Sayən mənə verdi incə vayə.
Kim qıldı məni şəhə nəsiri,
Ehsan baranı, zilli-xeyri.
Var idi əvəldə ehtiyatım,
Ta sınmıya sağəri-nişatım.
Nəqdini güm eyləmişdi mə'dən,
Fərq eyləməz idi dustü düşmən.
Lütfün məni çəkdi yenlə barə
Ol bardə düzdü sər qətarə.
Hala ki, əlindədür məharım,
Yox dəxi mənim bir ixtiyarım.
Vərqa mənəm, ey dil aşinasi,
Bu xaneyi-dərd kədxudasi.
Əmma sənə rövşən ola, ey şah,
Yox bir qərəzim bu yolda həmrah.
İlla yazıla adım vəfadə,
Çün sabit ola rəhi-cəfadə.
Lütfün ilə ün sağaldı yarə,
Gəldi yenə ab ruyi-karə.
Həm lütf ilə, rüxsət eylə həmrah.
Durub gerü qayıdam mən, ey şah.
Ta qayim ola tutiyi-rəvanım.
Ey mən sənə əbdi-zərxəridə,
Xiclətzədə bəsdür açə didə.
Tah hal ki, gizlü idi razım,
Səbr idi bu işdə çarə sazım.
Daim sağ olgilən səlamət,
Xiffət sənədür, mənə iqamət.

Layiq görünür bu qədrü şanə,
Rüxsət verəsən bu mihmanə.
Bəsdür munu biləvüz mənü sən,
Gəl açma təriqi-amə rövzən.
Şəh der ona: – Ey xücəstə kirdar,
De bu necə sözdür etdün izhar?
Səndən bizə yox küdurəti-dil,
Külfət ola durmağında hasil.
Ol gün ki, mənə yetişdi yarın,
Şərh etdi qəmu nə hali-zarın.
Çün mən o xəbərdin oldum agah,
Qıldum ona dəsti-meyl kutah.
Salim saxlanmış ol əmanət,
Bağlanmış ona rəhi-xəyanət.
Əhd eyləmiş idim, ey niku nam,
Görsəm sənə tapşuram durub cam.
Ol gül qoyalı qədəm bu bağə,
Zinət verəli bu bağü rağə.
Alınmamış ol gülün gülabi,
Ol qönçə buraxmamış niqabi.
Bülbül ona olmamış bərabər,
Od kimsəyə verməmiş ol əxgər.
Yalquzdur anın hərəmsərasi,
Amadə yanında müddəasi.
Bu ürfidə də'bdür həmişə,
Məhrəm ola cümlə xiş-xişə.
Məsmu' degildür, ey yeganə,
Bu babdə qılmağın bəhanə.
Atan tərk etdi gər bu bağı,
Mən atanam, ey gözüm çırağı.
Atayə nə şivə ola adət,
Məndən gələ fe'lə ol fərağət.
Hər nə ki, dedim rəhi-vəfadə,
İnşiallah olur ziyadə,
Hər babdə kəsdi üzrin anın,
Könlün ələ aldı ol cəvanın.
Həmmamə apardı ol əkabir,
Geydürdi ona xəllayi-faxir.

Aldı gedüb ol hərəmsəraye,
Xurşidi müqarin etdi ayə.
Çün ol iki nov nihali-həsrət
Bir-birini gördügündə heyrət,
Zur etdi ol iki dərdnakə,
Filhal oları buraxdı xakə.
Şəh qıldı sədaqət aşkara,
Dil rəftələrə qılub müdava,
Qansısı göz açdı gördü yarın,
Qoydu yerə rəxti-ixtiyarın.
Bir gün, bir gecə ol iki zar,
Bir-birə baxub olurdu əfgar.
Axir yetişüb qərari-xatir,
Oldu olara şüur zahir.
Çün badeyi-əql doldu camə,
Bülbül gül ilə gəlüb kəlamə,
Bir-birinə dəhri-dun bəlasın,
Xar azarın, xəzan cəfasın,
Şərh eylədilər nəqirü qətmir,
Kim netmiş olarə dəsti-təzvir.
Hər bir gördükdə mihmanın,
Saldı ögə sərgüzəşti-xanın.
Gördükdə olar o mahizərni,
Bildilərü duydular xəbərni.
Hər bir-birini görüb vəfadə,
Öz qılduğu də’vidən ziyadə.
Xursənd olub ol iki vəfadar,
Hər bir qəminə bir oldu qəmxar.
Valeh o muna, bu ona heyran,
Qalib o muna, bu ona heyran,
Qalib o muna, bu onadur can.
Əsbabi-nişatü eyş hazir,
Asudə mücavirü müsafir,
Qırx gün, qırx gecə qıldı söhbət,
Bir-biri ilə o həmməhəbbət.
Gəh-gah şəhi-həşəm sitarə,
Pünhan olara qılar nəzarə.

Ta kim görə ol iki hicazi,
Bir-biri ilə qılanda bazi,
Baz ol kəbkə açarmı çəngal?
Ya kəbk bu bazə sındırar bal?
Gördü ki, ol iki pak kirdar,
Bir-birə qılar həqiqət izhar.
Bağlu olara dəri-məcazi,
Səccadələri durur nəmazi,
Birdür olara hüzurü qeybət,
Qət’ etdi bu şivə rahi-reybət.

## GÖTÜRMƏK DƏSTİ-HİMMƏTDÜR BU, VƏRQA VƏSLİ-GÜLŞADƏN

Şəh rəh bulduqda intibahə,
Xət çəkdi cərideyi-nikahə.
Vərqayə dedi ki, ey cəvanmərd,
Ərbabi-həqiqət içrəsən fərd.
Min bə’d gəl olma vəhşət əfza,
Bu dərd ilə qoyma yanə Gülşa.
Gör fürsəti qoyma yerə rahın,
Ol rahdədür bu gün fəlahın.
Ver rüxsəti meyl qıl bu rahə,
Qazi gələ ləb aça nikahə.
Sən bülbülə bəs bu dərdi-hicran,
Qılgil vəsl ilə dəf’i-hirman.
Açgil qapunu girüb bu bağə,
Sal didə fəzayi-bağü rağə.
Yetişməmiş ona dəsti-əğyar.
Saxlanmış əmanətindür, ey yar.
Vərqa ki, eşitdi bu kəlami,
Cuş eylədi digi-nəngü nami.
Artub dərya sifət xüruşi,
Az qaldı bata qürabi-huşi.
Axir ki, o zovrəqi-şücaət,
Nəql eylədi sahilə bəzaət.

Təmkin ilə şahə qıldı təhsin,
Təhsin demə səd həzar təhcin.
Dedi ona: – Ey vəhidi-dövran,
Xətm olmuş əgərçi səndə ehsan,
Faş oldu mürüvvətin cəhanə,
Feyzin ilə pür dili-zəmanə.
Həqqa ki, bu söz degil riyayi,
Kim zimnidə ola jajxayi.
Əmma məndin həm olma qafil,
Ey xosrovi-mülkü şahi-adil.
Taledən əgər əlim durur dar,
Yüz şükr ki, nəqd himmətim var.
Ey kişvəri-ədl şəhriyari,
Qanda aparım bu nəngü ari.
De necə qəbul edər mürüvvət,
Bu şivəni sahibi-fütüvvət?!
Kim sən tökəsən cəhan mali,
Sərf eyləyəsən durub xəyali,
Dil eyləyübən qəmə nişanə,
Öznü salasan o bəhrü kanə,
Ələ salasan o dürri-nabi,
Təsxir edəsən ol aftabi,
Çün zahir ola həqiqəti-hal,
Bazın o şikarə açmıya bal.
İnsaf ola eyşə səddi-rahın,
Qala yürəgində dudi-ahın.
Gəlüb bir edə cəsarət izhar,
Der: mənədürür o dür səzavar.
De şər’idə, ürfdə göftar,
Mə’quldururmu, ey nükukar?!
Həqqa ki, bu gəldügimdən, ey şah,
Ol fikr mənə degildi həmrah.
Səndin gəlüb istəyəm təbibin,
Əldən alayım durub həbibin.
Gəlməgdə mənə bu idi məqsud,
Ol gün ki, vücudim ola nabud,
Çün əhli-vəfadən açılar raz,
Məndən həm ola bəzmdə saz.

Zinhar sənə həzar zinhar,
Nisbət mənə muni vermə, ey yar.
Ol lə’l ki, əlindədür sənindür,
Layiq dür bu mə’dənindür.
Görmiyə xəzan güli-baharın,
Sən sağ ol və yar ola yarın.
Bu bir neçə gün ki, mihmanəm,
Şərməndeyi-lütfi-mizbanəm.
Xatirdə budur ki, şəfqəti-şah,
Mihmanına rüxsət edə həmrah.
Necə qıla şah mehribani,
Məndən əvəz ola dilgirani.
Əğyarsız olsa yardur yar,
Əğyar ilə yar qəmdür azar.
Şəh çün o kəlami eylədi guş,
Öz himmətin eylədi fəramuş.
Heyran qaldı o karü barə,
Min od ona saldı bir şərarə.
Hərçənd nəsihət etdi ağaz,
Vərqa ol tarə düzmədi saz.

## BƏYAN EYLƏR BU SÖZ VƏRQA İLƏ GÜLŞA MƏQALATIN

Gülşa dəx[1] o rəmzidin xəbərdar,
Ol ki, nə fikr eyləmiş yar.
Od saldı o zarə atəşi-eşq,
Göydü yenə ol müşəvvəşi-eşq.
Bir nov ilə qıldı növhə bünyad,
Guşi-fələgə yetişdi fəryad,
Pəs aldı yanına dülrübasın,
Yə’ni ki, o dərd mübtəlasın.
Hər babdə qıldı dilrübayi,
Ol əqdə içün girehgüşayi.

[1] *Dəx* – dəxi

Heç söz anın olmadı qəbuli,
Qıldı aciz o dilməluli.
Dutardı şər e'tirazi-Gülşa,
Rədd eylər idi o söznü Vərqa.
Vərqa dedi: – Ey könül qərari,
Əldin yelə eylə bu şikari.
Əmma bu şəhi-firiştə girdar,
Çox çəkmişdür bu yolda azar.
Sərf etmiş o gəncü mali-aləm,
Ta kim çəni qılmış öznə həmdəm.
Duyduqda sənin bəlavü dərdin,
Bu sineyi-gərmü ahi-sərdin.
İnsaf olmuş anın dəlili,
Timar ilə bəsləmiş əlili.
Hərçənd ol eyləyə mürüvvət,
Rövşən qıla məş'əli-fütüvvət.
Söylə bumudur nişani-mərdi?
Kim anlıya bu bəlavü dərdi,
Bu cümləni eyləyə fəramuş,
Olmaq diləyə səninlə həmduş.
Tərk et həvəs, uyma gəl, məhalə,
Salma özünü, məni vəbalə
Fe'lə gəlməz bu kam məndin,
Dolmaz ol əlində cam məndin.
Olsan sən əgər vəfadə qaim,
Bu nəqd əlində qalsa daim,
Ola mən ilə sənin vüsalın,
Bu xahişi-şövqi-ittisalın.
Ol gün ki, qiyam ola qiyamət,
Sadiqlərə yetməyə qəramət,
Ol gün məni sən vüsali-cavid,
Bu də'viyə yaxşı bağla ümmid.
Çün məks ilə bitməz ehtiyacım,
Yox getməməgimdə həm əlacım.
Bir neçə gün ol xəyalə qane
Bu getməməgə gəl olma mane.
Hərçənd verür şəh istimalət,
Artır mən dəmbədəm xəcalət.

Zahirdə əgərci dur səndin,
Oldum kəsübən hüzur səndin.
Tən gər gedər isə mundadur can,
Verəm sənə cani saxla mehman.
Zinhar ki, saxla əl qəribi,
Qoyma dələ xar əndəlibi.
Kar eylədi dərd o dilfigarə,
Bu şe’ri oxudu anda yarə.

QƏZƏL

Bu gün, ey dust, dilmürğini olmaq kəbab istər,
O mə’mur eyləyən məzrə’ni ömr ilə xərab istər.
Xümari-badeyi-əyyamdən bəs incimiş xatir,
Qoyub baş yerə ta sübhi-qiyamət didə xab istər.
Fəna istər özünə xatiri-naşadımız əmma
Cəhan olduqca cananın məzacın kamyab istər.
Necə əncüm saya hicran düni bu çeşmi-xunbarım.
Olubdur dilgiran sübhi-əcəldin aftab istər.
Dili-ləbtəşnə dərya sahilindən təşnə ovd etsə,
Degil qəm sağərü peymanəvü cami-şərab istər.
Bu gün çün arzudə iddiamız sidqə şamildür,
Sözü rədd olmayıb pünhan duasın müstəcab istər
Demən burdu Məsihi nişə rüx bu arzulərdin,
Degil qafil o aqil axirin hüsnülməab istər.

## BU, GÜLŞANIN OL İSTİĞNADƏ ƏRZİ-HALİDÜR YARƏ

Gülşa bu kəlami eyləgəc guş,
Nə söz, özün eylədi fəramuş.
Əqlin başa vergəc ol pərizad,
Yeritdi necəsi qıldı fəryad.
Pəs söylədi: – Ey tən içrə canım,
Vey kamdəhi-dilü rəvanım.
Mən acizənin yox ixtiyari
Kim ola sənin ilə mədari.

Yoxdur sənə dəxi dəsti-zurum,
Vəslinlə müdam ola hüzurum.
Necə ola cövri bu bəlanın,
Halı nə ola bu mübtəlanın.
Əkməkdə şəmameyi-nəvidim,
Var idi vüsalə çox ümidim.
Peyvəstə xəyali-vəsl edərdim,
Tərtib ona fər'ü əsl edərdim.
Gəh rəxt düzüb, gəhi şəmayil,
Arayişə xatir idi mayil.
Güm oldu çü ol qərəz aradən,
Mə'yus oldum o məddəadən.
Hala qəmudən ümid döndi,
Novmidlik ilə can söndi.
Pabənd ola necə bir əlayiq,
Necə çəkə minnəti-xəlayiq?
Yegdür ura püşti-pa vücudə.
Sənsiz nedərəm bu cismü cani,
Səbr ilə rəvan verəm rəvani.
Saldı məni çünki getdi dildar,
Olmaq nə rəva müsahib əğyar?!
Yetsə xəbərim ki, öldü Gülşa,
Gəl qəbrimə eyləgil tamaşa.
Dirlikdə çü olmadı ərusi,
Xakim qıla bari paybusi.
Öldüm demə vayə ver əmindən
Kəsmə gəl əlimni damənindən.
Qafil məni anda bilmə, ey yar,
Gəl üstümə kim mənəm xəbərdar.
Ta sən qoyasan qədəm o xakə,
Ruhum saça nur o fərqi-pakə.
Haşa ki, şəhidi-xəncəri-eşq,
Gərdənnəhi-qeydi-çənbəri eşq.
Fövt olmağilə ola fənasi,
İtə ol aradə müddəasi.
Ləb bağladı bu söz üstə razə,
Filhal bu şe'ri düzdü sazə.

## QƏZƏL

Bu xümmari-səbuhi-arzusindən şərab istər,
Dağıtmış noğli əflakə gəhi cami-şərab istər.
De ey göz nuri, könlümün süruri, ömrümün nəqdi,
Nədəndür bu ki, can cananə səndən ictinab istər.
Dutub can töhfəsin amadə idim rahi-təslimə,
Gəlür, əlbəttə, malın bir gün ol sahib rikab istər.
Çü almaz dust vəsl əyyami göznə bu mühəqqərni,
Bu mə’yusi-əvvəl min bə’d can mülkin xərab istər.
Degil vəsl istəgim bu xatiri-naşad içün billah,
Budur qorxum ki, yarım yar yarından hesab istər.
Bu dirlikdən qərəz əxzi-mətai-vəsli-canandur,
Və gər nə xəstə dil yaleytəni künti-türab istər.
Degil eyb ər Məsihidən ləcacət görsə cananı,
O Rumi mənbəidən hinduyi-ləbtəşnə ab istər.

## BU, VƏRQANIN TƏSƏLLİ VERMƏGİ GETMƏKDƏDÜR YARƏ

Çün şe’rindən ol gül əndam,
Oldu ol dövridə təhi cam.
Vərqa edə ta təsəlli ani,
Açdı ona babi-həmzəbani.
Dedi durub, ey gözüm qərasi,
Dil qüvvəti, xatirim səfasi.
Qəm yemə həyati-müstəarım,
Gər olsa neçük dutar qərarım.
Tez qayıdam ər olursa ruzi,
Qoymən çəkəsən bu dərdü suzi.
Qurma mənə bənd, verməgil pənd,
Himmət muna necə ola xürsənd?
Mən mundavü anda qala malım,
Ötə bu riayət ilə halım.
Salmışdur ələ Yəməndin iqbal,
Aləm-aləm, cəhan-cəhan mal.

Alub gələyim o malü gənci,
Vacib mənədür çəkəm bu rənci.
Qonanda bu xanə bir də mehman,
Xani qıla mə'dəni-Bədəxşan.
Ta rəf' ola şiveyi-gədalıq,
Zahir ola vəz'i-padşalıq.
Öldürdü məni bu lafi-xali,
Göydürdü bu vəz'i-laübali.
Sərsəbz edəyim bu kişti-lafi,
Yaxşılığa eyləyim təlafi.
Xətm eylədi çün bu söznü Vərqa,
Filcümlə təsəlli oldu Gülşa.
Ta əlni götürdü damənindən,
Bülbülü uçurdu gülşənindən.

## BU, VƏRQA OL SƏFƏRDƏ NƏQDİ-CANIN YARƏ VERMƏGDÜR

Vərqa olar ilə xeyrbadi,
Qıldı dutuban təriqi-vadi.
Bir mil anın ilə ol cəhandar,
Həmrah oluban qayıtdı naçar.
Bir qul özü ilə aldı həmrah,
Düşdü yola, getdi yalquz ol şah.
Bəhruz idi ol qulam nami,
Qabil özü, şəhdlü kəlami.
Getdi demə aşiqi-diləfgar,
Necə qoya gedə kuyi-dildar?!
Aşiq dəri-yari tərk edərmi?
Pa getdisə gərçi dil gedərmi?
At sürdü yetüb o mərğzarə,
Kim dərdinə anda oldu çarə.
Salduğda nəzər o sərzəminə,
Eşq eylədi zur o dilğəminə.
Pəs dedi ona ki, narəvadur,
Mundan etmək sənə xətadur.

Can munda bu müşti-üstixani,
Qanda aparursan, ey filani?!
Ağuş açasan bu yerdə xakə,
Gər yetə xəbər o dərdnakə.
Əlbəttə, gəlüb edər güzari,
Firdövs qılar o sər məzari.
Şərməndəligin bəs aşinadən,
Qurtar özünü qəmü bəladən.
Tale sənə qılmaz oldu yari,
Necə çəkəsən bu zillü xari.
Bu sə'yi-bəltğü ciddi-vafir,
Səndin qəmu xəlqə oldu zahir.
Tikdün yenə göz ki, verə vayə,
Oldu qəmusu ziyani-mayə.
Pəs belə həyatdan nə hasil?
Yekdür olasan bəqayə vasil.
Açgil yüzünə dəri-bəqani,
Qət' eylə bu ülfəti-fənani.
De kim girdi bu xakdanə,
Nakam ani qoymadı zəmanə,
Qıldı təni can ilə nifaqi,
Artıldı bəqayə iştiyaqi,
Şayəd yetürə bu müddəasın,
Göndərdi əliqə çarvasın.
Pəs aldı vüzuvü durdu razə,
Yüz dutdu təriqeyi-niyazə.
İxlas ilə bağladı iqamət,
Xətm olduqda səlati-hacət.
Baş qoydu o canfəda zəminə,
Ta nəqdini tapşura əminə,
Gönlüdəki razə düzdü sazın,
Ərz eylədi xaliqə niyazın.
Key padşəhi-səriri-həsti,
Yıxdı məni cövri-tənpərəsti.
Ta necə verə vücudim azar,
Azarə necə olam giriftar,
Gəsgil tənü canın irtibatın,
Qət' eylə rüsumi-ixtilatın.

Rəf et bu vücuddən nişani,
Cansız nedirəm dəxi mən ani.
Can yaxşıdur, ər görürsə canan,
Nə faidə ola vəslisiz can?
Lütfinlə çıxar məni kəranə,
Bənd etmə bu qeydi cismü canə.
Götürdü könül dil arzudin,
Döndərdi həvəs o rəngü budin.
Bu dar ki, xaneyi-həvəsdür,
Tərki-həvəs edəlüm ki, bəsdür.
Necə bu sipəhri-şö'bədəbaz
Hər dəm mənə bir füsun edə saz.
Ta necə olam əsiri-hicran,
Dövr etmiyə rayim ilə dövran.
Gər qövldə sadiqəm ilahi,
Pozgil bu büsatü dəstgahi,
Vər kazib isəm məni-cigərxar,
Qoygil çəkəyim bəlavü azar
Bu sözdə idi gedüb şüuri,
Getdi yelə ol çırağ nuri.
Pak olduğidin anın duasi,
Bitürdi ona nədür rizasi.
Sərməşqi-fənadin aldı tə'lim,
Can qabizi-ruhə qıldı təslim.
Can mürği gözətdi aşiyanın,
Dinləndi çü buldu öz məkanın.
Tən eylədi rəncini fəramuş,
Bin zövq ilə xakə oldu həmduş.
Qurtuldu o düşdügü bəladən,
Əmn oldu bu çəkdügü cəfadən.
Bir oldu ona vüsalü hicran,
Dərdi-dilinə yetişdi dərman.
Bu növ ilədür cəhan mədari,
Ta verdi alur, budur qərari.
Kim qoydu qədəm bu xakdanə,
Kol[1] getməgə olmadı nişanə.

---

[1] *Dəx* – dəxi

Hasil ki, o sərvi-bağı-möhnət,
Səbz eylədi çünki bərgi-rehlət.
Bəhruz gəzüb bir-iki saət,
Ta ağası qıla fərağət.
Gəldi ki, ani qıla xəbərdar,
Dur atlana gör ki, doydu rəhvar.
Nə gördü baxub o novcəvani,
Qılmış yelə mürği-zindəgani.
Yırtdı yaxasını, açdı başın,
Can göydürübən axıtdı yaşın.
Düşdü o kəmali-iztirarə,
Ta necə o dərdə edə çarə.
Gər getsə, xəbər aparsa şahə,
Qorxur ki, yetə gəzənd o mahə.
Gər saxlamağa durur o kani,
Təchiz gəlüb kim eylər ani.
Nagah bu iki bəla düçari,
Eylərkən ağası üzrə zari.
Bir qafilə gördü, oldu peyda
Arturdu pəs ol fəğanü qövğa.
Çün qafilə əhli duydular hal,
Təchizinə cümlə açdılar bal.
Ta göz açasan o lö'löyi-nab,
Oldu batub anda qərqi-girdab.
Cövhər yenə övd qıldı kanə,
Fəxr etdi o kan nöh asimanə.

## EŞİTMƏGDÜR BU, MÖHSÜN ŞAHÜ GÜLŞA FÖVTİ-VƏRQANİ

Olduqda təmam o şüğli-cansuz,
Ol qövm dağıldı, qaldı Bəhruz.
Qayıtdı gerü pəs ol vəfadar,
Ta xosrovi eyləyə xəbərdar.
Saldı özünü sərayi-xasə,
Düşdükdə qəbuli-ixtisasə.

Ləb açdı ki, şah ola səlamət,
Vərqayə yetişdi bu qəramət.
Şahiddür əlimdə atü taci,
Ta kim ola sidqimin rəvaci.
Eşitdi muni çü ol güzidə,
Bil eyni-cəhanə nuri-didə.
İstərdi edə nihan o razi,
Xali qıla sövtdin o sazi.
Tişrə çıxuban nə gördü ol şah,
Məmlu durur ol xəbərdən əfvah.
Mümkün degil etmək ani pünhan.
Qayıtdı hərimə gördü canan,
Olmuş agah bu xəbərdən,
Yandurmuş özünü ol şərərdən.
Etmiş duruban siyəh libasın,
Əhya qıluban rüsumi-yasın.
Urmuş qəmu cins səbrə atəş,
Atəş sifət ol aradə, sərkəş.
Qılmış bitab, çak sinə,
Açılmış üzə dəri-dəfinə.
Ol çakdə sinəsi münayan,
Çün zülmət içində abi-heyvan.
Rəh açmış o çeşmeyi-həyatə
Qan qatmış o qənd ilə nəbatə.
Yox, parə qılub o cibi-həsrət
Açmış rüxi-xasə babi-cənnət.
Xali olmuş gülabdən gül,
Zahir ona zəxmi-çəngi-bülbül,
Dökmüş, urmuş nəmək kababə,
Seyl ilə kələf o mahtabə.
Açmış başı, zülf edüb pərişan
Dökmüş gülə dəstə-dəstə reyhan.
Əzbəs yüzə urmuş idi seyli,
Nə yüz əli olmuş idi neyli.
Qan mövcinə qərq olub gülüstan,
Xali sünbüldən ona bustan.
Saçmış kani-əqiqə səd cər.

Yolmuş müjəsin o laübali,
Qalmış hinduyə kişi-xali.
Etmiş duruban siyəh libasi,
Əhya qıluban rüsumi-yasi.
Başı açuqü saçı müşəvvəş,
Almaz gözə kimsəni o məhvəş.
Saat-saat gedər özündən,
Yoxdur xəbəri özü sözündən.
Gördü çü şəhi-xücəstə kirdar,
Gülşayə olundu kari-düşvar,
Olmaz mən’ ilə ol təsəlli,
Əlhəqq mən’in degil məhəlli.
Oldu ona yar ol əzadə
Qəmxarlıq etdi ol bəladə.
Bir gün, iki gün bu rəsmə ol şah,
Ol dərdkəş ilə oldu həmrah.
Şəh anladı ol əzarəsidə,
Heç növ ilə olmaz arəmidə.
Fikr etdi aparsa ol figari,
Görsətsə ona məzari-yari,
Bir neçə gün etsə anda muyə,
Təğyir verə bu rəngü buyə.
Əmr eylədi ol şəhi-cəvanbəxt,
Vərqa qəbirinə nəql edün təxt.
Gedüb verəm anda aşü abin,
Qəbrin düzübən yığam tərabin.
Ol şüğl yetişdi ehtimamə,
Pəs qıldı səla xəvasü amə.
Atlandı şəhü tamam ləşkər,
Həmrah olub əhli-şəhr əksər.

## BUDUR, GÜLŞA ÖZÜN QILMAQ MƏZARİ-YAR QURBANİ

Bir hudəci-dərd içində Gülşa,
Dutmuşdu o tale ilə qovğa.
Nə səbr əlində, nə qərari,
Var idi könüldə iztirari.

Ola yetişə məzari-yarə,
Qurban qıla öznü ol məzarə.
Yetişdükidə o sərzəminə,
Pəs eylədi iltimas əminə.
Ümmid budur ki, şahi-aləm,
Rüxsət verə kim bulardan əqdəm.
Yalquz gedəm ol səri-məzarə,
Dərdi-dil edəm məzari-yarə.
Bu zümrəyədür təriqi-adət,
Yığlamaq içün məzari-xəlvət,
Şəh verdi rizavü getdi ol yar,
Ta mərqədi-yarə yetdi ol zar,
Çün düşdü gözü məzari-yarə,
Zur eylədi şövq o dilfigarə.
Qoydu gerü bir kənarə səbri,
Düşdüvü qucaqladi o qəbri.
Yüz qoydu o xakə, qıldı avaz,
Çağırdı ki, ey mənimlə həmraz.
Həmrahlığın bu idi, ey yar,
Kim qılmıyasan məni xəbərdar.
Səbr eyləmədün bu suzü dağə,
Çəkdün özü guşeyi-fərağə.
Qurtardın özün nəmü ələmdən.
Peyvəstə bu dəhr edən sitəmdən
Rəhm eyləmədün bu dilkəbabə,
Getdün məni saldun iztirabə.
Sağınməgil, ey mənə olan can,
Canə verəm imtidadi-hicran.
Dil nəqdini gör bu xaksarın,
Filhal necə qılar nisarın.
Əl vermədi munda çün vüsalın,
Bari bula anda ittisalın.
Eşq icrə, bəgim, bu narəvadur,
Bil aşiqə qayəti-xətadur.
Bir yar çəkə özün bəqayə,
Bir getmiyə aldana fənayə,
Baş qovza olam səninlə həmduş,
Yetişdi ərus açgil ağuş.

Muni deyüb ol büti-səmənbər,
Çün səbzə özünə çəkdi xəncər.
Nəsb eylədi dəstəsin məzarə,
Növkini o sineyi-figarə.
Bör zövq ilə açdı qəbrə ağuş,
Ta qəbrə olunduğunda sərpuş.
Tən lövh oldu rüxi-məzarə,
Ruh oldu qərin ruhi-yarə.
Mərdanə əgərçi qıydı canə,
Yetişdi vüsali-cavidanə.
Gər desə biri degil müvafiq,
Şər' içidə bu ədayi-aşiq,
Öz nəfsinə qəsd narəvadur?!
Gər olsa cəhan-cəhan xətadur.
Söylə zahir durur bu məzmun?
Mərfu' durur vəbali-Məcnun.
Hər fərqə ki eşq saldı sayə,
Hər fərdə ki, şövq yazdı ayə,
Uymaz dəxi əql edən füsunə,
Axir məşhur olur cününə.
Heç kimsənə olmadı xəbərdar,
Kim netdi özünə ol diləfgar.
Şəh gəldivü düşdü bargahə,
Yer verdi o şəhrivü sipahə.
Göndərdi rəvan bir-iki məhrəm,
Ta kim olalar o yarə həmdəm.
Gəldilərü gördülər rəvani,
Ölmüş, yatur anda canfədani.
Almış anı zəxmi-növki-xunxar,
Bərgi-gülü necə kim dələr xar.
Agah qılub şəhi-cəhani,
Ərz eylədilər o macərani.
Şahın oldu siyah ruzi,
Birinə yüz artdı döndü suzi.
Heyrət ani saldı iztirabə,
Dil atəşə verdi, didə abə.
Çox yığladı, qıldı ahü nalə.

Heyran qaluban o vəz’ü halə.
Yandurdu çigər o macərayə,
Rəxt etdi siyəh, girüb əzayə.
Qüssalə gəlib yudu o mahi,
Olduqda təmam o dəstgahi.
Əmr eylədi ol şəhi-vəfadar,
Açdılar o qəbri-aşiqi-zar.
Ol mərqədə qoydular həm ani,
Gəl gör bu cəhani-bivəfani,
Ta qılmadı xak olarə sərpuş,
Öldürmədi, qılmadı həmağuş,
Həmxabə olundu yar yarə
Bu qəmlü yetişdi qəmküsarə.
Şəh verdi oların abü aşın,
Hər miskinin düzüb məaşın

## MÜCAVİR OLMAĞIDUR BU ŞƏHİN OL MƏRQƏDİ-PAKƏ

Çün oldu bəhar aləmaray,
Ruyi-çəmən oldu behcətəfzay.
Pəs çıxdı o qəbr sinəsindən,
Zahir oluban dəfinəsindən.
Baş çəkdi iki nihali-həmbər,
Biri sərv, biri sənubər.
Çıxduqda iki nihali-mə’ruf,
Hər bir olmuş birinə məlfuf.
Şəh bağlıyub anlara iradət,
Edərdi gəhi gəlüb ziyarət.
Axir muna düşdü rayi-şahi,
Ol məşhədi edə təxtgahi.
Çün şah o səkanə saldı sayə,
Sayə o zəminə verdi vayə.
Ol şəhr əhli gəlüb təmami,
Bay ilə fəqirü xasü ami.
Görmüşlər idi çü rahəti-dil,
Cümlə ol aradə dutdu mənzil.

Şəh hər kişinin görürdü şanın,
Şanə görə mülkdin nişanın.
Yazdurub edərdi ona təslim.
Təslim ilə göstərürdi təkrim.
Verüb ona məune imarət,
Bu rəsmə edərdi ol riayət.
Gördükdə şəhin təfəqqüdatın,
Xas ilə əvamə iltifatın,
Doldu ev ilə dəştü səhra,
Bir şəhri-əzim olundu peyda.
Əlqissə, o Məşhədi-münəvvər,
Hacətgəhi-aləm oldu əksər,
Zira kişi bulduğu muradın,
Arturdu xəlayiq e'tiqadın.
Şah olmaduğu vəfadə qasir,
Qıldı o məzarə kalmücavir.
Açdı üzünə dəri-mübərrat,
Hər gün qılar idi tazə xeyrat.
Bu rəsmə keçürdi ol mədari,
Ta axıra yetdi ruzgari.
Tərk etmədi və'z ol əhli təkin,
Təhsin ona, səd həzar təhsin.

## BU, XƏTMİ-NÜSXƏ BİR MÖ'CİZDÜR OL XƏTMİ-RİSALƏTDƏN

Saqi, qanı badeyi-rəhiqin,
Gündüz yarın, gecə rəfiqin.
Dur axiridür, gəl etmə təqsir,
Müştaq o cəvanədür məni pir.
Nəql ötdü, boşandı nöqli-xani,
İçildi şərabi-həmzəbani.
Dur qoymagilən bu dilşikəsti.
Pamal edə dərdi-nimməsti.
Gəl üstümə zarü qatəvanəm,
Qıl zində məni ki, mürdə canəm,

Ver badə durub bu bad dəstə,
Şayəd ola bu şikəstə bəstə.
Başa çıxa nə’şeyi-ayağın,
Axir suyunu verəm bu bağın.
Bəllü bu kəlam xasü amə,
Hər sahibi-izzü ehtiramə.
Bir vaqiədin zaman ola dur,
Ol nəqldə naqil ola mə’zur.
Gər yaxşı yaman ola zirun,
Hərrasə durur anın rücui.
Az etmiyə naqil ehtiramın,
Nəql etməsi ravinin kəlamın.
Bu lazımədür qılanda təqrir,
Ravi sözünü nəqirü qətmir.
Naqil çəkə rişteyi-bəyanə,
Ol tərz əda qıla fəsanə.
Gər sidqdə olmasa güvahi,
Yox qayilin arada günahi.
Məşhur durur bu hərfi-əqli,
Küfr olmaz aradə küfr nəqli.
Ravi durub eyləmiş rəvayət,
Bu qisseyi-köhnədin hekayət
Şəh Möhsün, o dideyi-zəmanə,
Çün çeşmi-zəmanə ol yeganə.
Bir gün durub etdi bu xəyali,
Kim edə o gündə cəşni-ali.
Nəql eylədilər düzüb bisati,
Ol mərqədə təxti-inbisati.
Yığıldı əhalivü əkabir,
Cəm’ oldu əalivü əsağir.
Gəldi olub o behişt bağı,
Qəmdin qəmunun dili-fərağı.
Hər kim bir aradə dutdu mənzil,
Mənzil doluban boşandı məhmil.
Bunlar məşğul bu sürurə,
Yetişdi biri gəlüb həzurə.
Dedi şəhə: – Doğdu aftabın,
Baş ilə ayağ budur səvabın.

Müjdə ki, sənə yetişdi məqsud,
Yüz verdi bu gün cəhan-cəhan sud.
Bər verdi sənə nihali-dövlət,
Dur ver çü əlində var fürsət.
Yə'ni gəldi budur rəsulun,
Hər babdə qibleyi-qəbulun.
Sayə saldı sənə nəvasi,
Canlar ola sayəsi fədasi.
Ol sədrnişini-qabi-qövseyn,
Bu büq'əyə verdi zinətü zin.
Sənə qona gəldi mehmandur,
Dur vəsləti bul ki, raygandur.
Mənsurü müzəffər ol qəzadən,
Olmuş fariğ o müddəadən.
Ovd etmiş o tanrının həbibi,
Ol gülbüni-şər' əndəlibi.
Şəh anladı ona yetdi vayə,
Saldı başına hümay sayə.
Cünbişdə mübəşşirin dərayi,
Yüz qıldı rəsul xakpayi.
Bir növ etdi ədayi-xidmət,
Əshabə qəmu yetişdi heyrət.
Min izzət ilə o müctəbani.
Ol məclisi-cəşnə dəmi fərağı,
Durdu seyr edə o bağı.
Bağ içidə ol həbibi-dəyyan,
Əshab ilə seyr edərdi hər yan.
Gördü yetişüb anın güzari,
Vərqa, Gülşa olan məzari.
Bir mərqədi-pak ol aradə,
Firdövs ona rəşk edər səfadə.
Möhsündən ol aftabi-iqbal,
Qıldı duruban təfəhhüsi-hal.
Şəh ərz etdi o macərani,
Eşq anlara eyləyən cəfani,
Əhval qəmu nəqirü qətmir,
Ol Həzrətə qıldı cümlə təqrir.

Meyl eylədi iştiyaqi-əshab,
Ta kim açıla o riştədin tab.
Durdu qəmu rahi-iltimasə,
Ol şivədə səxt edüb əsasə.
Vari dedi: – Ey rəsuli-muxtar,
Bu həzrətə bir muradımız var.
Lütf eyləyə ləb aça duayə,
Vərqayə verə duasi vayə.
Dirlüb dura ol xücəstə kirdar.
Bu mö'cüzi görə yarü əğyar.
Biz həm görəlüm o novcəvani
Bir-bir qılalum ziyarət ani.
Pəs verdi cəvab o bərgüzidə,
Gey siz mənə cümlə nuri-didə.
Yox ömr dəxi o novcəvanə,
Dirilə qədəm qoya miyanə,
Müşküldür icabət iltimasə,
Qoymağ divar bu əsasə.
Durdu ayağə Əmiri-Mərdan,
Ol səfşikənü hüjəbri-meydan,
Ol övci-səmahətə məhi-bədr,
Yə'ni ki, Əliyyi-aliəlqədr,
Pəs dedi rəsulə, ey xudavənd,
Çün xatirimiz bu şüğlədür bənd.
Sən şahid ol eylədim qərari,
Ta cəm' yetə muradə vari.
Qalmış nola ömrümün bəqasi,
Qıldım qəmu Vərqənin fədasi.
Bağışladım ani ol cəvanə,
Ta zində olub gələ cəhanə.
Çün qıldı o mə'dəni-səxavət,
Sərmayeyi-ömrdə səmahət.
Şahi o hədisi-heyrətəfza,
Ol şüğlidə qıldı fikr peyma.
Əndi yerə ruhi-qüdsi-təlqin,
Pəs dedi rəsulə olma qəmgin.
Həqdin vardur sənə səlamım,

Sonra bu xülaseyi-kəlamım,
Əmr eylədi bu xüsusə bari,
Hər nə qılmış Əli qərari.
İqrari bizim qəbulumuzdur,
Çün ol şayəstə qulumuzdur.
Bağışladun ömrünü ol cəvanın,
Verdük yenlə muna bərabər,
Səhl ola de bu ətayi-əhqər.
De xatiri xoş ola Əlinin,
Bu babdə qədri çox vəlinin.
Verdim Gülşayə dəxi ruzi,
Ta yarının ola dilfiruzi.
Qəm çəkmə gəl olgilən fərağət,
Dur eylə dua, qılam icabət.
Bu səhlidür eyləsən təmənna,
Mə'vati-cəhan bulurlar əhya,
Çün buldu rəsul müddəasın,
Durdu yerə düşdü rəvasın.
Ol hacət içün qılub nəmazi,
Dərgahə açub kəfi_niyazi.
Ləb açdı ki, ey xudayi-aləm,
Səndən oldu mükərrəm adəm,
Bu nüktə olubdur azmudə,
Lütfün irişən yetər şühudə,
Ey sən qəmu feyzü cudi-aləm,
Səndən olmuş vücudi-aləm.
Sazəndeyi-çar taqi-şeşdər
Arəndeyi-dövri-çərxi-çənbər
Bu arada zatının həqiçün,
Ol zatə sifatının həqiçün.
Bu arada zatının həqiçün,
Xahişdə o cüstücu həqiçün
Xəlq içrə itaətin həqiçün,
Də'vətdə icabətin həqiçün.
Bu qəbriyə sinə ver nicati,
Qılgil yenə tazə ol sifati.

Bu gülxəni eylə tazə gülşən,
Ta qüdrətin ola xəlqə rövşən.
Bu sözdə idi hənuz Əhməd,
Yetişdi o qəbrə feyzi-sərməd.
Açıldı məzarü durdu Vərqa,
Həmrah anın ilə ol dilara,
Əmma ol iki degildilər ur,
Puşişləri idi kisvəti-nur.
Birinə yüz anların kəmali,
Artmış o kəmal ilə cəmali.
Göz açdı çü ol iki nikufal
Bildilərü duydular nədür hal.
Ta gördülər ol şəhi-cəhani,
Duydu anlar ki, kimdür ani.
Rüxsarə yetürdilər o payə,
Kim ərşə yetürmiş idi sayə.
Baş qavzayub etdilər dualər,
Ol həzrətə qarşu çox sənalər.
Qıldı ol iki tapub səadət,
Təcdid kəlimeyi-şəhadət.
Həzrət bulub anları müvəhhid,
İmanivü e'tiqadi zayid.
Gördü oları bəs-girami,
Pəs aldı yanına şahi-Şami.
Belə olunur dedi hüveyda,
Kim Gülşadur nəsibi-Vərqa.
Bu babdə söz demək xətadur,
Sevda dəxi qeyrə narəvadur.
Pəs bağladı onların nikahın,
Ta kim içələr vüsal rahın.
Möhsün şəh, o adili-zəmanə,
Dil bağlamamışdı çün cəhanə.
Ərz etdi rəsulə key şahənşah,
Lütfün çü olara oldu həmrah.
Həqqa mənə həm bu idi məqsud,
Kim olalar ol ikisi xoşnud.

Verdim Vərqayə təxti-şahi,
Tapşurdum ona bu dəstgahi.
Dəxi muna dutmasın bəhanə,
Versin mənə çərx saliyanə.
Bir guşədə ta olam fərağət,
Asayiş ilə qılam ibadət.
Cəm eylədügüm bu mülkü mali,
Olsun qəmusi anın həlali.
Hazir o səhabeyi-güzinlər,
Qıldılar ona çox afərinlər.
Gər aqil isən dur urməgil laf,
İnsafın var, vergil insaf.
Qıl yaxşı nəzər, göz aç bu halə,
Bu şivə dəlildür kəmalə.
Eşitdünmi ki, bir şahənşah,
Bəxt ilə rizasi ola həmrah?
Qeyrinə verə o tacü təxtin,
Özünə qıla siyah bəxtin?!
Əldən qoya təxt dürü gər tac,
Bir nan içün ola qeyrə möhtac,
Gördü bu ədani çün peyəmbər,
Möhsün yerə qoydu başdan əfsər.
Bildi yoxdur anın riyasi,
Candan budur ona müddəasi,
Qoydu düzüb onda dəstgahi,
Vərqa fərqinə taci-şahi.
Tə’lim ona qıldı də’bi-mülkət,
Arturdu o şəxsə şanü şövkət.
Çün həzrət idi aradə dai,
Vərqa qıla bilmədi nizai.
Qılduqda qəbul xahü naxah,
Təxt üstünə çıxdı oldu ol şah.
Şəh Möhsünü saxladı girami,
Hər gün gedübən verür səlami.
Düzdü nə olursa ehtiyacın,
Hər babdə gözləyüb məzacın.
Qılmazdı o yolda canə təqsir,
Ömr ilə fərağət etdi ol pir.

Hər şüğlidə kim anın səlahi,
İçməzdi gər olmasa o rahi.
Vərqayə yetişdi çü muradi,
Afaqə dağıtdı ədlü dadi.
Bir növ ilə qıldı o ədalət,
Kəsri ədli yaşurdu rayət.
Ol dövlət ilə vüsali-Gülşa,
Qıldı ani eyşdən təvana.
Girdi gülünü dərüb o bağın,
Çəkdi başa rahın ol əyağın,
Gülşa dəxi buldu ol vüsali,
Dutdu ələ nəqdi-ittisali.
Hər bir-birisilə xürrəmü şad,
Olmuşlar o dami-qəmdin azad.
Ta ömr ola hər birin mədari,
Eyş oldu cəmiyi-karü bari.
Əksər budur iqtizayi-dövran,
Kim vəsl verür nəticə hirman.
Əlbəttə, biri ki, çəkdi rənci,
Axir ələ düşdü nəqdi-gənci.
Bu nüktə durur aradə şaye
Heç kimsənin olmaz əcri zaye.
Pəs eyb ola şəxsə naümidi,
Qət' eyləyə rişteyi-nəvidi.
Aqillərə ol durur süqudə,
Səbr edə hər işdə dirü zudə
Axir ki, anın yetər muradi,
Ol üqdəyə görünür güşadi.

## VƏSİYYƏTDÜR BU FƏRZƏNDİ-ƏZİZƏ

Ey qüvvəti-püşt, meyveyi-dil,
Sənsən çü nihali-ömrə hasil.
Vacib mənədür sənə verəm pənd.
Dutgil ani olasan bərumənd.

Yetişdi əlif hesabi nunə,
Qəddi-xəm onadurur nümünə.
Dəhr eylədi təcrübə viasi,
Can oldu təcarib aşinasi.
Ol rahü rəvişdə ömri-acil,
Var əksərinə hənuz racil.
Fövt oldu çü fürsəti-cəvani,
Zinhar ötürməgil sən ani.
Əvvəl sənə bu durur əmanət,
Qılma ol əmanətə xəyanət.
Təklifə qoyan zaman əsasi,
Vacibdür o gün xudaşünasi.
Pəs al daməni-şəriət,
Kim rəhrövə rəh odur həqiqət.
Qoy şər'ə ülum ilə binani,
Ta anlıyasan nə müddəani.
Bir elm ki, şər'idə rəfiqin,
Olmaz, qoy o yol degil təriqin.
Ol danişi qılma dam nanə.
Zinhar çü mərdümi-zəmanə.
Hər qapuda öznü xar qılma,
Biizzətü e'tibar qılma.
Açgil yüzə babi-kəsbü pişə,
Göstər özünü qəni həmişə.
Miknət verə əl, dur et fərağət,
Gər olmasa eyləgil qənaət.
Müğlis ki, anın yox ola səbri,
Küfrə çəkər ani fəqr cəbri.
Demə birə dərdi-faqə zinhar,
Yetməz sənə sud olursan xar.
Tərk eylə məhal içün həvəsni,
Təprətmə o rahdə cərəsni.
Himmət sərf etmə cəmi-malə,
Kim mali-nəvalədür zəvalə.
Bay et özü hikmətü hünərdən,
Kim bu iki əmnidür zərərdən.

Olmaz hünər əhli xarü möhtac,
Qanda ola fərqi-qədrədür tac.
Nəfs istəginə həvəs yamandur.
Sudi qəmu mayeyi-ziyandur.
Açma yüzünə düruğ babın,
Salgil suya dəftərü hesabın.
Getmək öz-özünlə narəvadur
Qeyr evinə bitələb xətadur.
Qıldı bu şivə çoxləri xar,
İzzət götürüb kəm etdi miqdar.
Qoyma dişrə çıxa əyalın,
Nagah həram olur həlalın.
Cəhl ilə təkəbbür etmə zinhar,
Xəlq içidə olma gözlərə xar.
Yetsən kimə ilk ver səlami,
Bul payeyi-izzü ehtirami.
Ləb qiybəti-şəxsə açma zinhar,
Cəhd eyləgil olma mərdümazar.
Xəlq ilə kəm eylə aşinalıq,
Kim yoxdur o şəm’ə rövşənalıq,
Qət’i-tə’mə eylə izdivacın,
İncimiyə kimsədin məzacın.
Kim qılsa xüsumət aşkara,
Mümkün ola eyləgil müdara.
Gər qılsan anı həvalə səbrə,
Səbr əcr verür yə’qin o cəbrə.
Bənd olmuya ta ki, şanə rişə,
Yalquzluq ilə keçür həmişə.
Ol halətü vəz’ kim sənindür,
Sayən bilfərz düşmənindür.
Cəhd eylə o gündə dutmagil yar,
Ta yetmiyə sənə tə’ni-əğyar.
Möhtac əgər olasan rəfiqə,
Qıl meyl bu badeyi-rəhiqə.
Zövqü çoxü təb’ü nəfsi salim,
Tə’mi xoşü nəş’əsi mülayim.

Həqqa ki, mənim bu üç kitabım,
Rövşəndür olardin aftabım,
“Vərqa Gülşa”vü “Danəvü Dam”,
“Zənburü Əsəl” üçüncüyə nam.
Hər sazdədür biri nəvasənc,
Hər razdədür birisi min gənc.
Gər xu duta anlara məzacın,
Qalmaz dəxi yarə ehtiyacın.
Çün bədr ola mahtab salın,
Saxla özünü yığub xəyalın.
Gər sayılasan düşüb miyanə,
Yarın ola gərdişi-zəmanə,
Alimlər ilə dur eylə söhbət,
Dut cahildə kənar, nifrət,
Çün xülqi-rəfiqdür müəssir,
Aldanmıya taki, nəfsi-kafir.
Ver nəf’ birilə olsən ənbaz,
Xərcin gərək ola dəxlidin az.
Adət üzə qılma hərzəguyi,
Doldurma o zəhridin səbuyi.
Möhtac ola rəhmin eylə rəhmət,
Rəhmətdür olar yolunda zəhmət.
Tərk eylə libasi-sürxü zərdi,
Zira o degil kəmali-mərdi.
Kudək sifət olma rəng əsiri,
Övrət geyə yaxşıdur həriri.
Qıl özünə zinəti ədəbdən,
Təsbihi-ədəbni qoyma ləbdən.
Ta cəhd var hirsi az et,
Qüddusilərə durub nəmaz et.
Görsən nə o cinsə verməgil dil,
Asan işini gəl etmə müşkil.
Çün yox durur ehtiyacə qayət,
Ol şüğlidə kəsmə gəl fərağət.
Hər işə ki, rayın edə yari,
Hazır bil oradə kirdgari.

Gər olsa sənin bu e'tiqadın,
Açılsa bu nüsxədə səvadın.
Mane sənədür o gahü bigah,
Hər vizrü vəbalə gözləsən rah,
Qalmaz dəxi pəndə ehtiyacın,
Ol şivədə xud dutar məzacın.
Dövran çü mənə yetürsə növbət,
İçürsə durub şərabi-rəhlət.
Unutmagilən məni duadən,
Məhrum etmə o müddəadən.
Qurtulmaz əgər bu pəndi-gənci,
Gər eyləsə kimsə nüktəsənci.
Liykən bu sənə qılur kifayət,
Hifzində gər etməsən kəhalət.
Az bilməyüb olgilən xəbərdar,
Hər pəndə durur nəticə büsyar.
Meylin hər işə olursa dilxah,
Hər canibə dutsa arzu rah.
Yarın ola hifzi-ovni bari,
Ta olmuyasan həva şikari.

## BU, AXİR QÖVLƏ VERMƏK ŞƏH ADİLƏ ZİBÜ ZİNƏTDÜR

Tubilik, ey bəridi-məqsud,
Saldun əlinə kilidi-məqsud.
Bin sə'y ilə bağlayub miyanın,
Açdun qapusun bu gəncdanın.
Əcnasi-cəvahir etdün izhar,
Ta görsə anı gəlüb xiridar.
Qansısına bulsa istitaət,
Alub verə mayeyi-bəzaət.

---

[1] *Kol* – ki, ol

Rəf' eylədün ərçi öz fərağın,
Gördün dolu əldəki əyağın,
Qıldun tazə bu bağü rağí,
Tavus etdün gəzən kəlağí.
Sanma zaye olur bu rəncin,
Məxfi qalunur bu gizlü gəncin,
Gər cilvə qıla bu bikri-ziba.
Tiz eyləyə iştihar peyda.
Alduqda ələ anı göhərsənc,
Bilür ki, nə dənglü gəncdür gənc,
Təxsis bu şah, şahzadə,
Kol[1] maliki-mülkədür nəvadə.
Novbadeyi-şaxsari-şahi,
Dünya püşti, cəhan pənahi.
Sinn ilə cəvanü ra'y ilə pir,
Tədbirinə bağlu payi-təqdir.
Ta kim o hümayi-ovci-iqbal,
Dəhrə saldı müzilleyi-bal.
Açdı rüxi-xəlqə babi-şadi,
Ol məzrəə verdi abi-şadi.
Şəxsi-dəhrin açıldı bəxti,
Gördü iyəsində tacü təxti.
İqbali büləndü fikri saib,
Olmuş iqbalə fikr naib.
Çün kövkəbi-ədli doğdu kanə,
Teyhu pəri-bazi qıldı lanə.
Cəm etdi dua sacub ədalət,
Zülm üz bürüdü tapub xəcalət.
İtürdi cəhan görəndə cudin,
Dövranidə məskənətvü cudin.
Samiyyi-əvvəl, Səfiyyi-sani,
Dövr əhlinin əmnivü əmani.
Mövsüm olmaq bu iki namə,
Rəmz ilə dəlildür təmamə,
Sərvərligə ta ki, mindi ati,
Yetişdi kilidi-şeş cəhati.

Tüğyaninə kim ki, verdi fərman,
Fərman ona yetürdi hirman.
Kim basdı ayaq zehi-xilafə.
Nəkbət ani saldı piçi-nafə.
Vermiş ona bu sifət xudasi,
Asudəligi ədu cəfasi.
Ol cövhəri-zati kani-vayə,
Ta təxt ilə tacə saldı sayə,
Əhli-fəzlin olub əyari,
Arturdu birə yüz e'tibari.
Nəqlində fünuni-elm məxzun,
Əqlində üquli-dəhr məcnun.
Aciz yanidə dil aça Həssan,
Ta qalib şe'rə nitqidür can.
Aləm zeyi, cəhan səfasi,
Tanrı yari, dil aşinasi.
Var dil aça gər hədisə əksər,
Əmri mə'rufü nəhyi münkər.
Vəsfində həriri-bülbüli-zəng,
Olmuş bu qəsidədin xoş ahəng

## BU, QƏSİDƏ DƏXİ OL ŞAHİ-CƏHAN VƏSFİNDƏDÜR

Təkəllüfsüz bu gün bu xak taci-fərqi-keyvandur,
Səfi ibn Səfi ta kişvəri-İranə sultandur.
İraq olsun yəman gözdən, o dövlətdin bu kişvərdə,
Mətai-zülm gümnamü qumaşi-ədl ərzandur.
Vücudi sayəsi tubivü darülxüld iqlimi,
Girib ol sayəsidə ca dutar kim əhli-imandur.
Nə layiqdür birinə padşahlıq də'visi qılmaq?!
Munun əsrində kim cəddi rəsulü şahi-mərdandur.
Həsəbdin həm nəsəbdin nayibi-həqdür xilafətdə,
Ona qəd xəm qılub baş əgməyənlər puri-şeytandur.

Bu dövlət düşməninin küfrinə nəss əldədür bürhan.
Əduyi-ali-peyğəmbər yəqin övladi-Mərvandur.
Vücudindən olubdur bu cəhani-mürdədil zində.
Bu qalibdə anın cismi lətifi filməsəl candur.
Anınçün oldu güm sultanlığında məskənət nami,
Kəminə bəzlidür dəryavü ədni bəxşişi kandur.
Olub kəsrindən əfzun ədlivü qeysərdən iqbali,
Bu, rövşəndür, buna nə ehtiyac sövq bürhandur.
Ola ta hadisati-dəhridin eymən kəvakibdən
Gecələr ta səhər orduyi-iqlimi çirağandur.
Kəminə xadimi bəzmindədür Nahid ilə Bərcis,
Mühəqqər cakəri, rəzmində Samü Givü Dəstandur.
Xüsumətdə libasi-fəthü nüsrət qəddinə ziba,
Səlatinlərdə sərvərlik qəbasi ona cəsbandur.
Olub münkirlər içün çeşmi-xəlqə cənnət isbatı
O dövlətxanə kim çərxi-müqərnəs ona eyvandur.
O şadrvani-ali Kə'beyi-məqsuddur xəlqə,
Sütunlər ol aradə filməsəl hənnanü mənnandur.
İnankəşdür səməndi-meylini zeyqi-məsamindin,
Anın cövlanınə bu rəb'i-məskun təng meydandur.
Götürmüş himməti bu nim-xurdi-qeyridən didə,
Vəgər nə xur sifət fəthi-əqalim ona asandur.
Yəqin əhli-həqiqət xatirində bir fəna şeynin,
Çoxü azi bədü niki nəbudü budi yeksandur.
Mələk xülqü firiştəxu, üzü nurü sözü hikmət,
Bəşər demək o zatə cəhlilə qayətdə böhtandur.
Ənisidür Ərəstu, e'timaddidövləsi Duqrat,
Cəlisi Calinus hikməti ilə özü Loğmandur.
Lədünni elmidin kim şah olubdur kəsbisiz malik,
Mülazim gecə-gündüz ruhi-Əflatün səbəqxandur.
Əcəb məzhər durur kim əqli-küll həngami-təqriri,
Xəcildür ləb aça yanında guya tifli-nadandur.
Ülumü fəzlü hikmət payəsi bir yerdədür hala,
Əvamünnası bu mülkün xəvasi-əhli-yunandur.

Məhü əyyamü salü həftə şahi-din duasilə,
Behəmdüllah Məsihin tutiyi-nitqi xoş əlhandur.
Ola ta əncümü əflak ilə fəcrü əşa dair,
Ki ta nuri-səbahət birlə ruyi-sübh xəndandur.
Ki ta möhtacdur insan zəminə, lə'ldür kanə,
Ki ta nur içrə zülmət, zülmət içrə abi-heyvandur.
Neçə dərya yüzündə zövrəqi-qəbra durur sakin,
Neçə fülki-fələk bu lücceyi-gövn içrə gərdandur.
Ola məhfuz ilahi zati-şəh cümlə həvadisdən,
Bəqasi baisi-icrayi-şər'ü hökmi qur'andur.

Ol sahibi-təxt mülki-birənc,
Gər ola bu gəncidin göhərsənc,
Düşsə ona çeşmi-iltifati,
Verə təni-mürdəyə həyati,
Tale ola yar əgər bu falə,
İltə anı zirveyi-kəmalə.
İksiri-tila qılub risasi,
Bula o güşaddin xilasi.
Demə ki, bu mədh biməhəldür,
Sikkə zərə axirin əməldür.
Çün sikkələnə bu nəqşsiz zər,
Zərri-fələgə ola bərabər,
Aça rüxi-xəlqə feyzidin bab,
Xurşid sifət ola cəhantab.
Bağludur ümid oxuna bu fərd,
Yetürmiyə dəsti-rədd ona dərd.
Qəm çəkmə gəl, ey Məsihiyi-zar,
Bu fikrətə olmagil kiriftar.
Bu lazimədür ki, hüsni-şahid,
Bazarını qoymaz ola kasid.
Kim qapu açub girir bu bağə,
Bülbülnü fəda edər bu zağə.
Həqqa ki, degil bu söz nihani,
Var zadeyi-təbinin o şani,

Hər məclisə girsə ol giranqədr,
Nikü bəd əgər anındurur sədr.
Dur tapşurgil ani xudayə,
Ta nəqs yetişməsin ol ayə.
Məhfuz olsun o çeşmi-bəddən,
Salim qəmu dideyi-həsəddən.
Hasid ki, həmişə eybbindür,
Ömr ilə ona hünər həmindür.
Bəd hamildür müdam o bədbin,
Bəd qılmış ani məhəlli-nifrin.
Nifrində bizə yox ehtiyaci,
Bu sövqidə var anın rəvaci.
Gül qıldı bu bağ içində xari.
Səd şükr yetişdi ovni-bari,
Min otuzü səkkiz idi təhqiq,
Tarix müsaid oldu tovfiq.
Əncamə irişdi bu rəvayət
İtmamə yetişdi bu hekayət,
Amma bilürəm bu qəzlbafi[1],
Salmaz mənə sayeyi-məafi.
Bafəndeyi-kargahi-diba,
Anlar ki, degil bu nəqş ziba.
Gördükdə bu surəti-pəlasım,
Var əhli-hünərdin iltimasım,
Qoymaya durub o nəqşə əngüşt,
Salmıya o tərhə sayeyi-püşt.
Açub oxuduqda bu kitabi.
Tə'n eyləyənin budur cavabi:
Kim mə'dəni-dəhrə bir degil kan,
Bə'zi xəzəf oldu, bə'zi mərcan.
Öz tərzinə dü kişi gəlugir
Adəmlərə tərz bir degil bir,
Tə'n eyləməgə degil səzavar,

[1] *Qəzlbafi* – keçi tükündən parça toxuma

Gər gəlsə birinə ariyət ar,
Sevməz, qılməz bu xasiyyətni,
Ar əhli qəbuli-ariyətni.
Var qailinə rücui-tavan
Bu tərzdə gər görünsə nöqsan,
Rəhmət ona kim acanda didə,
Xatir durub etmiyə rəmidə.
Sala ona pərtovi-əsasın,
İslah edə səhv ilə xətasın
Bu şivə kimin olursa yari,
Yar ola ona həmişə bari.

*Sənəyi – 1055 hicri*

# İZAHLAR VƏ QEYDLƏR

**Adəm** – dini rəvayətə görə, insanların ilk ulu babası və peyğəmbəridir. Allah Adəmi yaratdıqdan sonra mələkələrə ona itaət etməyi əmr edir. İblisdən başqa hamı Adəmə səcdə edir. İblis özünün atəşdən, Adəmin isə torpaqdan yarandığını bəhanə gətirərək, ona boyun əymir. Allahın qəzəbinə gələn İblis, mələkəlik sifətindən çıxarılır. Allah Adəmin əyəsindən Həvvanı yaradaraq, onları cənnətə göndərir və cənnətdə buğdadan başqa, bütün ağacların meyvəsini yeməyi onlara icazə verir. İblis cənnətə girib, Adəmdən qisas almaq istəyir, lakin cənnətin bağçası rizvan ona mane olur. O vaxt cənnətin qapıçılarından olan İlan İblislə dostluq edirdi. İblis İlanın ağzına girərək, cənnətə gedə bilir. İlan o zamanlar gözəl olub, özünün də dörd ayağı var idi. İblis cənnətdə Adəmi aldadaraq, onu inandırır ki, cənnətdə bir ağac var, kim onun meyvəsindən yesə, burada həmişəlik qalacaqdır. Əvvəl Həvva, sonra isə Adəm buğda ağacından meyvə yeyir və yeyən kimi də çılpaq qalır və incir yarpaqları ilə bədənlərini örtürlər. Allah İblisin icazəsiz cənnətə girməsinə bais olan İlanın ayaqlarını kəsərək, qarnı üstə süründürür və onların dördünü də cənnətdən qovur. Adəmi Hindistana Sərəndib dağına, Həvvanı Cəddəyə, İblisi İbleyə, İlanı da İsfana göndərir.

**Asəf** – dini əfsanəyə görə, Asəf bin Bərxiya peyğəmbər və hökmdar olan Süleymanın ağıllı, tədbirli, uzaqgörən bir vəziri olmuşdur. Klassik şeirdə asəfi-dövran, asəfi-zəmanə dedikdə bu keyfiyyətlərə malik şəxslər nəzərdə tutulur. Məsihi də, poemada Səlim şahın vəziri və ordu başçısını Asəfə bənzətmişdir.

**Babil** – Qədim Babilistan dövlətinin mərkəzi olub, Gəldanilər tərəfindən əsası qoyulmuşdur. Fərat çayının sahillərində yerləşən bu abad, gözəl şəhər müharibələr nəticəsində dağıdılmış, haqqında yalnız rəvayətlər qalmışdır.

**Bəhram** – Bu adla tarixdə İranın altı padşahı yaşamışdır. Bunların içərisində Bəhram Gur haqqında qədimdən Yaxın Şərqdə bir sıra rəvayətlər yayılmışdır. Dahi Azərbaycan şairi Nizami Gəncəvi də həmin el rəvayətlərindən əsərlərində istifadə etmişdir. Orta əsrlər ədəbiyyatında Bəhram igidlik, cəsurluq timsalında, bəzi nağıl və dastanlarında isə şər qüvvəsi kimi göstərilir.

**Bijən** – Firdovsinin “Şahnamə” əsərinin qəhrəmanlarındandır. Turan hökmdarı Əfrasiyabın qızı Mənijəyə aşiq olmuş və öz növbəsində Mənijə də onu sevərək, atasından gizlin sarayda gizlədib saxlamışdır. Lakin Əfrasiyab bundan xəbər tutmuş və Bijəni quyuya salaraq, yeddi il orada saxlamışdır. Rüstəm Bijəni xilas etmək məqsədi ilə Turana gedərək, Mənijənin köməyi ilə onu əsirlikdən qurtarmışdır.

**Bilqeys** – dini rəvayətə görə, Səba ölkəsinin hökmdarı, həmirilər sülaləsinə mənsub bir mələkə olmuşdur. Pəvayətə görə, Süleyman peyğəmbər bir gün Səba ölkəsinə gəlib çıxır. O, quşu hüdhüd (şanabubu) vasitəsilə Bilqeys haqqında xəbər tutur. Süleyman peyğəmbər ona məktub yazaraq öz dininə gətirdir və sonra isə onunla evlənir. Bilqeys ilə əlaqədar çoxlu rəvayətlər vardır. Klassik ədəbiyyatda Bilqeys ağıllı, nəcib bir qadın rəmzi kimi işlənir.

**Boqrat** – Miladdan əvvəl V əsrdə Yunanıstanda yaşamış məşhur bir təbib olmuşdur. O, tibb elminin banisi sayılır. Uzun Müddət Şərq və Qərb ölkələrində istifadə olunan əsərləri tibbə dair yazmış dəyərli tədqiqat işi kimi yüksək qiymətləndirilmişdir.

**Dara** – İranın qədim Kəyanilər sülaləsinin son hökmdarlarındandır. Yeni eradan əvvəl IV əsrdə yaşamış, İskəndər ilə müharibədə öldürülmüşdür.

**Əbri-neysan** – neysan yağışıdır. Guya bu yağışla sədəfdə inci hasil olduğu kimi, ilanın ağzına düşəndə də zəhər əmələ gəlir.

**Əflatun** – (e. ə. 428-348) antik dövr yunan alimlərindəndir, idealizmin banisi hesab olunur. Məşhur alim Sokratın şagirdi olan Əflatun elmi-fəlsəfi əsərləri olan “Qanunlar”, “Dövlət” və s. ilə şöhrət tapmışdır.

**Əfrasiyab** – rəvayətə görə, tarixi-əfsanəvi bir şəxsiyyət olmuş, daha qədimlərdə Alp Ər Tunqa adı ilə tanınmışdır. İlk türk dastan qəhrəmanı olan Alp Ər Tunqa miladdan əvvəl yaşamış, dəfələrlə böyük bahadırlıqlar göstərərək, İran ordularını məğlubiyyətə uğratmışdır. Tarixi mənbələr göstərir ki, qədim Göytürk, Uyğur və Qaraxanilər kimi böyük türk dövlətlərini quran hökmdarlar özlərini Alp Ər Tunqanın nəslindən bilib, onu özlərinin ulu babaları saymışlar. İlk türk bahadırlarının ölümü münasibəti ilə yazılmış bir mərsiyə XI əsrə qədər gəlib çatmışdır.

Alp Ər Tunqaya aid rəvayətlər Firdovsinin “Şahnamə”sində də verilmişdir. Firdovsi onu Əfrasiyab kimi verir. XI əsrin görkəmli alimlərindən Mahmud Kaşqarlının “Divani-lüğətüt-türk”ündə, Balasaqunlu Yusifin “Kutadqu bilik”də verdikləri məlumata görə, X-XI əsrlərdə Alp Ər Tunqa İranda Əfrasiyab kimi tanınırmış. Heç şübhəsiz, Firdovsi də Saqa-türk bahadırı haqqında ilk məlumatını türk xalq ədəbiyyatından almışdır. Belə ki, Firdovsi böyük türk dövləti sayılan Qəznəvilər mühitində yaşamış, “Şahnamə”ni də məşhur dövlət xadimi Sultan Mahmud Səbüktəkinin sifarişilə yazmışdır. Tarixi mənbələrdən də, bu dövrdə türkcə yazıb-yaratmağa xüsusi əhəmiyyət verildiyi məlumdur.

**Əhrimən** – Qədim mifik görüşlərə görə Əhrimən şər allahıdır. Qaranlıq gecələr də ona tabe imiş. Xeyir allahı Hörmüzd Əhrimənlə daima mübarizə aparmış və xeyirlə şər də elə buradan meydana gəlmişdir. Qədim xalq etiqadına görə, guya Hörmüzd bir gün Əhrimənə qalib gələcək və bununla da

dünyada şər əbədilik yox olacaqdır. Yalnız bundan sonra insanlar xoşbəxt, firavan yaşayacaq, hər cür pis əməllərdən əl çəkəcəklər. Məsihi, insanların xoşbəxtliklərinə mane olan, onların səadətlərini əlindən alan zalım, qaniçən qüvvələri Əhrimən adlandırır.

**Ənqa** – Qaf dağında yaşaması ehtimal olunan əfsanəvi bir quşdur. Guya tükləri zərif, boynu uzun, üzü insan üzünə bənzəyən və hər heyvandan bir əlaməti olan bir quşdur. Olduğu yerdə quşları ovlayıb, qərbə doğru uçarmış. Buna görə Ənqa quşuna "Ənqayi-məğrib" də deyərmişlər. Bu quş uçduğu yerdə nə qədər heyvan, quş varsa, hamısını ovlayar, heyvan olmadıqda isə uşaqları aparırmış. Buna görə də, xalq peyğəmbərə şikayət etmiş və Ənqa quşu ildırımla öldürülmüş və bütün nəsli kəsilmişdir. Nəqaya Sirəng və Simurq da deyilir.

**Ərəstu** – (e. ə. 384-322) Qədim yunan filosofudur. O, məşhur yunan sərkərdəsi İskəndərin müəllimi olmuş, zəmanəsinin əsas elmlərini dərindən öyrənmiş, bir sıra qiymətli əsərlər yazmışdır. Marks Ərəstunu "Antik dünyanın Hegeli" adlandırmış, Engels isə onu dialektik təfəkkürün bir sıra formalarını məharətlə öyrənməsini xüsusi ilə qeyd etmişdir.

**Gavə** – Yaxın Şərq xalqlarının ədəbiyyatında əfsanəvi bir ahəngər-dəmirçi təxəllüsü ilə məşhurdur. Çox zalım bir padşah olan Zöhhakın əleyhinə üsyan qaldırmış və onu taxtdan salaraq, Cəmşidin nəvəsi Firidunun şahlığa keçməsinə kömək etmişdir. Gavənin bayrağı – orta əsrlər şerində azadlıq, qurtuluş rəmzi kimi səslənir.

**Harut və Marut** – dini əsatirə görə, guya mələkələr insanların çox günah etməsi və pozğunluqları haqqında Allaha şikayət etmişlər. Allah da onlara buyurmuşdur ki, insanlarda olan nəfs, təbiət, hava və həvəs sizdə olsaydı, siz də günah işlər görərdiniz. Mələkələr etiraz edir və heç zaman günah işlər görməyəcəklərini, yoldan çıxmayacaqlarını söyləyirlər. Allahın əmri ilə mələkələrdən ən etibarlısı olan Harut və Marut Babilə göndərilir. Onlar da insanlar arasında uzun müddət ədalətlə çalışır, məhkəmə işlərində heç bir haqsızlıqlara yol vermirlər. Günlərin bir günündə onların yanına Zöhrə adlı çox gözəl bir qadın gəlir və ərindən boşanmaq istəyir. Harut ilə Marut ona aşiq olur. Qadın isə yalnız boşandıqdan sonra onların sözünə əməl edəcəyini bildirir. Lakin qadın boşanandan sonra da onların arzusuna əməl etmir. Bu dəfə qadın Harut ilə Maruta şərab içməyi, butə tapmalarını təklif edir. Onlar da bunula razılaşır. Qadın onlardan axşamlar göyə çəkilmək üçün oxuduqları duanı öyrənmək istəyir. Onlar duanı da deyir və qadın bu duanı oxuyaraq göyə çəkilir. Guya Allah onu göydə bir ulduza çevirir. Harut ilə Marutu isə öz vəzifələrinə xəyanət etdikləri üçün Babil quyusunda başıaşağı asmaqla cəzalandırır.

**Hatəm** – VI-VII əsrlərdə ərəblərdə qəbilə başçısı və şair kimi məşhur olmuşdur. O, öz səxavəti ilə dillərə düşmüş, haqqında bir sıra rəvayətlər meydana gəlmişdir. Hatəm-Tainin adı klassik Şərq ədəbiyyatında, səxavət, əliaçıqlıq rəmzi kimi işlənmişdir.

**Həsən** – Əlinin böyük oğlu, şiələrin ikinci imamıdır.

**Hüma** – əfsanəyə görə, dövlət quşudur. Bu quş çox yüksək uçarmış. Uçduğu zaman kölgəsi kimin başına düşərsə, o adam padşah olarmış.

**Xızr** – dini əfsanəyə görə, peyğəmbər olmuşdur. Guya İskəndər Zülqərneynlə zülmata getmiş, dirilik suyundan (abi-həyat) içərək həmişəlik sağ qalmışdır. İskəndər isə zülmatda azaraq, bu suyu tapa bilməmişdir. Azərbaycan klassik ədəbiyyatında həyat, dirilik timsalı olan Xızr, nağıl və dastanlarda Xıdır Nəbi, Xıdır İlyas adı ilə də tanınır. Başqa bir dini rəvayətdə isə göstərilir ki, İlyas yaşadığı şəhərdən çxır, Allahın əmri ilə atəşdən olan bir ata minərək, gözdən itir. Allah ona qiyamət gününə qədər ömür verərək, dənizləri də ixtiyarına verir.

**Xosrov** – İranın Sasanilər sülaləsinin hökmdarlarındandır. Ədaləti ilə məşhur olan Hürmüzün oğlu, Nuşirəvan Adilin isə nəvəsidir. Nizami "Xosrov və Şirin" poemasında Xosrovun Arran gözəli Şirinlə eşq macəralarını təsvir etmişdir.

**İsa** – dini təsəvvürə görə, xristianların peyğəmbəridir. Cəbrayıl Allahın ruhunu Məryəmin burnuna üfləməklə İsa dünyaya gəlmişdir. İsa illərlə insanları imana gətirməyə çalışmışdır. Bəni İsrail qəbiləsi toplaşıb, onu öldürməyə çalışmışdır. Qaçıb bir evdə gizlənən İsanı tapmış və bir neçə iplə ağaca bağlamışdır. Mələkələr Allahın əmri ilə göydən yerə enib, İsanı göyün yeddinci qatına qaldırmışlar.

**İskəndər** – (e. ə. 356-323) İskəndər Zülqərneyi, İskəndər Kəbir, İskəndər Rumi, Makedoniyalı İskəndər də adlandırılır. O, Makedoniya hökmdarı Filippin oğludur. İskəndər tarixdə fəthləri ilə məşhurdur. İranı, İraqı, Hindistanı, Misiri, Çini və s. ölkələri tutaraq, qüvvətli dövlət yaratmışdır.

**İsrafil** – dini əsatirə görə, İsrafil guya həyatın yaranması və məhv olmasını xəbər verəcək, qiyamət günü şeypurunu çalaraq, bütün ölüləri diriləcəkdir.

**Keyxosrov** – Kəyanilər sülaləsinin üçüncü padşahıdır. Firdovsi "Şahnamə"də onu Səyavuşun oğlu Keykavusun nəvəsi kimi göstərir. Ögey anası Səyavuşa böhtan atdığına görə o, atasının yanından Turana qaçaraq, burada Əfrasiyabın qızı Firəngizlə evlənmişdir. Lakin Səyavuş Turanda da yeni böhtana məruz qalmışdır. Firəngiz Səyavuşdan Keyxosrovu doğduqdan sonra Əfrasiyab uşağı öldürmək istədiyindən çobanlar uşağı aparıb böyütmüşlər. Sonralar iranlılar bundan xəbər tutaraq, Keyxosrovu İrana aparmış və babası onu şahlıq taxtına çıxarmışdır.

**Qaf** – nağıllarda əfsanəvi simurq quşunun yaşadığı ehtimal olunan dağın adıdır. Qafqaz dağlarının adının da buradan götürülməsi ehtimal olunur.

**Qarun** – rəvayətə görə, mal-dövlətinin sayı-hesabı olmayan, lakin olduqca xəsis bir adam olmuşdur. Yəhudilərin peyğəmbəri Musa ilə bir dövrdə yaşaması, habelə onunla düşmən olması ehtimal olunur. Guya əvvəl çox yoxsul bir adam olan Qarun sonralar Musanın köməyi ilə kimya elmini öyrənmiş və bu yol ilə də çoxlu sərvət əldə etmişdir. Ancaq Musanın təklifi ilə öz dövlətindən müəyyən hissə xalqa vermədiyindən, sərvəti ilə birlikdə diri-diri yerə batmışdır.

**Loqman** – rəvayətə görə, əfsanəvi bir həkim və filosof olmuş, islamiyyətdən çox əvvəllər yaşamışdır. Quranda da onun adı çəkilmişdir.

**Musa** – yəhudi peyğəmbərlərindəndir. Dini təsəvvürə görə, Guya allahlıq iddiasına düşən hökmdar firon Musa peyğəmbərə qarşı çıxır. Musa isə onun qarşısında möcüzə göstərib, öz əsasını ilana döndərir. Misirdə peyğəmbərliyə çatdıqdan sonra onun dinini qəbul etməyən fironu bütün qoşunu ilə dənizdə batırmış, özü isə Tur dağına çəkilmişdir. Guya Musa Tur dağında Allahla danışırmış.

**Nərgiz** – bir çiçək adıdır. Guya bu çiçəyin timsalı olan Nərsis yaxud Nərgiz bir pərinin çox sevdiyi oğlan imiş. Bütün qızlar Nərgizin eşqi ilə divanə olur. Yalnız insanlar deyil, pərilər də onun gözəlliyinə heyran qalır. Lakin Nərgiz bunların heç birinə iltifat göstərmir. Eko adlı bir pəri Nərgizin eşqindən həlak olaraq, daşa çevrilir, ondan yalnız birsəda qalır. Rəvayətə görə, bir gün irmaqdan su içən Nərgiz, suda əksini görür və öz gözəlliyinə heyran olaraq nə edəcəyini bilmir. Suya atılıb öz əksini qucaqlamaq istərkən boğulur. Eko Nərgizin eşqi ilə daşa döndüyü kimi, Nərgiz də öz adı ilə anılan çiçəyə çevrilir. Guya, buna görə də Nərgiz çiçəyinin məstedici, uyuducu bir qoxusu varmış.

**Nuh** – dini əfsanəyə görə, Nuhun qohumu ona itaət etmir. O, Allaha üz tutaraq, qohumunun cəzalandırılmasını diləyir. Allah bu asi qohumun tufanda həlak olmasını əmr edir. Nuh Allahın əmri ilə bir gəmi qayırır, özünə iman gətirən 80 nəfər insanı və hər cins heyvandan bir cüt gəmiyə mindirir. Sonra tufan başlanır. Nuhun qohumu da həlak olur. Allahın əmri ilə tufan dayanır, buludlar açılır, sular da çəkilməyə başlayır. Nuhun gəmisi isə Cudi dağının üstündə qərar tutub qalır.

**Rüstəm** – məşhur əfsanəvi bir qəhrəmandır. Firdovsinin "Şahnamə"sində onun cəngavərlikləri təsvir olunur. Klassik ədəbiyyatda Rüstəm bahadırlıq, igidlik timsalı kimi işlənir.

**Səməndər** – əfsanəvi quş adıdır. Rəvayətə görə, gözəl rəngi olan bu quşun kəkilində 360 dəlik var imiş. Yüksək dağların zirvəsində oturar, ruzigara qarşı

bu dəliklərdən səslər çıxararmış. Bu səsləri eşidən quşlar onun ətrafına toplaşar və o da bunları tutub yeyərmiş. Min ilə qədər yaşayan Səməndər quşu, öləcəyinə yaxın çıl-çırpı toplayıb üzərində oturar və həzin-həzin oxuyarmış. Sonra qanadlarını şiddətlə çırparaq çıxardığı qığılcımı ilə çıl-çırpını alışdırar və bu surətlə yanıb gedərmiş. Onun külündən bir yumurta hasil olar, içindən də özü kimi bir quş balası çıxarmış. Bəzi rəvayətlərə görə, musiqi səməndərin çıxardığı səslərdən alınmışdır.

**Səncər** – türk-səlcuq dövlətinin altıncı hökmdarıdır.

**Süleyman** – Yəhudilərin qədim peyğəmbəri və padşahının adıdır. Guya Süleyman bütün quşların, heyvanların, balıqların dilini bilir, külək də onun ixtiyarına tabe imiş. Dini rəvayətə görə, Süleyman bir gün öz adamları ilə yol gedərkən, qarınca sürüsünə rast gəlir. Onların bəyi qarıncalara xəbər verir ki, yuvanıza girin, yoxsa Süleymanın əsgərləri sizi çeynəyəcəkdir. Süleyman bu sözü eşidərkən gülür, bəyi yanına çağırır. Bəy bir çəyirtgə budu hədiyyə gətirir, Süleymana ağıllı nəsihətlər verir, Süleymanın duası ilə bud böyüyür, bütün əsgərlər ondan yeyib doyur, artığını isə bəy aparır.

Başqa bir rəvayətdə isə deyilir ki, Süleymanın əfsanəvi bir üzüyü varmış, onun vasitəsilə də bütün dünyanı idarə edərmiş.

**Süheyl** – rəvayətə görə, elə bir ulduzdur ki, doğan zaman Yəməndə çıxan əqiq daşı rəngini ondan alır.

**Şahi-Mərdan** – Əlinin ləqəblərindən biridir.

**Şirin** – Xosrov Pərviz və Fərhadın sevgilisidir. Nizami "Xosrov və Şirin"də misilsiz gözəlliyə, yüksək mənəviyyata və iradəyə malik olan bu türk gözəlinin ölməz surətini yaratmışdır.

**Yə'cuc-Mə'cuc** – rəvayətə görə, Asiyanın şimalında Çin sərhədində yaşayan iki tayfa olmuşdur. Boyları bir qarış, qulaqları boyları qədər uzun, üzləri qıllı imiş, yaz vaxtında ilan, qışda isə ot yeyərmişlər. Onlar daima qarətlə məşğul olar, qonşu xalqlara ziyan vurarmışlar, Qonşu xalqlar İskəndər Zülqərneynə müraciət etmiş, İskəndər də bu xalqları Yəcuc-Məcuclardan qorumaq üçün "Səddi-İskəndər"i çəkdirmişdir.

**Yə'qub** – Yəhudilərin peyğəmbəri, İbrahim Xəlil peyğəmbərin nəvəsidir. Rəvayətə görə, Yəqubun on iki uşağı olmuş və onların da içərisində ən kiçik oğlu Yusifi hamıdan artıq sevərmiş. Son dərəcə gözəl, ağıllı olan Yusifə qardaşları paxıllıq edərək, aparıb onu quyuya atmış, "Yusifi qurd yedi" – deyərək atalarını aldatmışlar. Misir tacirləri Yusifi quyudan çıxararaq, aparıb qul bazarında satmışlar. Misir hökmdarı Yusifi qul bazarından satın alır və arvadı Züleyxa da ona aşiq olur, Yusif, Züleyxanı rədd etdiyindən

böhtanlarına məruz qalır, yeddi il zindanda qalır. Yəqubun gözləri ağlamaqdan kor olur və uzun həsrətdən sonra oğlu ilə görüşür. Yaxın Şərq şairlərindən Firdovsi, Əli, Cami, Lütfəli bəy Azər və başqa şairlər bu mövzuda poemalar yazmışlar. Klassik poeziyada Yəqub həsrət, intizar, Yusif isə gözəllik, nəcib-lik rəmzi kimi işlənmişdir.

**Yunis** – dini əsatirə görə, qədim yəhudi peyğəmbərlərindəndir. Guya, Yunis özündən mö'cüzələr uydurarmış. Bir gün mö'cüzəsi yalana çıxdığından gəmiyə minmiş, lakin günahkar olduğu üçün gəmi onu aparmamışdır. Yunisi tutub suya atmışlar. Bir köpək balıq onu udmuşdur. Balığın qarnında tövbə duası oxumuş və duası qəbul olunduğundan balıq onu sahilə buraxmışdır.

**Zal** – Qədim mifik pəhləvanlardan Samın oğlu, Rüstəmin atasıdır. Rəva-yətə görə, Zal anadan olanda saçı ağ, sifəti mis rəngində imiş. Atası bunu fə-lakət əlaməti sayaraq doğma övladından üz döndərir. Körpəni aparıb uca bir dağ döşünə atırlar. Guya simurq quşu uşağı tapıb yuvasına aparmış, onu öz balası kimi bəsləyib böyütmüşdür. Zal böyüdükdən sonra karvanlar kəsərək, qarət-çiliklə məşğul olmuş, nəhayət, tutularaq yenidən insanlar arasına gətirilmişdir.

# LÜĞƏT

## A

*Ab* – su.
*Abi* – heyvan – dirilik suyu.
*Abi-həyat* – dirilik suyu.
*Abkəm* – lal.
*Abnus* – qarağac.
*Abü tab* – təmtəraq, dəbdəbə.
*Abyar* – suçu, sulayıcı, yardım, imdad.
*Ac* – fil dişi, şirmayı.
*Afaq* – üfüqlər, aləm, dünya.
*Afat* – bədbəxtliklər, müsibətlər.
*Afəriniş* – yaradılış, xilqət.
*Afət* – bəla, müsibət, gözəl, dilbər.
*Afiyət* – can sağlığı, sağlamlıq.
*Aftab* – günəş.
*Agah* – xəbərdar, gözüaçıq, sayıq.
*Al* – nəsil, sülalə, qırmızı.
*Alayiş* – bulaşıqlıq, kirləndirmə.
*Aliqədr* – yüksək dərəcəli, hörmətli.
*Aləməfruz* – aləmi işıqlandıran.
*Aləmsuz* – dünyanı yandıran.
*Amil* – bir sözə, işə əməl edən, səbəb.
*Amm* – kütlə, xalq.
*Arastə* – tərtibə salınmış, bəzənmiş.
*Arayiş* – bəzək, zinət.
*Ariyət* – burovuz, müvəqqəti olan.
*Ariz* – yanaq, şikayətçi, sonradan əmələ gələn.
*Asa* – dinc, rahat.
*Aşiyan* – yuva, məskən.
*Aşüftə* – həyəcanlı, qarmaqarışıq.
*Atəşbar* – od yağdıran, hərarətli.
*Ayaq* – cam, şərab camı.
*Ayin* – adət, mərasim, məzhəb və din qanunları.

## B

*Bab* – qapı, fəsil, dərgah.
*Bad* – külək.
*Badiyə* – çöl, səhra.
*Badpa* – cəld yeriyən, sürətlə gedən, löhrəm.
*Bah* – şəhvət həvəsi, cinsi əlaqə.
*Bahir* – üstün, gözəl, əla, qəşəng.
*Bak* – qorxu, çəkinmə.
*Baqi* – qalan, daimi, həmişəlik.
*Bal* – qanad.
*Bala* – yuxarı, üst, boy, uca.
*Baliğ* – yetişmiş, həddi-buluğa çatmış.
*Bam* – dam.
*Bang* – səs, haray.
*Banu* – xanım, keçmişdə padşah arvadlarına verilən ad.
*Bar* – yük, tay, meyvə.
*Baran* – yağış.
*Bargah* – saray, dəniz kənarı, sahil.
*Bari* – yaradıcı, yaradan, Allah.
*Barik* – incə, nazik, dar.
*Bariqə* – işıltı, parıltı, şimşək, ildırım.
*Barkeş* – yükdaşıyan, yükçəkən.
*Bavər* – inam, etimad, ağıl kəsmə.
*Baziçə* – oyuncaq.
*Behbud* – sağalma, yaxşılaşma, xəncərin bir növü.
*Behtər* – ən yaxşı, daha yaxşı.
*Bey'* – alma, alış, satma, girov.
*Beyğulə* – mağara, dəlik, deşik.
*Beyn* – ara, orta, an, vaxt.
*Beytülmal* – Dörd xəlifəlik dövründə islam dövləti xəzinəsinə verilən ad, ianə şeylərin saxlandığı yer.

*Bəd* – pis, yaman.
*Bə'd* – sonra
*Bədəl* – əvəz, bir şeyi dəyişmə, dini rəvayətə görə Əzraili aldatmaq üçün, uşağın dəmir və palçıqdan düzəldilmiş heykəli.
*Bədəndiş* – pis fikirli, pis düşünən.
*Bədgu* – pisliyə danışan, qiybətçi, iftiraçı.
*Bədxah* – başqasının pisliyini istəyən.
*Bədihə* – fikirləşmədən söylənən gözəl söz, hazırcavablıq.
*Bədnam* – pis ad çıxarmış, adı pisliyə çıxmış.
*Bədnijad* – bədəsl, alçaq, rəzil.
*Bədr* – on dörd gecəlik ay bütöv ay.
*Bədrud* – vidalaşmaq, ayrılıq.
*Bədsərəncam* – bədbəxt, aqibəti pis.
*Bəhcət* – şadlıq, sevinc, gözəllik.
*Bəhram* – Mərrix, Mars.
*Bəid* – uzaq, yad, qəribə.
*Bəir* – dəvə.
*Bəkarət* – qızlıq, bakirəlik, saflıq, təmizlik.
*Bəqa* – daimi, həmişəlik.
*Bəlakeş* – bəla çəkən, başıbəlalı.
*Bər* – yan, kənar, qapı, köks, döş sinə.
*Bərat* – qiymətli şey, təhvil kağızı, İslam dininə görə, Məhəmmədə peyğəmbərlik xəbərinin verilməsi, Məhəmmədin qızı Fatimənin toyu, şiələrin on ikinci imamı Mehdinin anadan olan günü.
*Bərd* – soyuq, soyuqluq, daş.
*Bərg* – yarpaq, vərəq.
*Bərid* – qasid, çapar.
*Bərq* – şimşək, ildırım, parıltı.
*Bəs* – kafi, kifayət qədər.
*Bəsər* – görmə, göz.
*Bəsi* – çox, çoxluq.
*Bəstə* – bağlı, asılı.
*Bəşarət* – şad xəbər, muştuluq.
*Bəzaət* – sərmayə, maya, qiymət, baha, sərvət.
*Bəzl* – bağışlama, bol-bol sərf etmə.
*Bəzm* – məclis.
*Bəzr* – dən, toyum.
*Bidad* – ədalətsiz, ədliyyəsiz.
*Bihəmdüllah* – Allaha şükr, Allahın həmdi ilə.
*Bixud* – özünü itirmiş, ixtiyarsız.
*Bikr* – bakirə qız, ərə getməmiş qız, bütün.
*Bilfərz* – güman edilmək, ehtimal etmək.
*Bilkülliyyə* – büsbütün, bütünlüklə, hamılıqla.
*Bim* – qorxu, vahimə.
*Bimar* – məhəbbətsiz, mehrsiz.
*Bimehr* – xəstə, naxoş.
*Binəva* – yazıq, zavallı, kasıb, əlsiz-ayaqsız.
*Biniş* – görüş, baxış.
*Bipərva* – cəsur, qoçaq, qorxu bilməyən.
*Bipərü bal* – asılı, işdə sərbəst olmayan.
*Birun* – bayır, qonaq evi, evin kişilərə aid hissəsi.
*Biş* – artıq, çox, zəhərli bir bitki adı.
*Bivə* – dul.
*Boz* – keçi.

*Buf* – bayquş, yapalaq.
*Buqrat* – məşhur yunan alimi Hippokratın adı.
*Buy* – iy, qoxu.
*Büqa'* – ölkələr.
*Büq'ə* – ölkə, torpaq, xalq.
*Büğz* – kin, ədalət.
*Bülənd* – yüksək, uca.
*Büləndpayə* – çox hörmətli, yüksək mənsəbli.
*Bün* – bünövrə, təməl, dib, alt, son.
*Bünyan* – bina, özül, başlanğıc.
*Bünyə* – bədənin təbii halı.
*Bürc* – tək qala, qüllə, göydə günəş dairəsinin bölünmüş on iki qismin hər biri.
*Bürqə* – üz örtüyü, rübənd, niqab.
*Bürəhnə* – lüt, çılpaq.
*Bürhan* – dəlil, sübut, isbat.
*Büstan* – bostan, bağ, güllük.
*Büt* – gözəl, sənəm, bütpərəstlərin ibadət etdikləri rəsm və ya heykəl.
*Büzürg* – böyük.
*Büzürgvar* – böyük mərtəbəli, yüksək mövqe tutmuş.

## C

*Cahandar* – hökmdar.
*Caizə* – bəxşiş, mükafat.
*Camə* – paltar.
*Cangah* – ürək, qəlb.
*Cansuz* – qəlbi yandıran, ürəyə təsir edən.
*Cavid* – əbədi, daimi.
*Caygah* – məkan, yer.
*Ceyş* – qoşun, ordu.
*Cəbin* – alın.
*Cədəl* – qalmaqal, çəkişmə, savaşma.
*Cəhansuz* – dünyanı yandıran, zalim, qəddar.
*Cəladət* – bahadırlıq, igidlik.
*Cəlis* – yoldaş, birlikdə oturan.
*Cəll* – saxta, düzəltmə.
*Cəvv* – boşluq, göy, fəza.
*Cəmmazə* – iti gedən dəvə.
*Cəng* – döyüş, dava, müharibə.
*Cənnətməkan* – behiştlik, cənnətlik.
*Cərahət* – cərrahlıq, yara.
*Cərəs* – zəng, zınqırov.
*Cəstə* – atılmış, sıçramış.
*Cəşn* – qonaqlıq məclisi, şənlik məclisi.
*Cəzm* – qət etmə, qəti surətdə qərara alma.
*Cida* – süngü, mizraq.
*Cidal* – dava, döyüş, qalmaqal.
*Cigərsuz* – ürək yandıran, yanıqlı.
*Cinah* – qol, ordunun sağ və sol tərəfi, cinah.
*Civar* – yaxın yer, ətraf.
*Cövdət* – yaxşılıq, nöqsansızlıq, üstünlük.
*Cövşən* – zireh.
*Cövşənpuş* – zirehli, zireh geymiş.
*Cu* – axtaran, araşdıran.
*Cud* – əliaçıq.
*Cuş* – qaynama, coşma.
*Cübbə* – uzun ətəkli üst paltarı.
*Cüda* – ayrı, ayrı düşmüş.
*Cül* – çul.

## Ç

*Çah* – quyu.

*Çalak* – cəld, çevik, tələsik.

*Çaliş* – həyəcan, təşviş.

*Çapuk* – cəld, yeyin, iti.

*Çar* – dörd, dörd ünsür (torpaq, su, hava, od).

*Çaşni* – ləzzət, dad.

*Çaşnigir* – hökmdarların yeməklərini qabaqca dadan və bununla yeməyin zərərsiz olduğunu müəyyənləşdirən adam.

*Çeşm* – göz.

*Çənd* – neçə, neçə dənə.

*Çəngal* – ağac və ya dəmir halqa, pəncə, caynaq.

*Çiz* – şey.

*Çovgan* – keçmişdə atla oynanılan top oyunu.

*Çub* – ağac.

*Çü* – indi ki, təki, tək, kimi.

*Çün* – necə ki, elə ki.

## D

*Dad* – ədalət, insaf, aman, yardıma çağırma.

*Dadgər* – adil, ədalətli, hakim.

*Dai* – dua edən, duaçı, səbəb, bais, arzu, dilək.

*Dam* – tor, cələ, həbsxana.

*Damən* – ətək.

*Dana* – bilici, alim

*Daniş* – bilik, elm.

*Daru* – dərman, dava.

*Darülxülud* – həmişəlik ev, həmişə yaşama evi.

*Deheş* – bəxşiş, hədiyyə, səxavətlik.

*Dengel* – cəmiyyət, bir yerə yığılıb üz-üzə oturan adamlar.

*Dey* – qış ayı, əsatirə görə, soyuğa nəzarət edən mələyin adı.

*Dəğa* – hiylə, xəbislik.

*Dəğdəğə* – səs-küy – vəlvələ.

*Dəd* – yırtıcı, heyvan, ovlaq.

*Dəhr* – zaman, dövr, fələk, tale.

*Dəm* – nəfəs, nəfəs çəkmə, zaman, an.

*Dəni* – alçaq, rəzil.

*Dəray* – zəng, zınqırov.

*Dərbar* – padşahın sarayı, qəbul salonu.

*Dərgah* – qapı önü, qapı, saray.

*Dəridə* – yırtılmış, yırtıq.

*Dəsisə* – hiylə, biclik.

*Dəst* – əl.

*Dəstbürd* – qarət, qələbə, cəldlik, çeviklik.

*Dəvlan* – qaçan, yüyürən.

*Dəycur* – çox qaranlıq gecə.

*Dəyyar* – rahib, sakin, yaşayan.

*Diba* – çiçəkli, bəzəkli, ipək.

*Didəban* – gözətçi, qarovul, növbətçi.

*Difa'* – düşmən hücumunu dəf etmə, müdafiə.

*Dig* – qazan.

*Dij* – qala.

*Dil* – ürək, qəlb, zövq, həvəs.

*Dilduz* – qəm gətirən, ürək deşən.

*Dilfigar* – ürəyi sınmış, ürəyi yaralı.

*Dilxəraş* – ürək parçalayan, faciəli.

*Dilxun* – ürəyi qana dönmüş, qüssəli, qəmli.
*Dilir* – igid, şücaətli, bahadır.
*Dilkeş* – ürəkçəkən, könül cəlb edən.
*Dilşikəstə* – könlüqırıq, qəlbisınıq.
*Dingil* – ox mili, civ.
*Dir* – gec, vaxtı keçmiş.
*Dirəxt* – ağac.
*Dirəng* – aram tapma, istirahət.
*Dov* – qaçış, oyunda qarşıdakı oyunçunu şirnikləndirmək üçün deyilən söz.
*Dud* – tüstü.
*Duk* – iz, ox, mil.
*Dur* – uzaq.
*Duz* – yandıran, yandırıcı.
*Duzəx* – cəhənnəm.
*Dübd* – oğru.
*Düdəmə* – ikibaşlı, hər iki tərəfi iti olan qılınc və s.
*Dühul* – təbil.
*Düxtər* – qız.
*Düngül* – fincan, kasa.
*Düruğ* – yalan.
*Düşvar* – çətin.

**E**

*Ehsas* – hiss etmə, sezmə.
*Ehteraz* – ehtiyat, ehtiyatlıq.
*Ehtiva* – içərisinə alma, qavrama, əhatə etmə.
*Ehzar* – hüzura gətirtmə, çağırma.
*Ematə* – öldürmə, keyləşdirmə.
*Enfesal* – uzaqlaşdırma, ayırmaq, çıxarmaq.
*Erteaş* – tutulma, ürpəşmə, qıc olma.
*Ertecac* – diksinmə, titrəmə, lərzə.
*Ertefa* – hündürlük, ucalıq.
*E'tezar* – bağışlamaq, təqsirindən keçmə.
*E'tikaf* – guşənişin olma, yalqızlıqda yaşama.
*Etteba* – izləmək, itaət etmə, təqib etmə.
*Ettesali* – daimi, həmişəlik.
*Eyd* – bayram.
*Eymən* – uğurlu, xoşbəxt, qorxusuz (yer və s.).
*Eyn* – göz, çeşmə, bulaq , bir şeyə çox bənzəyən.
*Eynəlyəqin* – şübhəsiz, aydın, aşkar, dəqiq bilik.
*Eyş* – yaşayış, kef, eyş-işrət.
*Ezterar* – çıxılmaz vəziyyət, son ehtiyac, qorunmuş.

**Ə**

*Əali* – böyük adamlar.
*Əazim* – böyüklər, əzəmətlilər.
*Əbd* – qul, kölə, məxluq.
*Əbir* – xoş iy, xoş qoxu.
*Əbr* – bulud.
*Əbru* – qaş.
*Əbtal* – qorxmaz adam, igid.
*Əbvab* – qapılar.
*Əcr* – yaxşı bir iş müqabilində verilən şey, qarşılıq.
*Əcrəm* – səyyarələr.
*Ə'da* – düşmənlər.
*Ədim* – heç bir şeyi olmayan, iqtidarsız.

*Ədna* – alçaq, rəzil.
*Ədu* – düşmən.
*Əfxəm* – ən böyük, daha böyük.
*Əfsar* – cilov.
*Əfsər* – tac.
*Əfvah* – şayiə, söz-söhbət, ağızlar.
*Əğlal* – qandal, boyun zənciri.
*Əhqər* – ən həqir.
*Əhşa* – daxili.
*Əhya* – dirilmə, yeniləşmə.
*Əxgər* – odlu kül, kül qarışıq xırda qor.
*Əxzər* – yaşıl.
*Əjdər* – əjdaha.
*Əkabir* – böyüklər, ulular.
*Əktaf* – çiyin, kürək.
*Əqalim* – ölkələr, yerlər, iqlimlər.
*Əqd* – bağlama, qurma, tərtib etmə, nikah.
*Əqdəs* – ən müqəddəs, daha müqəddəs.
*Əqəbnişin* – geriyə çəkilən, arxaya çəkilən.
*Əqran* – tay-tuşlar, ərlər, aşnalar.
*Əqsam* – hissələr, qisimlər.
*Əlaiq* – rabitələr, əlaqələr.
*Əlan* – bu saat, indi.
*Əlbisə* – paltarlar, libaslar.
*Ələf* – quru ot, saman.
*Ələm* – nişanə, işarə, bayraq.
*Əltaf* – lütflər.
*Əm* – əmi, dayı.
*Əmn* – əmin-amanlıq, təhlükəsizlik.
*Əmud* – toppuz, sütun, dirək.
*Ən'am* – hədiyyə, bəxşiş.
*Ənqa* – Qaf dağında yaşayan əfsanəvi bir quş.
*Ənd* – bir neçə, bir qədər.
*Əndaz* – atan, atıcı.
*Ə'ni* – yəni, daha doğrusu.
*Ənis* – yaxın adam, həmdəm.
*Ər* – "əgər"in qısaldılmış forması.
*Ərbədə* – dava, qalmaqal, gurultu-patıltı.
*Ərcümənd* – şərəfli, möhtərəm.
*Ərsə* – geniş düzən, meydan.
*Əruc* – meraca getmə, göyə çıxma.
*Ərus* – gəlin.
*Əsatid* – ustadlar.
*Əsb* – at.
*Əsəl* – bal
*Əsəs* – gecə qarovulçusu.
*Əshab* – sahiblər, tərəfdarlar, müsahiblər.
*Əsvaq* – bazarlar, bazar meydanları
*Əşcar* – ağaclar.
*Əşirə* – qəbilə, oymaq, köçəri tayfa.
*Əşk* – göz yaşı.
*Əşkal* – şəkillər.
*Əvamünnas* – avam camaat, adi xalq kütləsi.
*Əvan* – anlar, çağlar.
*Əyyar* – hiyləgər, kələkbaz, dolandırıcı, bilici, bacarıqlı quldurlar başçısı.
*Əzhər* – aşkar, aydın.
*Əzimət* – əzm, niyyət, tilsim, ovsun.

**F**

*Faqə* – yoxsulluq, fağırlıq.
*Faxir* – gözəl, parlaq, qiymətli.
*Faxtə* – qumru – çöl göyərçini.
*Faiq* – üstün, başqalarından seçilən, əla.

*Fariğ* – asudə, boş, işini qurtarmış.
*Fariğülbal* – ürəyi asudə, qəlbi rahat, qayğısız.
*Fariq* – təfavüt qoyan, ayıran, fərqləndirən.
*Faş* – ifşa olunmuş, açıq, aydın.
*Fazilət* – fəzilət sahibi, fəzilətli, yüksək.
*Feyziyab* – faydalanan, xeyir götürən.
*Fəcr* – erkən, sübh çağı, dan vaxtı.
*Fəəmma* – gəldikdə, qaldı ki.
*Fəğfur* – Çin imperatorlarının titulu.
*Fəxri* – möhtərəm, hörmətli, şərəfli.
*Fəlaxun* – sapand.
*Fərağət* – əl çəkmə, vaz keçmə, boş vaxt, istirahət.
*Fəraidə* – az tapılan, nadir incilər.
*Fəraq* – hicran, ayrılıq.
*Fəramuş* – unutma.
*Fərar* – qaçma, sovuşma.
*Fərcam* – aqibət, son, axır.
*Fərəc* – sevinc, təsəlli, əyləncə.
*Fərəhabad* – fərəh yeri, sevinc yeri.
*Fərqədan* – kiçik ayı bürcünün yanında olan iki parlaq ulduz.
*Fərmandeh* – əmr verən, başçı, komandir.
*Fərzənd* – oğul, övlad, uşaq.
*Figar* – yaralı, əzgin.
*Fiqh* – şəriət məsələlərindən bəhs edən dini elmlərdən.
*Filhal* – indi, bu saat
*Filməsəl* – məsələn, misal üçün, xalq arasında məşhur olan.
*Firdövs* – bağça, cənnət, behişt.
*Firəngi* – avropalılara mənsub.
*Firib* – aldatma, kələk, hiylə.
*Firiştəxu* – mələk xasiyyətli, xoş ədalı.
*Firqət* – ayrılıq.
*Firuz* – taleli, qalib, müzəffər.
*Fitrət* – yaradılmış, xilqət.
*Föhş* – söyüş.
*Fövt* – ölüm.
*Fövc* – dəstə, camaat.
*Fulad* – polad.
*Fülk* – gəmi.
*Füru* – budaqlar, şöbələr.

## G

*Gəbr* – atəşpərəst.
*Gənc* – xəzinə, dəfinə.
*Gər* – “əgər”in qısaldılmış forması.
*Gərd* – toz, torpaq, hüzn, ələm.
*Gərdun* – dolanan, fələk, tale.
*Gərm* – isti, qaynar.
*Gəzaf* – şişirtmə, mübaliğə, mənasız, əsassız.
*Gəzənd* – afət, bəla, zərər.
*Girami* – əziz, istəkli.
*Gireh* – düyün.
*Girehgüşa* – düyün açan, xilaskar.
*Giya* – ot, göy ot.
*Goftgu* – söhbət, danışıq.
*Gun* – rəng, növ, tərz.
*Gusfənd* – qoyun.
*Guş* – qulaq, diqqət.
*Gülbün* – gül ağacı, qızılgül ağacı.
*Gülrux* – gülüzlü, gülyanaq.
*Gülçöhrə* – gülüzlü, qızılgül üzlü.
*Gümrah* – azğın, yol azmış, sağlam.

*Güraz* – qaban, çöl donuzu.
*Gürd* – igid, pəhləvan.
*Gürg* – canavar, qurd.
*Güruh* – camaat, böyük dəstə.
*Gürz* – başı dəmir və ya daşdan olan toppuz.
*Güşad* – açıq, aydın.
*Güşay* – açan, açıcı.
*Güvah* – şahid.

**H**

*Hala* – indi, hələlik.
*Halə* – ayın ətrafında görünən dairə.
*Hamil* – yüklü, daşıyan, götürən.
*Haris* – hifz edən, qoruyan keşikçi.
*Haşəllah* – Allah göstərməsin.
*Hatəm* – Şərq əsatirində çox səxavətli bir adamın adı.
*Helyə* – geyim, bəzək, zinət.
*Heyca* – dava, vuruşma.
*Heyvan* – dirilik, sağlıq.
*Həbib* – dost, sevgili.
*Həcim* – həcm, tutum.
*Həclə* – gərdək, zifaf otağı.
*Həlahil* – təsirli və öldürücü zəhər.
*Həm* – çətin, dərd, kədər.
*Həmd* – dua, mədh, sitayiş, şükr, təşəkkür.
*Həm'inan* – yanaşı yeriyən atlılardan biri.
*Hənnanə* – başqa kişiyə meyl göstərən ərli qadın.
*Hənuz* – hələ, indi.
*Hərasan* – hürkək, qorxaq.
*Hərbcu* – davakar, müharibə qızışdıran.
*Hərbə* – balaca nizə, qısa süngü.
*Həriq* – yanğın, yanar.
*Hərim* – məhrəm yeri.
*Hərraf* – dilli, dilavər
*Həst* – var, vardır.
*Həşəmət* – əzəmət, dəbdəbə.
*Həvas* – hisslər, duyğular, fikir, xəyal.
*Həyy* – diri, canlı.
*Həzar* – min.
*Həzimət* – məğlubiyyət, pozğunluq.
*Hicr* – ayrılıq, ayrılma.
*Hirz* – sığnaq, əmin yer, dua, tilsim.
*Hisn* – qala, hasar.
*Hut* – böyük balıq.
*Hübab* – sabın köpüyü, qabarcıq.
*Hüda* – həqiqət yolu, düzlük yolu.
*Hübb* – sevgi, məhəbbət.
*Hüllə* – bəzəkli paltar.
*Hümam* – çalışqan adam, hümmət sahibi.
*Hümay* – dövlət quşu, cənnət quşu.
*Hüsam* – qılınc.

**X**

*Xab* – yuxu, röya.
*Xabidə* – yuxuya dalmış, yatmış.
*Xahər* – bacı.
*Xak* – torpaq.
*Xanə* – ev.
*Xastkar* – adaxlı, nişanlı.
*Xatəm* – möhür, üzük, son, axır.
*Xemar* – duvaq, örtük, tor.
*Xəbbaz* – çörəkçi, çörək bişirən.
*Xəbt* – döymə, taqqıldatma, ehtiyatsız hərəkət.

*Xədəng* – ox, ağcaqovaq.
*Xəm* – əyilmiş, bükülmüş.
*Xəmidə* – beli bükülmüş, əyilmiş.
*Xəndan* – gülən, şad.
*Xənnas* – şeytan, iblis.
*Xər* – eşşək.
*Xərq* – dəlik, yarıq.
*Xəs* – çırpı, çör-çöp.
*Xəsm* – düşmən.
*Xəsü-xar* – çör-çöp.
*Xəzəf* – saxsı, saxsı qabı.
*Xiclət* – xəcalət.
*Xilal* – ara, aralıq, şiş, sancaq.
*Xirəd* – ağıl, fikir.
*Xirədmənd* – ağıllı, alim.
*Xissət* – alçaqlıq, ədnalıq.
*Xiş* – özü, qohum-əqrəba.
*Xocəstə* – xoşbəxt.
*Xosrov* – hökmdar, padşah.
*Xoşnud* – razı, məmnun.
*Xu* – xasiyyət, qılıq.
*Xub* – yaxşı, gözəl.
*Xud* – öz, özü.
*Xuk* – donuz.
*Xun* – qan.
*Xunxar* – zalım, qaniçən.
*Xur* – günəş.
*Xuşəçin* – sünbülyığan, başaqçı.
*Xüld* – həmişəlik, cənnət.
*Xüm* – küp.
*Xümul* – zəiflik, süstlük, cahillik, adsansız.
*Xüram* – sevinc, şadlıq, nazlı-nazlı yerimə.
*Xüraman* – naz-qəmzə ilə yeriyən, nazlı, qəmzəli.
*Xürrəm* – şən, şad.
*Xürsənd* – məmnun, xoşhal.
*Xürus* – xoruz.
*Xüruş* – bağırma, fəryad.
*Xüsumət* – düşmənçilik.
*Xüşk* – quru.

## İ

*İadə* – qaytarma, geri döndərmə.
*İbram* – təkid etmə, israr etmə.
*İbtal* – ləğv etmə, puç etmə.
*İdbar* – bəxtsizlik, talesizlik.
*İbtihac* – sevinmə, şadlıq, fərəh.
*İcab* – lüzum, ehtiyac, zərurət.
*İcabət* – cavab vermə, icra etmə, itaət etmə.
*İfaqə* – sağalma, yaxşılaşma, səhhəti düzəlmə.
*İffət* – namus, irz.
*İxlas* – təmiz məhəbbət, sədaqət, ürəyi təmizlik.
*İxtilac* – titrətmə, lərzə, qıc olma.
*İxtitam* – axır, son, nəticə.
*İksir* – keçmişdə yalançı kimyagərlərin istifadə etdikləri bir maddə, bitki cövhərinin spirti.
*İqab* – cəzalandırma, qarşılıq vermə, əzab.
*İqan* – yəqin etmə.
*İqlim* – ölkə, diyar, bir yerin ab-havası.
*İqtiza* – lüzum, lazım gəlmə, tələb etmə.
*İlqa* – atma, təsir etmə, nüfuz etmə.
*İltiqa* – birləşmə, qovuşma, görüş.
*İltica* – sığınma, pənah, himayə, istəmə.

*İmad* – dirək, sütun, dor ağacı, dayaq.
*İmruz* – bu gün.
*İnan* – cilov, yüyən.
*İnbisat* – sevinmə, fərəhlənmə.
*İnfial* – utanma, xəcalət çəkmə, acığı tutma, coşma.
*İnficar* – partlayış, partlanma.
*İntisar* – qələbə, zəfər.
*İradət* – istək, arzu, əzm, iradə.
*İrəm* – rəvayətə görə Yəməndə olan əfsanəvi bir bağ.
*İrsal* –göndərmə, yollama.
*İrtiaş* – qıc, çəng, tutulma, ürpəşmə.
*İrtibat* – bağlı olma, əlaqədar olma, münasibət.
*İste'cal* – tələsmə.
*İstitaət* – bacarıq, iqtidar.
*İşa* – axşam.
*İşaə* – şayiə, dedi-qodu, xəbər yayma.
*İştibah* – səhv, yanlış, şübhələnmə.
*İştihar* – məşhur olma, şöhrət qazanma.
*İştiyaq* – arzu etmə, çox istəmə.
*İtab* – məzəmmət etmə, üzünü danlama.
*İzar* – üz, yanaq.
*İzdivac* – evlənmə.
*İzz* – izzət, şan, əzəmət.

## J

*Jaj* – mənasız, hədyan.
*Jajxai* – boşboğazlıq, naqqallıq, lovğalıq.
*Jalə* – şeh, şəbnəm.
*Jəndə* – yırtıq, yamaqlı, solğun.
*Jərənd* – kobudluq, vəhşi bağırtısı.
*Jiyan* – qızğın, coşqun, qəddar, zalım.
*Julidə* – qarmaqarışıq, dağınıq.

## K

*Kah* – saman.
*Kax* – saray, qəsr.
*Kambin* – öz arzusuna çatan.
*Kamkar* – arzusuna yetişmiş, kamına çatan.
*Kamyab* – arzusuna çatan, xoşbəxt.
*Kan* – mədən.
*Kanun* – od qabı, manqal.
*Kar* – iş, fayda, təsir.
*Kasid* – müştərisi olmayan kasad.
*Kazib* – yalan, yalançı.
*Key* – "ki ey"in qısaldılmış forması.
*Keyl* – dən ölçmək üçün ölçü, dağar.
*Kəbir* – böyük, ulu, yaşlı.
*Kəbk* – kəklik.
*Kədxuda* – yüzbaşı, başqalarının işinə qarışan.
*Kədu* – qabaq, balqabaq.
*Kəmahi* – necə ki var, olduğu kimi.
*Kəman* – yay, ox, kaman.
*Kəmankeş* – ox atan, kamançaçı.
*Kəmin* – pusqu.
*Kəmingah* – pusqu yeri.
*Kəndu* – arı pətəyi, arı səbəti.
*Karub* – baş məlaikə.
*Kəc* – əyri.
*Kəşti* – gəmi.
*Kicekə* – qoşunun arxası.
*Kirdigar* – Allah, xaliq.
*Kirişmə* – naz, qəmzə, göz-qaş oynatma.

*Kisvət* – paltar, üst-baş, zahiri görkəm.
*Kiş* – din, məzhəb, adət, oxqabı, tirkeş, oxdan.
*Kişvər* – ölkə, məmləkət.
*Kişt* – əkin.
*Kizb* – yalan.
*Kövkəb* – ulduz.*Kövn* – olma, əmələ gəlmə, varlıq.
*Ku* – harada, məhəllə, keçiləcək yer.
*Kubə* – toxmaq, şapalaq, çax-çax.
*Kudək* – uşaq, tifil.
*Kuh* – dağ.
*Kus* – təbil, nağara.
*Kühulət* – insanın kamal dövrü.
*Külah* – papaq.
*Külbə* – sığınacaq yer, koma, daxma.
*Külfət* – yorucu iş, səmərəsiz zəhmət.
*Künd* – küt, qoçaq, cəsur.
*Künda* – ağac, dəyənək, buxov, çidar, qandal.
*Künqərə* – günbəzin yuxarısı, divarın dişcikləri.
*Künuz* – xəzinələr, dəfinələr.
*Küşti* – güləşmə.

## Q

*Qaid* – çovuş, rəhbər, başçı.
*Qal* – söz, danışıq, hay-küy, mübahisə.
*Qaliyə* – müşk və ya ənbərdən düzəlib saça və qaşa sürtülən ətirli qara yağ, ətirli.
*Qar* – mağara.
*Qate'* – kəsən, üzən, qıran, iti, kəskin.
*Qayət* – son, axır, nəticə, məqsəd, hədd-dərəcə.
*Qeybi* – qeybə çəkilən, göz önündə olmayan, gizli.
*Qəba* – üst paltar.
*Qəbra* – boz rəngli, torpaq rəngli.
*Qədər* – tale, fələk.
*Qədr* – sözün üstündə durmama, vəfasızlıq, xəyanət.
*Qəfa* – arxa, qoşun arxası, başın peysər hissəsi.
*Qəl'ə* – qala, zindan.
*Qəmmaz* – xəbərçi, sözgəzdirən.
*Qəndil* – çıraq, çilçıraq.
*Qə'r* – quyu, dəniz və s. dibi, ümumiyyətlə dib.
*Qərabət* – yaxınlıq, qohumluq.
*Qəriq* – batan, boğulan, batmış, boğulmuş.
*Qərm* – dağ qoyunu, nifrət, kin.
*Qərip* – yaxın, qohum, dost, yoldaş, həyat yoldaşı.
*Qərs* – əkmə, əkilmiş bitki.
*Qərz* – borc.
*Qət'a* – qətiyyən.
*Qəvi* – qüvvətli, güclü, zorlu, sağlam.
*Qəzənfər* – aslan, şir, şücaətli.
*Qibəl* – tərəf, səmt.
*Qiladə* – boyunluq, həmayil, boyunbağı.
*Qilaf* – qın, silah qabı.
*Qirban* – yayın qını, oxqabı, oxdan.
*Qird* – meymun.
*Qirrə* – lovğalanma.
*Qital* – qanlı vuruşma, müharibə.
*Qovğa* – səs-küy, savaş, döyüş, həyəcan.
*Qövl* – söz, danışıq, söz vermə, vəd etmə.

*Qövm* – tayfa, qohum, bir nəsildən olan.
*Qövs* – yay, kaman.
*Qran* – İranda pul vahidi.
*Qüdvə* – öndə gedən, örnək, nümunə, təqlid nümunəsi.
*Qülüvv* – həddən aşma, tüğyan, mübaliğə.
*Qünudə* – yatmış, yuxuya getmiş.
*Qürab* – qarğa.
*Qürs* – dairəvi şey, otağın havasını təmizləmək üçün odda yandırılan ud ağacı, ənbər və s.
*Qütr* – ölkə, tərəf.

## L

*Lacivərd* – tünd göy rəngli qiymətli bir daş.
*Ladə* – oxumaq, səfih.
*Laf* – söz, danışıq, boş danışıq.
*Lağər* – arıq, zəif.
*Lahiq* – artım, əlavə.
*Laillah* – Qurandakı "la-ilahə-illəllah" ifadəsinin qısa forması, Allahdan başqa allah yoxdur.
*Laməkan* – yersiz, yurdsuz.
*Lanə* – yuva.
*Laübali* – səhlənkar, özünə əziyyət vermək istəməyən.
*Layəzal* – həmişəlik, əbədi.
*Leyali* – gecələr.
*Leyk* – lakin.
*Leyl* – gecələr.
*Leylü nəhar* – gecə-gündüz.
*Ləali* – incilər, dürlər.
*Ləb* – dodaq.
*Lə'b* – oyuncaq, əyləncə.
*Ləbib* – müdrik, ağıllı.
*Ləc* – tərslik, inad etmə.
*Lədün* – yan.
*Lədüni* – ilahiyyat elmi, təsəvvüf, bir işin gizli cəhəti.
*Ləəb* – oyun.
*Ləgəd* – təpik.
*Ləğm* – lağım.
*Ləhəd* – qəbirdə ölü qoyulan çuxur.
*Ləim* – alçaq, zəlil, xəsis.
*Ləm'ə* – parıltı.
*Ləşkər* – ordu, qoşun.
*Ləşkərgah* – hərbi düşərgə.
*Ləşkərkeş* – qoşun çəkən, əsgər yeridən.
*Lət* – döymə, vurma, zərbə, toppuz, gürz.
*Ləvənd* – özbaşına, əyyaş, əxlaqsız, səfil, gözəl.
*Ləziz* – ləzzətli.
*Liqa* – üz, sima, görüşmə, qovuşma.
*Loqman* – əfsanəvi mahir həkim Loğmanın adıdır.
*Lö'lö* – inci, dürr.
*Lüccə* – suyun ən dərin yeri.

## M

*Madə* – dişi (heyvan).
*Mah* – ay.
*Mahliqa* – ayüzlü, ay görünüşlü, aybəniz.
*Mahpeykər* – aya bənzər, gözəl.
*Mahtab* – ayın aydınlığı, aydnlıq gecə.

*Mahvəş* – ay kimi, ayüzlü.
*Mahzər* – hazır olan, hazırda nə varsa.
*Malayotaq* – dözülməz, tab gətirməyən.
*Maliş* – sürtmə.
*Mar* – ilan.
*Marü mur* – ilan və qarışqa.
*Mehdi* – doğru yola gəlmiş.
*Mehnətsəra* – qəm-qüssə evi, qəm-qüssəli yer.
*Mehrab* – məscidlərdə qiblə istiqamətini təyin etmək üçün qayrılmış və önündə namaz qılınan oyuq.
*Menşar* – mişar.
*Me'rac* – çıxılacaq yer, nərdivan, göyə çıxma, dini rəvayətə görə, Məhəmməd peyğəmbərin göyə çıxması.
*Mey* – şərab, çaxır.
*Məab* – sığınacaq, qayıdılan yer.
*Məal* – məfhum, məna.
*Məali* – yüksək fikirlər, dərin mənalar.
*Məani* – mənalar, üslubiyyat.
*Məabir* – keçidlər, keçiləcək yer.
*Məarek* – vuruşma, ədavət, əlbəyaxa.
*Mə'bər* – keçid.
*Mə'cər* – qadınlar üçün üz örtüsü.
*Məcid* – görkəmli, əzəmətli.
*Məclisara* – məclisi şənləndirən, məclisi bəzəyən.
*Məcmə'* – yığıncaq, qovuşulan yer.
*Məcnun* – dəli, divanə.
*Mə'cun* – ləzzətli, dadlı, yeməli, şirniyyat.
*Mədar* – mərkəz, mehvər, təməl, istinad nöqtəsi.
*Məddah* – tərifləyən, mədh edən.
*Mədəd* – kömək, yardım.
*Mə'dələt* – ədalət, insaf.
*Mədxəl* – girəcək, giriş, başlanğıc.
*Məgəs* – milçək.
*Məğfərət* – bağışlanma, əfv edilmə.
*Məhar* – cilov, yüyən.
*Məhcub* – örtülü, utancaq.
*Məhd* – beşik.
*Məhəmməd* – mədh edilmiş, bəyənilmiş.
*Məhfəzə* – mücrü, qutu, qılaf.
*Məhmil* – təxti-rəvan, kəcavənin bir növü, xərək.
*Məhsub* – sayılmış, hesaba alınmış, himayə edilmiş.
*Məhsur* – hasarlanmış, mühasirəyə alınmış.
*Mə'hud* – şərti, vəd edilmiş, məşhur.
*Məhfil* – məclis, yığıncaq yeri.
*Məxbut* – döyülmüş, vurulmuş.
*Məxdum* – ağa, başçı, sahibkar.
*Məxləs* – qurtulacaq yer, sığınacaq.
*Məin* – daşan.
*Məiyyət* – yanında olma, yoldaşlıq, böyük bir şəxsi müşayiət edənlər.
*Məkkar* –aldadan, hiyləgər .
*Məkmən* – pusqu.
*Məkr* – hiylə, kələk.
*Məkrəmət* – hörmət, ləyaqət, nəcib, tərifəlayiq.
*Məqal* – söyləmə, söz, məsəl.
*Məqərr* – qərar tutulan yer, qərargah, durulacaq yer.
*Məlaz* –sığınacaq yer, daldalanacaq.
*Məlbəs* – geyim, paltar.
*Mə'ləm* – nişan, işarə, əlamət.

*Məlfuf* – bükülmüş, saralmış, sarğı.
*Məlhəmə* – qırğın, qanlı döyüş, müharibə meydanı.
*Məmlu* – dolu, dolmuş.
*Mən'* – qadağan etmə, qabağını saxlama.
*Mənar* – minarə, mayak.
*Mənat* – nümunə, islamiyyətdən qabaq ərəblərdə bir büt adı.
*Mənfəz* – dəlik, kanal, bir şeyin keçəcəyi yer.
*Məni'* – alınması çətin, möhkəm, mətin.
*Məniş* – xasiyyət, təbiət.
*Mənkub* – bədbəxt, zəlil.
*Mənkuhə* – nigahlı qadın, qanuni zövcə.
*Mənqul* – bir yerdən başqa bir yerə köçürülmüş, ağızdan-ağıza yayılmış xəbər, hekayə edilən.
*Mənşur* – yayılmış, aşkara çıxmış.
*Məraraət* – acılıq, dilxorluq.
*Mərbut* – bitişik, bağlanmış, tabe olan.
*Mərdüm* – insan, bəşər.
*Mərəz* – dərd, bəla, xəstəlik.
*Mə'rəz* – nümayiş etdirilən yer, səhnə.
*Mə'rəkə* – döyüş meydanı, müharibə.
*Mərəmmət* – təmir, düzəltmə.
*Mərg* – ölüm.
*Mərğ* – çayır, çəmən.
*Mərğzar* – çayırlıq, otlaq, çəmənlik.
*Mərqəd* – qəbir, məzar, yatacaq yer.
*Məriz* – xəstə, naxoş.
*Mərkəb* – minik heyvanı, gəmi.
*Mərr* – bir yerdən ötüb keçmə.
*Mərrix* – Mars, qırmızı göründüyünə görə Mərrix "Müharibə ilahəsi" adlanırmış.
*Mərsum* – yazılmış, adət olmuş.
*Mərz* – sərhəd, hüdud.
*Mərzban* – sərhəd qarovulu, gözətçi.
*Məsaf* – müharibə meydanı, döyüş.
*Məsalik* – məsləklər.
*Məsih* – sürtülmüş, yağlanmış, çəkilmiş.
*Məsihi* – yeni doğulan uşaqların alnına ətirli yağlı maddə sürtdüklərindən xristianlara ərəbcə "Məsihi" deyilir.
*Məslub* – asılmış, dara çəkilmiş, soyulmuş, sərvəti əlindən alınmış.
*Məsmu'* – eşidilmiş.
*Məsnəd* – mənsəb, vəzifə, taxt, dayaq.
*Məs'ud* – xoşbəxt.
*Məşam* – burun, qoxu orqanı.
*Məşiyət* – iradə.
*Məşkur* – şükr edilən təşəkkürə layiq.
*Məşrəb* – içilən yer, xasiyyət, həvəs.
*Məş'um* – bədbəxt, uğursuz.
*Məşhəd* – şəhid olmuş, bir müqəddəsin şəhid olduğu və basdırıldığı yer.
*Məşşatə* – bəzəkçi, gəlin və qızları bəzəndirən qadın.
*Məta'* – mal, sərmayə, əmtəə.
*Mətalib* – mətləblər.
*Mətbux* – bişirilmiş, xörək.
*Mətlubə* – istənilən, arzu olunan, alacaq.
*Mə'va* – məskən, yurd, sığınacaq.
*Məvəddət* – sevmə, sevgi, məhəbbət.
*Məzhər* – bir şeyin zahir olduğu yer, təzahür.
*Miğ* – duman, sis, bulud.
*Miğfər* – dəbilqə, dava vaxtı geyilən papaq.

*Miknət* – iqtidar, bacarıq.
*Minbə'd* – sonra, sonradan.
*Minu* – behişt, cənnət.
*Mir'at* – ayna, güzgü.
*Mirğəzəb* – cəllad.
*Mizab* – nov, su novu.
*Mizban* – qonaq qəbul edən ev sahibi, qonaqsevən.
*Mizraq* – cida, iti dəmirdən qayrılmış uzun saçlı nizə.
*Mövkib* – müşayiətçilər dəstəsi.
*Möhsin* – yaxşılıq edən, comərd.
*Möhtal* – hiyləgər, fırıldaqçı.
*Mu* – saç, tük.
*Mumiya* – bütün dərdləri sağalda bilən əfsanəvi dərman, qədimdə meyitləri çürüməkdən saxlayan mumiyalanmış meyit.
*Mur* – qarışqa.
*Mübin* – aşkar, aydın.
*Mücahid* – çalışan, cihad edən.
*Müctəba* – seçilmiş, bəyənilmiş.
*Müdamə* – klassik şeirdə: şərab, çaxır.
*Müdara* – zahiri dostluq, üzə gülmə, yola getmə.
*Müdbir* – bədbəxt, talesiz.
*Müənnəs* – zəifləmiş, qadın kimi zəif.
*Müğtənəm* – faydalı, xeyirli.
*Mühib* – qorxulu, təhlükəli, iri.
*Mühibb* – sevən, dost.
*Müxəddər* – duvaqla, örtüklə örtülmüş.
*Müxəddəre* – mötəbər, hörmətli qadın, xanım.
*Müxlis* – səmimi, xalis.
*Müin* – köməkçi, yardım edən.
*Müjə* – kirpik.
*Mükəvvin* – yaradan, meydana gətirən, xəlq edən.
*Müqarin* – bitişən, qovuşan.
*Mümli* – imla yazdıran.
*Münnəsir* – sınmış, qırılmış, qəmli.
*Mülhəm* – ilhama gəlmiş, ilhamlanmış.
*Münacat* – Allaha dua etmə, Allaha xitabən yazılmış klassik şeir forması.
*Mürdə* – ölü, ölmüş.
*Mürğ* – quş.
*Müsəvvir* – rəssam, təsvir edən.
*Müstəid* – istedadlı, bacarıqlı.
*Müstəmənd* – yazıq, zavallı.
*Müşə'bid* – oyunbaz, hoqqabaz.
*Müşfiq* – mərhəmətli, şəfqətli, mehriban.
*Müşrik* – bütpərəst, islam dinində olmayan.
*Müştaq* – arzulayan, həsrət çəkən, can atan.
*Mütəvəkkir* – xatırlayan, yada salan.
*Müzəvvər* – yalan, saxta.

**N**

*Nabəkar* – yaramaz, mərdimazar adam.
*Naçiz* – əhəmiyyətsiz, heç dərəcəsində olan.
*Nahid* – Zöhrə ulduzu, Venera.
*Naqil* – daşıyan, aparan, rəvayət edən, nəql edən.
*Nam* – ad, şöhrət.
*Namdar* – şöhrətli, adlı-sanlı.
*Namvər* – pəhləvan, qəhrəman.
*Nan* – çörək.
*Nar* – od, atəş, cəhənnəm.

*Nasut* – insaniyyət, insanlıq.
*Natəvan* – gücsüz, zəif, aciz.
*Navək* – ox.
*Navərd* – döyüş, vuruşma.
*Netaq* – toqqa, kəmər, qayış.
*Neyl* – kama çatma, məqsədə nail olma.
*Nəbbaş* – qəbiri sökən.
*Nəbərd* – dava, vuruş, çarpışma.
*Nəbirə* – nəvə.
*Nədamət* – peşmanlıq.
*Nədim* – həmsöhbət, əyləndirən adam.
*Nəfxə* – şişirmə, üfürmə, şişmə.
*Nəfir* – şeypur.
*Nəğz* – xoş, gözəl, lətif.
*Nəhəng* – timsah, köpək balığı.
*Nəhs* – uğursuz.
*Nəhzət* – oyanış, yola düşmə.
*Nəx* – ip.
*Nəxcir* – ov, şikar.
*Nəxcirgah* – ovlaq, ov yeri.
*Nəxl* – xurma ağacı.
*Nəxlbənd* – ağac budayan, süni gül qayıran.
*Nəjənd* – kədərli, dərdli, hiddətli.
*Nəkal* – cəza, cəzalandırma.
*Nəkbət* – fəlakət, bədbəxtlik, düşkünlük.
*Nəqarə* – nağara.
*Nəqb* – dəlik, lağım açma.
*Nəqi* – pak, təmiz.
*Nəqmət* – cəza vermə, intiqam.
*Nəqs* – əskiklik, eyib, nöqsan.
*Nəməd* – keçə.
*Nəng* – eyib, ar, bədnamlıq.
*Nəsnas* – meymun, meymun cinsi.
*Nəsr* – kömək.
*Nəss* – əsas məna.
*Nə'ş* – cənazə, ölü.
*Nəş'ət* – yetişmə, törəmə, inkişaf.
*Nə't* – tərif, peyğəmbərin mədhi.
*Nətayic* – nəticələr.
*Nəval* – bəxşiş, pay.
*Nəvid* – xoş xəbər, müjdə.
*Nəyyir* – nurlu, işıqlı, düşkünlük.
*Nəzd* – yaxın, yan.
*Nəzifə* – saf, təmiz, pak.
*Nihad* – yaradılmış, təbiət, zat.
*Nihal* – cavan ağac, fidan.
*Nihan* – gizli, məxfi.
*Nijad* – nəsil, nəsəb, soy.
*Nigar* – surət, rəsm, gözəl.
*Nigahban* – gözətçi, baxan, qaravulçu.
*Nigin* – möhürlü üzük, üzük qaşı.
*Nigun* – başaşağı, tərs, tərsinə çevrilmiş.
*Nik* – yaxşı, xoş.
*Nikah* – evlənmə, izdivac.
*Nikunam* – yaxşılıqda ad çıxarmış.
*Niqab* – üz örtüsü, yaşmaq.
*Nil* – mavi, havarəngi.
*Nilgun* – göy, mavi.
*Nim* – yarım, yarıya bölünmüş.
*Nini* – bəbək, göz bəbəyi.
*Niran* – odlar, cəhənnəm.
*Nirəng* – əfsun, sehr, hiylə.
*Nisar* – səpmə, saçma.
*Nisvan* – qadınlar.
*Nisyan* – unutma, yaddan çıxartma.
*Niş* – arı və əqrəb neştəri, neştər.
*Niyam* – qın, qılaf.
*Niyaz* – yalvarma, dua etmə, ehtiyac, hədiyyə.

*Niza'* – qalmaqal, qovğa.
*Nizar* – zəif, arıq.
*Nizədan* – nizə qoyulan qab.
*Nov* – yeni, təzə.
*Novzad* – yeni doğulmuş.
*Noql* – noğul, məzə.
*Nöh* – doqquz, qədim nücum elminə görə, göyün doqquz qatı.
*Növk* – cidanın şiş ucu.
*Nuşdaru* – dava, dərman, məlhəm.
*Nuşləb* – dodağı şirin.
*Nübüvvət* – peyğəmbərlik.
*Nühusət* – uğursuzluq, nəhslik.
*Nükhət* – iy, qoxu.
*Nüsrət* – yardım, kömək, qələbə, zəfər.
*Nüşur* – dini etiqada görə, qiyamətdə ölülərin dirilməsi.

## O

*Otaqə* – çalma, sarıq, əmmamə, tas-kulah, dəbilqə.
*Ovc* – səyyarələrin mərkəzdən ən uzaq nöqtəsi, zil səs, hər bir şeyin son nöqtəsi.
*Ovd* – təkrarlama, qayıtma.
*Ovdət* – qayıtma, geri dönmə.
*Ovn* – kömək, yardım.
*Ovrəng* – taxt.

## P

*Pabus* – yaltaq, ayaq öpmə.
*Padaş* – cəza, əvəz.
*Pay* – ayaq.
*Payan* – son, axır, nəhayət.
*Paygah* – baza, dərəcə, rütbə, ləyaqət.
*Paytabə* – başmaq növü.
*Peyğam* – sifariş, xəbər.
*Peykan* – oxun ucundakı dəmir.
*Peykər* – cüssə, əndam, surət.
*Peyvənd* – birləşmə, calaq, əlaqə, bağlılıq.
*Pədər* – ata.
*Pədid* – əyan, zahir, aşkar.
*Pəhlu* – böyür, yan.
*Pəjmürdə* – əzgin, solğun, solmuş.
*Pəlid* – murdar.
*Pənd* – nəsihət, öyüd.
*Pər* – qanad.
*Pərçəm* – bayraq, mizraqların qotazı, kəkil.
*Pərdənişin* – örtünən, gizlənən.
*Pərtov* – şüa, işıq, nur, parlaqlıq.
*Pəsər* – oğul, oğlan.
*Pəst* – aşağı, alçaq.
*Pəyambər* – peyğəmbər.
*Piç* – burulmuş, qıvrım, dolaşıq.
*Piçapiç* – çox dolaşıq, qarmaqarışıq.
*Piçü xəm* – əyri-üyrü yol.
*Piçü tab* – qıvrımlıq, pərişanlıq.
*Pir* – qoca.
*Piramun* – ətraf.
*Piş* – ön.
*Pişə* – peşə.
*Puşak* – paltar, geyim.
*Puşiş* – örtmə, örtü.
*Puyan* – sürətlə yeriyən, yüyürən.
*Pür* – dolu, dolğun.
*Pürfən* – elmli, bilikli, hiyləgər.
*Pürtab* – çox parlaq, işıqlı, son dərəcə isti.
*Püşt* – dal, geri, arxa.

## R

*Rabitə* – möhkəm, dözümlü, daimi.
*Raci* – xahiş edən, rica edən.
*Racil* – piyada yol gedən.
*Rah* – yol, məslək, üsul.
*Rahzən* – yolkəsən, quldur.
*Raqim* – yazan, çəkən.
*Ran* – bud.
*Rasix* – sağlam, möhkəm.
*Rast* – düz, doğru, təsadüf.
*Rastgü* – doğruçu, düz danışan.
*Ravi* – hekayə edən, rəvayət edən.
*Rayət* – ələm, bayraq.
*Rayigan* – müftə.
*Raz* – sirr, gizli şey.
*Rehlət* – köçmə, səfər etmə, ölüm.
*Reyb* – şəkk, şübhə.
*Rəcəz* – döyüşdə və güləşmədən qabaq pəhləvanların üz-üzə durub oxuduqları şeir, söz.
*Rə'd* – göy gurultusu.
*Rə'fət* – yazığı gəlmə, mehribanlıq.
*Rəha* – qurtulma, xilas olma.
*Rəhiq* – çox saxlanılmış şərab.
*Rəhl* – dəvənin palanı, kiçik miz.
*Rəhnüma* – yol göstərən, bələdçi.
*Rəhrov* – yolçu, yol gedən.
*Rəhzən* – quldur, yolkəsən, hərami.
*Rəxnə* – yırtıq, sökük, zərər.
*Rəxt* – ev avadanlığı, səfər ləvazimatı, paltar.
*Rəxtxab* – yataq, yorğan-döşək.
*Rəm* – hürkmə, qorxub qaçma.
*Rənc* – əziyyət, zəhmət.
*Rəncur* – incik, pərt, xəstə.
*Rəstəxiz* – dirilmə, oyanma, ölülərin diriləcəyi qiyamət günü.
*Rəşk* – qısqanma, qibtə etmə.
*Rətl* – mis və ya saxsıdan qayrılmış kasa.
*Rəvah* – axşamçağı vaxtı.
*Rəvaq* – talvar, çardaq.
*Rəviş* – gediş, yeriş, üsul, hərəkət.
*Rəzm* – dava, qovğa.
*Rəzmgah* – dava meydanı.
*Ribqə* – kəmənd, ilmə.
*Rifaq* – mülayimlik, yumşaqlıq.
*Rikab* – üzəngi.
*Risas* – qalay, qurğuşun, güllə.
*Rövşən* – işıqlı, aydın, aşkar.
*Rövzə* – şiə imamlarının ölümü haqqında mərsiyə, hekayə.
*Ru* – üz, çöhrə.
*Rubah* – tülkü, qorxaq.
*Rubənd* – rübənd, üz örtüyü.
*Ruz* – gündüz, gün.
*Rüb'* – dörddəbir.
*Rüb'i-məskun* – qədim coğrafiya elminə görə, yer kürəsinin insan yaşayan dörddəbir hissəsi.
*Rüchan* – üstünlük.
*Rücu'* – qayıtma, sözündən dönmə.

## S

*Sabiqə* – keçmiş hadisə, keçmiş şey.
*Sağər* – qədəh, şərab piyaləsi.
*Saqi* – su verən, məclisdə şərab paylayan.
*Sal* – il.
*Salar* – başçı, rəis.

*Salif* – qabaqda gedən, öndə gedən.
*Salik* – bir yol ilə gedən, bir yolu təqib edən.
*Salim* – sağ, sağlam.
*Sam* – zəhərli, səmum küləyi.
*Sayəban* – çadıra oxşar örtü.
*Sefid* – ağ.
*Seyd* – ovlama, ov.
*Seydgah* – ov yeri, ovlaq.
*Seyf* – qılınc, yay fəsli.
*Səbəq* – dərs, yarışda birincilik.
*Səbu* – kuzə, bardaq.
*Səbük* – yüngül, yüngülayaq, cəld.
*Səbz* – yaşıl.
*Səd* – yüz.
*Səda* – səs.
*Sədaq* – oxqabı.
*Sədəmə* – toqquşma, çarpışma, bəla.
*Səffak* – qantökən, qaniçən.
*Səg* – it.
*Səhab* – bulud, qaranlıq, zülmət.
*Səhl* – asan, yüngül.
*Səhm* – ox.
*Səhn* – həyət, səhnə, meydan.
*Səxt* – sərt, qatı, möhkəm.
*Səid* – xoşbəxt, uğurlu, mübarək.
*Səir* – od, cəhənnəm.
*Səqərlat* – qırmızı paltar, geyim.
*Səqf* – tavan, göy.
*Səlb* – asma, dara çəkmə.
*Səll* – siyirmə qılınc.
*Səmən* – yasəmən gülü.
*Səmənbər* – sinəsi yasəmən kimi ağ, yasəmən sinəli.
*Səmənbu* – yasəmən iyli.
*Səmənd* – at.
*Səmin* – bahalı, qiymətli.
*Səmum* – isti, quru külək.
*Səmm* – öymə, mədh.
*Səna* – zəhər.
*Sənc* – ölçü, müqayisə.
*Sənə* – il.
*Səng* – daş.
*Səngdil* – daşürəkli, zalim.
*Sənubər* – şam ağacı, küknar ağacı, gözəlin boyu.
*Sər* – baş.
*Səra* – qəsr, saray, ev.
*Sərapa* – başdan-başa, bütün.
*Sərbaz* – əsgər.
*Sərd* – soyuq.
*Sərdar* – başçı, canişin.
*Sərəfraz* – başı uca, seçilən.
*Sərgiran* – başıağır, sərxoş.
*Sərxeyl* – atlı dəstəsinin başçısı.
*Səri'* – tələsik, tez, sürətli.
*Sərir* – yataq, taxt.
*Sərsam* – qızdırma, sayıqlama.
*Sərsər* – güclü və soyuq külək.
*Sərv* – həmişəyaşıl, uca, yaraşıqlı ağac.
*Sərvər* – başçı.
*Sərvqədd* – sərv boylu, ucaboylu.
*Səyyad* – ovçu.
*Səzavar* – layiq, münasib.
*Siyaq* – üslub, tərz, həvəsləndirmə, sövq etmə.
*Siyəhpuş* – qara geyimli.
*Simak* – bir-birinə yaxın olan iki işıqlı ulduz.
*Sinan* – süngü, mizraq ucu.
*Sindan* – dəmirçi zindanı.
*Sipah* – ordu, qoşun.

*Sipəhbud* – qoşun rəisi, başçısı.
*Sipəhr* – asiman, göy, fəza.
*Sipər* – qalxan, döyüşdə güllədən qorunmaq üçün vasitə.
*Sir* – doymuş, tox.
*Sirişk* – göz yaşı.
*Sitarə* – ulduz.
*Sitəmrəsidə* – zülm çəkmiş, məzlum.
*Sitizə* – döyüş, vuruş, qabalıq.
*Sındu* – qayçı.
*Sovq* – qabağa qatıb qovma, aparma.
*Soub* – istiqamət.
*Sovlət* – qızğın, şiddət, iti.
*Su* – tərəf.
*Su'ban* – koramal, ilan, ilana bənzər döyüş aləti.
*Sud* – fayda.
*Suk* – qəm, kədər, ələm.
*Suq* – bazar, çarşı.
*Sur* – Şeypur, boru.
*Sübhanəkə* – sənə eşq olsun.
*Süheyl* – Cənubda görünən çox parlaq bir ulduz.
*Sühulət* – asanlıq, əlverişlik, yavaşlıq.
*Süxən* – söz, nitq.
*Süxənvər* – gözəl danışan, söz ustası.
*Sürx* – qırmızı.
*Sürud* – nəğmə.
*Sürür* – sevinc.
*Süruş* – Cəbrayılın adlarından biri.
*Süvər* – surətlər.

## Ş

*Şab* – igid, cavan.
*Şahbaz* – şahin, tərlan.
*Şaiq* – şövqlü, bir işə böyük həvəsi olan.
*Şaqq* – məşəqqətli, yorucu, zəhmətli.
*Şam* – axşam.
*Şera* – alma, satın alma, bazarlıq.
*Şeşdər* – altı qapı.
*Şeşpər* – altı dilli toppuz.
*Şəb* – gecə.
*Şə'bədə* – cəldlik, məharət, şəbədə, oyun.
*Şə'bədəbaz* – şəbədəbaz, əli cəld, məharətli, oyunbaz.
*Şəbxun* – gecə basqını.
*Şəbrov* – gecə yolçusu, gecə yol gedən.
*Şəğal* – çaqqal.
*Şəqaiq* – laləgülü, xoruzgülü.
*Şəqqülqəmər* – ayın parçalanması, möcüzə.
*Şikvə* – şikayət, şikayət etmə.
*Şəhir* – məşhur, şöhrət qazanmış.
*Şəmamə* – şamama.
*Şəms* – günəş.
*Şəmşir* – qılınc.
*Şəmşirbaz* – qılınc oynadan.
*Şər'* – şəriət
*Şərarə* – qığılcım, qor.
*Şərm* – həya, utanma.
*Şərzə* – vəhşi, qəddar, amansız.
*Şətrənc* – şahmat.
*Şiar* – şüar, bayraq, nişan, yaxşı keyfiyyət, adət.
*Şikar* – ov, qənimət.
*Şikaristan* – ovlaq yeri.
*Şikən* – sındıran, qıran, qırış, qıvrım.
*Şinavər* – üzgüçü.
*Şita* – qış.
*Şövhər* – ər.
*Şuriş* – qarışıqlıq, çaxnaşma.
*Şükufə* – gül-çiçək.

*Şükuh* – böyüklük, ululuq.
*Şükük* – şübhələr.
*Şümar* – say, hesab.
*Şürb* – içmə.
*Şürfə* – pərvaz, karniz, qapı və pəncərə üstündəki çıxıntı.

## T

*Tab* – qüvvət, güc, dözüm, zəhmət.
*Taət* – boyun əymə, itaət.
*Tahir* – saf, təmiz.
*Tair* – quş, uçan.
*Taq* – qübbə, günbəz, qapı, pəncərə.
*Tar* – qaranlıq, tel, sap.
*Tarə* – başın ortası, qaranlıq, sap, dəfə, kərə.
*Taskulah* – dəbilqə, müharibədə başa qoyulan dəmir papaq.
*Tavus* – tovuz quşu.
*Tazi* – ərəb, ərəblərə mənsub.
*Te'dad* – say, çoxlu.
*Teyhu* – çil quşu.
*Teyyib* – gözəl, xoşa gələn.
*Təam* – xörək.
*Təbadül* – dəyişmə, əvəz etmə.
*Təbaxət* – aşpazlıq.
*Təbbax* – aşpaz, yemək bişirən.
*Təbil* – nağara.
*Təcdid* – təzələtmə.
*Təcvif* – çala-çuxur, oyma.
*Təərrüz* – təcavüz etmə, sataşma, müqavimət.
*Təəşşüq* – sevmə, aşiq olma.
*Təgərg* – dolu, bol, axın.
*Təğyir* – dəyişmə, başqalaşma.
*Təfəhhüs* – təhqiq etmə, araşdırma.
*Təfəqqüd* – xəbər tutma, axtarıb soruşma.
*Təhdid* – hədələmə.
*Təhəmtən* – boy-buxunlu, cüssəli, qoşun başçısı, pəhləvan.
*Təhəyyi* – hazırlanma, hazırlaşma.
*Təhəyyür* – heyran olma, heyrətə düşmə.
*Təhi* – boş.
*Təhidəst* – əliboş, yoxsul.
*Təhrir* – yazma, rəsmi kağız.
*Təxsis* – həsr etmə, bir şeyi birisinə məxsus etmə.
*Təkapu* – oraya-buraya qaçma, çaxnaşma, hay-küy.
*Təkavər* – sürətlə gedən, yüyürən, at, dəvə.
*Təkrim* – əzizləmə, hörmət etmə.
*Tələttüf* – mehribanlıq, lütf etmə.
*Təliə* – öndə gedib yol və düşmən haqqında məlumat toplayan şəxs, kəşfiyyat dəstəsi.
*Təlfiq* – birləşdirmə.
*Təlx* – acı.
*Tə'm* – dad, tam.
*Təməzzüq* – parçalanma, yırtılma.
*Tən* – bədən, əndam.
*Tə'n* – söymə, danlama.
*Tənəkkür* – özünü tanınmaz şəklə salmaq, özünü bildirməmə.
*Təng* – darısqal, dar, usanmış, bezmiş.
*Tən'im* – nemət vermə, nemətləndirmə.
*Tənsiq* – sıralama, düzəltmə, nizama salma.
*Tənumənd* – cüssəli, boy-buxunlu.

*Tənzih* – təmizləndirmə, mənəvi paklıq.
*Tərdid* – tərəddüd, qətiyyətsizlik.
*Tərəb* – şadlıq, şənlik.
*Tərəhhüm* – acıma, rəhm etmə.
*Tərənbnak* – fərəhli, şad, sevinc.
*Tə'riz* – etiraz etmə.
*Tərs* – qorxu.
*Tərtil* – avaz ilə oxuma.
*Təsadüm* – toqquşma, vuruşma.
*Təsəmmüm* – zəhərlənmə.
*Təsərrüf* – ələ keçirmə, yiyələnmə.
*Təsliyət* – təsəlli vermə, ürək vermə.
*Təşxis* – tanıma, təyin etmə.
*Təşnə* – susuz.
*Təvangər* – dövlətli, varlı.
*Təvari* – gizlətmə, gizlədilmə.
*Təvəccöh* – rəğbət, meyl.
*Təvəhhüm* – qorxma, vahimələnmə.
*Təzəkkür* – yada salma, xatırlama.
*Təzərv* – qırqovul.
*Tiğ* – xəncər, qılınc.
*Tiğzən* – qılınc vuran.
*Tila* – qızıl.
*Tipə* – təpə, zirvə.
*Tir* – yaydan atılan ox.
*Tirad* – qısa süngü, mizraq.
*Tirbaran* – ox yağdırma.
*Tirdan* – oxqabı, oxdan.
*Tirəndaz* – oxatan.
*Tirkeş* – oxqabı.
*Tişə* – külüng.
*Tiz* – iti, kəskin, sürətli.
*Tovfir* – fərq, ayırd etmə.
*Tovsən* – yaxşı yeriyən at.
*Tuba* – əfsanəyə görə, cənnətdə hündür, gözəl bir ağac.
*Tuğra* – şah fərmanı, dövlət nişanı.
*Tusə* – qızılağac.
*Tühal* – dalaq xəstəliyi.
*Türab* – toz, torpaq, məzar.

**Ü**

*Übur* – keçmə.
*Üftadə* – düşmüş, yazıq, yıxılmış.
*Üqab* – qartal.
*Üqd* – düyün, çətin iş.
*Üqul* – ağıllar, idrak.
*Ümm* – ana.
*Ür* – puç, eyib, ar, lüt, çılpaq.
*Ürf* – adət, yaxşılıq, faydalıq.
*Üruc* – göyə qalxma, yuxarı çxma.
*Üsfur* – sərçə.
*Üsrət* – ehtiyac, çətinlik.
*Üstüxan* – sümük.
*Üstürlab* – bucaqölçən alət, rəsəd aləti.
*Ütarid* – Merkuri.
*Üştür* – dəvə.
*Üzlət* – guşənişinlik, adamdan qaçma.
*Üzübət* – şirinlik, təzəlik, gözəllik, məlahət.

**V**

*Vabəstə* – bağlı, asılı, kömək, arxa.
*Vafi* – sözünün üstündə duran, əhdə sadiq, vəfalı.
*Vafir* – bol, çox, həddən artıq, firavan.
*Vanuq* – Çində türk qubernatoru.
*Varun* – çöndərilmiş, devrilmiş.
*Vayə* – nəsib, pay, məqsəd, səbəb

*Vey* – o.

*Vey* – “və ey”in qısaldılmış forması.

*Veyl* – dini rəvayətə görə, cəhənnəmdə olan “Vadiyi-veyl” adlanan bir dərənin adı, dərd, bəla, qələbə, zəfər.

*Vəbal* – günah, təqsir, əzab, ağırlıq.

*Vəcahət* – gözəllik, gözəl üz, şərəf, şan.

*Vəcihə* – lətif, gözəl, layiq.

*Vədd* – sevmə, sevgi, dostluq, məhəbbət.

*Vəğa* – gurultulu, dava, döyüş.

*Vəhham* – çox xəyalata qapılan, vasvası adam, hər şeydən şübhələnən.

*Vəhm* – əsassız fikir, xəyal, şübhə, yersiz qorxu.

*Vəhy* – dini rəvayətə görə, bir fikir və ya hökmün Allah tərəfindən peyğəmbərə verilməsi.

*Vəqaye* – vaqiələr.

*Vəline'mət* – birisinin bəslənilib böyüdülməsinə hər cəhətdən kömək edən, onu saxlayan, boynunda haqqı olan.

*Vər* – “və əgər”in qısaldılmış forması.

*Vərc* – qiymət, şərəf.

*Vərtə* – uçurum, qorxunc yer, su burulğanı.

*Vəsi'* – vüsətli, geniş.

*Vəsiy* – ölən bir adamın vəsiyyətini yerinə yetirəsi adam, hami, qəyyum, canişin, varis.

*Vəsl* – birləşmə, qovuşma, vüsal, öz sevgisinə çatma.

*Vəsmə* – damğa, möhür, qaşa çəkilən qara rəng, boya.

*Vəsvəsə* – şübhə, tərəddüd, vəsvəsə.

*Vəz'i* – alçaq, bayağı.

*Vəznə* – tərəzi, tərəzi daşı, barıt qabı.

*Vəzzan* – tərəziçi, qapançı.

*Via* – qab, zərf, damar, kisə.

*Vidad* – sevgi, məhəbbət, hüsn-rəğbət.

*Vihuş* – vəhşilər, yırtıcılar.

*Visaq* – bağ, rabitə, əhdləşmə, bir-birinə söz vermə.

*Vizrü vəbal* – yük, ağırlıq, günah işlətmək.

*Vüzu* – dəstəmaz, namazdan əvvəl müsəlmanların icra etdikləri təharət.

**Y**

*Yaduluq* – ovsunçuluq, sehrbazlı.

*Yek* – bir, vahid.

*Yekbar* – bir dəfə, birdən.

*Yeksan* – bərabər, düz.

*Yəban* – çöl.

*Yəd* – əl, kömək, vasitə.

*Yəğma* – qarət.

*Yəl* – pəhləvan.

*Yovm* – gün, gündüz.

*Yovmülhesab* – qiyamət günü.

*Yuz* – pələngə oxşar heyvan, pars, ov iti.

*Yüsrü yəsar* – rahatlıq, dövlət, sərvət.

**Z**

*Zağ* – qarğa.

*Zaiqə* – dadbilmə duyğusu.

*Zare'* – torpaq sahibi.

*Zeh* – yay kirişi, qaytan.

*Zeyğəm* – aslan, şir.
*Zeyf* – qonaq.
*Zeyq* – darlıq, sıxıntı.
*Zeyl* – paltar ətəyi, ətək, artırma, əlavə.
*Zəban* – dil.
*Zəcr* – mane olma, məcbur etmə, vadar etmə, zülm, təzyiq.
*Zəğən* – qara qarğa, dolaşa.
*Zəxirə* – azuqə, döyüş sürsatı, ehtiyat.
*Zəxm* – yara, yaralanma.
*Zəllə* – səhv, nöqsan.
*Zən* – qadın, arvad.
*Zər'* – tarlaya toxum səpmə, əkin.
*Zərq* – sufilərin geydikləri göy paltar, riya, ikiüzlülük.
*Zəval* – zaval, tələf olma, göy cisimlərinin batması.
*Zib* – bəzək, zinət.
*Zifaf* – gəlinlə bəyin görüşdüyü ilk gecə.
*Zill* – kölgə, himayəçi, hami.
*Zin* – yəhər.
*Zinnət* – xəsislik, simiclik.
*Zireh* – oxdan və s. kəsərtidən qorunmaq üçün dəri, dəmir, sim və başqa şeydən toxunan dava paltarı.
*Zirehpuş* – zireh geymiş, zirehli.
*Zöv* – işıq, nur, aydınlıq.
*Zövrəq* – qayıq.
*Zücac* – büllur, şüşə.
*Züha* – səhər çağı, günəş işığı.

# MÜNDƏRİCAT

